*Bu kitab "**Nəsimi. Seçilmiş əsərləri**" (Bakı, Azərnəşr, 1973) nəşri əsasında təkrar nəşrə hazırlanmışdır*

Tərtib edəni: **Həmid Araslı**

Redaktor və lüğətin müəllifi: **Teymur Kərimli**

**İzahların müəllifi: M.A.Məhəmmədi**

**894.361'1 - dc 21**
**AZE**

**İmadəddin Nəsimi**. Seçilmiş əsərləri. İki cilddə. II cild. Bakı, "Lider nəşriyyat", 2004, 376 səh.

Kitaba böyük Azərbaycan şairi İmadəddin Nəsiminin (1369-1417) doğma dilimizdə qələmə aldığı, əsasən ictimai-fəlsəfi məzmunun üstünlük təşkil etdiyi müxtəlif janrlı poetik örnəklər daxil edilmişdir. Bu şeirlərdə humanist ideyalar, xeyirə, ədalətə və kamilliyə çağırış motivləri aparıcı yer tutur.

**ISBN 9952-417-17-7**

Azərbaycan Respublikasının Prezidenti
İLHAM ƏLİYEVİN
**"Azərbaycan dilində latın qrafikası ilə kütləvi nəşrlərin həyata keçirilməsi haqqında"**
12 yanvar 2004-cü il tarixli sərəncamı ilə nəşr olunur və ölkə kitabxanalarına hədiyyə edilir

Məndə sığar iki cahan, mən bu cahana sığmazam,
Gövhəri-laməkan mənəm, kövnü məkana sığmazam.

Ərşlə fərşü kafü nun məndə bulundu cümlə çün,
Kəs sözünüvü əbsəm ol, şərhi-bəyana sığmazam.

Kövni-məkandır ayətim, zatidürür bidayətim,
Sən bu nişanla bil məni, bil ki, nişana sığmazam.

Kimsə gümanü zənn ilə olmadı həqq ilə biliş,
Həqqi bilən bilir ki, mən zənnü gümana sığmazam.

Surətə baxü mə’nini surət içində tanı kim,
Cism ilə can mənəm, vəli cism ilə cana sığmazam.

Həm sədəfəm, həm inciyəm, həşrü sirat əsinciyəm,
Bunca qumaşü rəxt ilə mən bu dükana sığmazam.

Gənci-nihan mənəm mən uş, eyni-əyan mənəm, mən uş,
Gövhəri-kan mənəm, mən uş, bəhrəvü kana sığmazam.

Gərçi mühiti-ə’zəməm, adəm adımdır, adəməm,
Tur ilə künfəkan mənəm, mən bu məkana sığmazam.

Can ilə həm cahan mənəm, dəhrilə həm zaman mənəm,
Gör bu lətifəyi ki, mən dəhrü zamanə sığmazam.

Zərrə mənəm, günəş mənəm, çar ilə pəncü şeş mənəm,
Surəti gör bəyan ilə, çünki bəyana sığmazam.

Zat iləyəm, sifat ilə, gülşəkərəm nabat ilə,
Qədr iləyəm bərat ilə, bəstə dəhana sığmazam.

Nara yanan şəcər mənəm, çərxə çıxan həcər mənəm,
Gör bu odun zəbanəsin, mən bu zəbana sığmazam.

Şəhd ilə həm şəkər mənəm, şəms mənəm, qəmər mənəm,
Ruhi-rəvan bağışlaram, ruhi-rəvana sığmazam.

Tir mənəm, kaman mənəm, pir mənəm, cavan mənəm,
Dövləti-cavidan mənəm, ayinədana sığmazam.

Gərçi bu gün Nəsimiyəm, haşimiyəm, qureyşiyəm,
Məndən uludur ayətim, ayətə, şana sığmazam.

Dinləgil bu sözü ki, candır söz,
Aliyü asimanməkandır söz.

Şeş cəhətdən münəzzəh anlavü bax,
Şöylə kim, xaliqi-cahandır söz.

Nazilü münzil anla kim, birdir,
Kəndi kənduyə tərcümandır söz.

Tulü ərz ilə ümqü bulunmaz
Yə'ni bihəddü binişandır söz.

Bu hədisə nəzər qıl, ey aqil,
Anlayasan ki, bigümandır söz.

Ərşi-rəhman dedi nəbi könülə,
Çünki gördü, könüldə kandır söz.

Dedi ya kafüha, əyzə-bikə,
Çün Əli bildi, müstəandır söz.

Qeyri-məxluqdur, nə demək olur,
Anla kim, imdi rayigandır söz.

Əqli-küll ərşü kürsü, lövhü qələm,
Çar ünsür, nöh asimandır söz.

Zahirü batin, əvvəlü axir,
Aşikaravü həm nihandır söz.

Ey üqulu nəsəb edən isbat,
Qamuya söz de kim, hamandır söz.

Kafü nundan vücuda gəldi cahan,
Əgər anlar isən, əyandır söz.

İsiyi-pak, Adəmü Əhməd,
Mehdiyi-sahibəz-zəmandır söz.

Bu bəyanı dilərsən anlayasan
Kim, necəsi filan-filandır söz.

"Cavidannamə"yi gətirgil ələ,
Ta biləsən ki, nəsnə candır söz.

Sözə bu izzü cah yetməzmi,
K'aydalar Fəzli-qeybdandır söz.

Aqil isən sözünü müxtəsər et,
Ey Nəsimi, çü bigirandır söz.

Daldım yenə bir bəhrə ki, ümman dəxi bilməz,
Küfrün sözünü dünyada iman dəxi bilməz.

Buldum vücudun sübhi-əzəl vəhy ilə münzil,
Vəchin sözünü dünyada bürhan dəxi bilməz.

İblis əzəli lə’nət olub lə’nətə qaldı,
Lə’nət sözünü dünyada şeytan dəxi bilməz.

Musa əzəli qıldı vücudimi əsa çün,
Musa sözünü dünyada Imran dəxi bilməz.

Muşkil oluban çün bu sözü bilmədi kimsə,
Müşkil sözünü dünyada asan dəxi bilməz.

İnsan oluban camə geyib dünyaya gəldim,
İnsan sözünü dünyada ehsan dəxi bilməz.

Lö’löi-əzəl şöylə könül dopdolu oldu,
Lö’lə sözünü dünyada mərcan dəxi bilməz.

Düxan əzəli kim, sözünü vermədi yarə,
Düxan sözünü dünyada düxan dəxi bilməz.

Gənci-əzəli şöylə könül daşdı töküldü
Gəncüm sözünü dünyada viran dəxi bilməz.

Ey badi-səba, var, xəbəri yarə ilət kim,
Hüdhüd dilidir bunu Süleyman dəxi bilməz.

Zülfünə başın top edibən qoydu Nəsimi,
Zülfün sözünü dünyada çövkan dəxi bilməz.

Ey əzəli can ilə cananımız!
Eşqi-rüxündür əbədi şanımız.

Kə'bə üzündə bizə, ey Fəzli-həq,
Zülfü rüxün qibləvü imanımız.

Vəchinə yazdı otuz iki hüruf,
Hikmət ilə münşiyi-ərkanımız.

Surəti çün əhsəni-təqvim imiş,
Səndə zühur eylədi sübhanımız.

"Səvvərəkəllahü əla şəklihi"
Üştə nəbinin sözü bürhanımız.

Mö'minə həq dünyanı zindan dedi,
Möminə çox qalmaya zindanımız.

Uymadı arif sözünə vaizin,
Divə müti' olmadı insanımız.

Əvvəlü axırda üzündür, üzün,
Sün'i-xuda, qüdrəti-yəzdanımız.

Kim ki, sücud eyləmədi hüsnünə,
Divi-lə'in olduvü şeytanımız.

Can necə tərk eyləsin, ey can, səni,
Çünki canın canısan, ey canımız!

Pərdə üzündən götür, ey surətin
Fəzli-ilahi ilə rəhmanımız.

Eynimə sənsiz tikan oldu cahan,
Qandasan, ey tazə gülüstanımız?

Ta biləsən kim, necədir, ey fəqih,
Adəmi-xaki ilə ehsanımız.

Hüdhüdü Bilqeysə rəsul eylədi,
Naməni göndərdi Süleymanımız.

Cövr ilə yandırdı Nəsimiyi dust,
Həm bu idi dust ilə peymanımız.

Var bu cahandan özgə bizim bir cahanımız,
Surət bu aləm oldu bizə, ol məkanımız.

Zatına həyyü baqi demişlər bu cövhərin,
Şol kim, bizim-cahanımız olmuş bu canımız.

Ey də’vət eyləyən bizi firdövsə, eylə bil,
Cənnətdən özgə vardurur ə’la məkanımız.

Cövhər ki, dutdu aləmi rövşən günəş kimi,
Andandır aşikara bu gənci-nihanımız.

Cövhərləri zühura gətirdi çü nitqi-həq,
Gör kim, nə feyzə gəldi yenə bəhrü kanımız.

Ol kim, bizim həqiqətimizdir xəyalımız,
Yoxdur nişanı qılca, nə bilsin nişanımız.

Sən bu Nəsiminin dilini anla, bil sözün
Kim, var bu dildən özgə bizim bir lisanımız.

Dünü gün müntəzirəm mən ki, bu pərgar nədir?
Günbədi-çərxi-fələk, gərdişi-dəvvar nədir?

Bu doquz çərxi-müəlləq nədən oldu tərtib,
Fələk altında dönən kövkəbi-səyyar nədir?

Musiyü Tür nədir, Şibliyü Mənsur nədir,
Əjdəha olan ağac, riştə ilən dar nədir?

Fələkin əsli nədəndir, mələkin nəsli nədən,
Adəmin surətinə bunca tələbkar nədir?

Kə’bəvü deyr nədir, qeyr nədir, seyr nədir?
Məscidü bütkədəvü xirqəvü zünnar nədir?

Elmü-Qur’anü hədisü xəbərü və’z ilə dərs,
Cümlə bir mə’ni imiş, bunca bu təkrar nədir?

Dinü imanü namazü həcü ərkanü zəkat,
Zöhdü təqvavü şəriət, qamu göftar nədir?

Kim ki, pərvanəsifət eşqə yaxılmaz nə bilir,
Ol nə bilsin özünü, bilmədi kim, nar nədir?

Bir məgəs təb’inə bax, bal nədən, zəhr nədən,
Yenə bir yerdə əcəb, mal nədir, mar nədir?

Odü su, torpağü yel adı nədəndir adəm?
Ana səcdə nə üçün, iblisə inkar nədir?

Günəşin qürsü nədən yer üzünə şö’lə verir,
Ya bu bir məş’lədə nur nədir, nar nədir?

Kim ki, bilməz özünü, bilməyə pirlər sözünü,
Kəndisin anlamayan bilmədi hər kar nədir.

Gəlgil, ey dust, qamu müddəilər korluğuna,
Sana asan qılayım, bunca bu düşvar nədir?

Kim ki, pərvanəsifət eşqə yaxılmaz nə bilir,
Surəti-şəm'idə bu pərtövi-ənvar nədir?

Tərk evində sən əgər həmçü Nəsimi olasan,
Bir gün ola deyəsən, cübbəvü dəstar nədir?

Dərdü qəm ilə yandı könül, yar bulunmaz,
Çox darü diyar istədi, dəyyar bulunmaz.

Yaram, deyici çoxdurur, amma bəhəqiqət,
Fürsət gəlicək, yari-vəfadar bulunmaz.

Adət budurur kim, dili dildara verərlər,
Dil getdi əlimizdənü dildar bulunmaz.

Neçə kişilər də'viyi-islam edər, amma
Tək arada bir xaç ilə zünnar bulunmaz.

Hər bihünər, insafı yox uş mənsəbi tutdu,
Sahibhünərə mənsəbi-idrar bulunmaz.

Hər kişidə bir cübbəvü dəstar olur, amma
Min başda biri layiqi-dəstar bulunmaz.

Çün çərxi-fələk cahilü nadan sevər oldu,
Pəs lacərəm uş fəzlə xəridar bulunmaz.

Tərrar gər aparsa qamu rəxti rəvadır,
Çün qafilədə bir kişi bidar bulunmaz.

Xəlqin əməli azdı, könül yıxıcı öküş,
Bir xəstə könül yapıcı me'mar bulunmaz.

Var, dərdə təhəmmül qılü səbr eylə cəfaya,
Çün dil diləyi əndəkü bisyar bulunmaz.

Zərq işi, riya üştə kasad eylədi fəzli,
Elm əhlinə bir rövnəqi-bazar bulunmaz.

Var özüni faş etmə, Nəsimi, kişiyə kim,
Aləmdə bu gün məhrəmi-əsrar bulunmaz.

Ey əlləzi-yüvəsvis, taətlərin həbadır,
Əgri yolun zəlalət, çürük sözün xətadır.

Zənnü güman içində qalmışsan, ey yəqinsiz,
Məşkuk ilən kim aydır qılmaq əməl rəvadır?

Cüm'ə namazı niçün şərt oldu Misrü came'
Şərtin bil əvvəl, andan məşrutun et, səladır.

Ey bilməyən bu Misri, itirmə cüm'əyi kim,
Cüm'ə bu Misr içində məqbuli-kibriyadır.

Yusif kimi əzizəm Misrin içində daim,
Həqqi bilən həmişə aləmdə müqtədadır.

Adinə surətindən endi Rəsula cüm'ə,
Tanıq bu həq hədisə uş qövli-Mustafadır.

Adinə neçin oldu, adinənin adın bil,
Bu sirri ol bilir kim, həq ilə aşinadır.

Adinədir qiyamət, ol gündədir nədamət,
Ol gündə həşr olisər, ol gündə macəradır.

Ol gündədir hesabın, həm rahətü əzabın,
Ol gündə həq qatında icmai-ənbiyadır.

Adinəyi bilənlər məğfurü nacidirlər,
Məğfur olan cahanda hadiyü pişvadır.

Ey cüm'ədən xəbərsiz, cüm'ə gününü bil kim,
Ol gündə və'deyi-həqq uçmaq ilə liqadır.

Cüm'ə günün süfatı şərhü bəyana sığmaz,
Mə'nidə cüm'ə gərçi cami-cahannümadır.

Çün cüm'ə yövmi-dindir ərzü səmada həqdən,
Dinin itirmiş ol ki, adinədən cüdadır.

Ol müşriki-nəcisdir cüm'əyi qılmayan kim,
Qövlivü fe'li anın təqlid ilən riyadır.

Çün höccətül-məsakin cüm'ə günüdür, ey can,
Miskinə sor ki, miskin ayinəsi səfadır.

Came'də cüm'əyi uş hər gün qılan mənəm bil,
Qur'an imamım oldu, daim yönüm həqadır.

Adinə həcci-əkbər hüccaca həqdən endi,
Ol bibəsər nə bilsin bu sirri kim, ə'madır.

Peyğəmbərin sözüdür, həm tanrının kəlamı,
Şol əhdü şol əmanət gör kim, nə iddiadır.

İmanı yoxdur anın kim, oldu biəmanət,
Dinin itirmiş ol kim, əhdində bivəfadır.

Şol əhdü şol əmanət gər səndə varsa xoşdur,
Yoxsa, yalan imansız, həm dinsiz ol dəğadır.

Ey küfrü şirk içində sanan özünü mö'min,
İslamü şər'ü iman məxsusi-övliyadır.

Dəccal tə'nəsindən xövf eyləməz Nəsimi,
Niçün ki, ruhi-qüdsə övnü müin xudadır.

Əya, mö'min, gər istərsən səadət,
Özünə peşə qıl daim se adət.

Əvvəl təb'i-lətifü xülqi-niku,
İkinci həm kərəm, cudü səxavət.

Üçüncü, olma hərgiz bivüzu sən,
Yeri, həq buyruğun tut, qıl ibadət.

Xoşa ol mö'mini-pakü müvəhhid
Ki, ola anda həm bu üç xəsalət.

Həyadır birisi, biri ədəbdür,
Biri dəxi nədir: xövfi-qiyamət.

Dəxi üç nəsnə könlü rövşən eylər,
Həqiqət bil sən əz ruyi-iradət.

Biri müshəf, biri axar su derlər,
Bu iki nəsnəyə baxsan kifayət.

Üçüncü, sün'i-həqdi hüsni-ziba,
Təsərrüfsüz təfərrüc qıl fərağət.

Dəxi könlü edər üç nəsnə qəmgin,
Qulaq ur kim, edəm sana hekayət.

Yaman qonşu, yaman yoldaşi-bədxu,
Yaman övrət siyasətddir, siyasət.

Yəqin cənnət üzün görməz bir adəm
Ki, var canında anın üç əlamət.

Biri kəzzablıq, birisi qeybət,
Biri olmaq bəxil, əhli-ədavət.

Gəlir üç nəsnədən azari-mərdüm,
Var, etmə özünə anı sənaət.

Biri böhtan, biri kəcgəngəl etmək,
Biri küstaq olub, qılmaq zərafət.

Nəsimi, sən yəqin əhli-nəzərsən,
Bu üç nəsnəyi qıl kəndunə adət:

Biri lütfü kərəm, həm xülqi-niku,
Biri – heç kimsəyə baxma həqarət.

Bu sözlər xoş nəsihətdür bilənə,
Seadətdir, vəli eyni-səadət.

Bir şaha sən qulluq eylə, söhbətindən can bitər,
Bir sədəfdən çaşnı dadgil, dürr ilə mərcan bitər.

Söhbət etmə, söhbət etmə dəgmə hər nadan ilə,
Nadanın tərbiyətindən həm yenə nadan bitər.

Qafil olma əhli-dillər söhbətindən bir zaman,
Əhli-dillər söhbətindən şö'leyi-iman bitər.

Məskənətdən sən qaçarsan, gizli gəncdir bilmədin,
Lacərəm bu məskənətdən nisbəti-sultan bitər.

Ol əli kəsgil, buraxgil, xeyri yoxdur, şərri çox,
Dutgil imdi ol əli kim, xeyr ilə ehsan bitər.

Zalım oldun, zülm əkərsən yenə kəndi tarlana,
Zalımın zülmü şərindən tarlada üsyan bitər.

Bağçaya varma, varırsan sorma dapusu nədir,
Barı bir bağçaya girgil, gül ilə reyhan bitər.

Şol ağaca bənzəmə kim, kəsib oda yaxalar,
Balta zəxmindən əmindir anda kim, rümman bitər.

Ey Nəsimi, dürlü-dürlü dərdlər ol canındadır,
Bir eşik yastana gör kim, dərdinə dərman bitər.

Sirri-ənəlhəq söylərəm aləmdə, pünhan gəlmişəm,
Həm həq derəm, həq məndədir, həm xətmi-insan gəlmişəm.

Həm Lövhü Tovratü Zəbur, Incilü Qur'anü Sühəf,
Həm mən kəlami-natiqəm, həm cəm'i-Qur'an gəlmişəm.

Həm ayəti-rəhman mənəm, həm rəhməti-rəhman mənəm,
Həm vəhyi-mütləq söylərəm, həm nuri-yəzdən gəlmişəm.

Musa kimi didarına müştaqsan, gəl üştə gör,
Anəstünaram, həm şəcər, Musi-bin-Imran gəlmişəm.

Sevdan ilə məst olmuşam, həm içmişəm qəmdən müdam,
Məsti-ələstin camıyam niçün ki, tüğyan gəlmişəm.

Həm mən qələndərsurətəm, fərdəm, mücərrəd təcridəm,
Oldum fəqirü həm gəda, həm mülkə sultan gəlmişəm.

La-reybə-illa vəchəhu gəldi anın vəchində uş,
Aləmdə hüsnün vəchinə mən vəchi-bürhan gəlmişəm.

Hüsnü camalın nəqşini gördü əzəldə gözlərim,
Bu hüsnə heyran olmuşam, mən nəqşə heyran gəlmişəm.

Mişkin saçın zülmatına yol bulmaq istər, Xızrı gör,
Lə'lin şərabın içmişəm, mən abi-heyvan gəlmişəm.

Gəlmiş cahana şərh edər şimdi Nəsimi həq sözün,
Ani kim idrak eyləsin, mən sirri-pünhan gəlmişəm?!

Mən xərabati-əzəldən məstü heyran gəlmişəm,
Eşq ilə yekrəng olub şadanü xəndan gəlmişəm.

Saqiyi-inni-ənəllah cür'əsindən ta əbəd
Məstü məstan, xəlvətindən məstü məstan gəlmişəm.

Həqdürür qövli-ənəlhəq də'visi həqqa ki, mən
Şahi-sultan məclisindən şahi-sultan gəlmişəm.

Yaxmışam, yandırmışam, kül qılmışam zərratımı,
Lacərəm külli kül olub məhrəmi-can gəlmişəm.

Mövc ilə, eşq ilə canım dürlü-dürlü dür saçar,
Bu giransız eşq ilə dəryayi-ümman gəlmişəm.

Tahiri qüdsi deyən ruhül-əmindir məntiqim,
On səkiz min aləmin sirrinə pünhan gəlmişəm.

Məqsədi-kövnü məkan sənsən, Nəsimi, çün bu gün
Nə əcəb gər derisəm mən sirri-sübhan gəlmişəm.

Mən mülki-cahan, cahan mənəm mən!
Mən həqqə məkan, məkan mənəm mən!

Mən ərş ilə fərşü kafü nunam,
Mən şərhü bəyan, bəyan mənəm mən!

Mən kövnü məkanü kün-fəkanam,
Bilgil ki, nişan, nişan mənəm mən!

Mən surəti-mə'nidə həqəm həq,
Mən həqqi-əyan, əyan mənəm mən!

Bir gövhərəmü qədim əzəldən,
Ey gövhəri-kan, kan mənəm mən!

Mən atəşi-nuri-eşqi-həqqəm,
Musaya zəban, zəban mənəm mən!

Mən cümlə cahanü kainatam,
Mən dəhrü zaman, zaman mənəm mən!

Mən ayəti-müshəfü kitabam,
Ey nöqtədəhan, dəhan mənəm mən!

Mən qövs ilə həm kamanü tirəm,
Ey tirü kaman, kaman mənəm mən!

Cəmşidi-zamani-aləm oldum,
Cəmşidi-zaman, zaman mənəm mən!

Mən nəqşü xəyalü xəttü xalam,
Mən hərfü lisan, lisan mənəm mən!

Mən gənci-nihani, küntə kənzəm,
Mən gənci-nihan, nihan mənəm mən!

Mən zatü sifati-kün-fəkanam,
Mən ruh ilə can, can mənəm mən!

Mən kafirə mövt, müsibət oldum,
Mö'minə iman, iman mənəm mən!

Mən cənnətü abi-kövsər oldum,
Ey səhni-cinan, cinan mənəm mən!

Mən bəhri-mühitü həm giranam,
Ey bəhri-giran, giran mənəm mən!

Mən sirrəmü tövhidəm, hədisəm,
Həm qeybü güman, güman mənəm mən!

İnsanü bəşərsən, ey Nəsimi,
Həq der ki, haman, haman mənəm mən!

Bavü sin mim üçün bəşarətdir,
Əlifü lamü ha işarətdir.

Ərrəhim oxu, anla Ərrəhman,
Bişü kəm yoxü gənci-rəhmətdir.

Bil ki, mə’nası: münzil oldu kitab,
Bu, banın nöqtəsində surətdir.

Əvvəl ümmül-kitab fatihədir
Ki, müəyyən bilindi xilqətdir.

Xilqətin qeylü-qala vaqif ol,
Qeylü qalın çü halü alətdir.

Qanda var isə mə’niyü surət,
Mə’niyi bildilər ki, kisvətdir.

Surətin daxi canı mə’nidir,
Dadana sor anı, nə şərbətdir.

Nə mürəkkəb düzər gör ol ustad,
Hər kim içər, doluca hikmətdir.

Əsli xud zat imış hər əşyanın,
İkilik nəstər anda, vəhdətdir.

Ol iki uş bu yerdə oldu diri,
Beynə zalik başında qəflətdir.

Yedi ayətlə yeddi xətt tamam
Yedi ə’za ki, yeddi ümmətdir.

Yedi qat yer, yedi dəxi gökdür,
Anla bu yeddiyi ki, külfətdir.

Nə durar yeddi bildiyin vadi,
Vəz'i nədir, bu ya nə hey'ətdir?

Kişi şəkli müsəvvər etməklik,
İki aləm içində şöhrətdir.

Der müvəhhidlərü mühəqqiqlər,
Bilməgü işləmək risalətdir.

Alim olandurur qəvi insan,
Divü ifritü cin cəhalətdir.

Divi-heyvani-natiqin həqinə,
Qövli-Qur'an bəlhüm ayətdir.

İstilah, istima insana
Zəfərü fəth, daxi nüsrətdir.

Tamunun odunu şüasından
Əz-təfi şəm' kimi taqətdir.

Şərbətin təşnəsi üçüncüsü,
Yə'ni sevda ki, ol fəsahətdir.

Adəmi yandıran hərarətdən
Dəxi dördüncüsü hərarətdir.

Çün Süleyman xatəmi buldu,
Bəs ana cinnü ins rəğbətdir.

Nərdiban buldu Iseyi-Məryəm,
Günbədi-zərnigar qamətdir.

Gəldi sonra Məhəmmədin nuru,
Görə axır şu kimsə k' ümmətdir.

Mustafanın ruhuna incigəz
Ver salavat ki, şərtü adətdir.

Kərəmüllahi-vəchəhu ki, Əli
Nə ki, dedi cahanda xidmətdir.

Həm təkəbbürlük adəm oğlunda
Ki, əzim ol bəlavü afətdir.

Bir günəşdir Nəsimi kim, anın
Neçələr zərrəsinə həsrətdir.

Aşiq qatında küfr ilə islam birdir,
Hər qanda məskən eyləsə aşiq əmirdir.

Mə'şuqənin naziri bulunmaz cahanda çün,
Tanı anı bu vəchilə kim, binəzirdir.

Bütxanə ilə Kə'bəyi surətdə fərq edən,
Mə'nidə baliğ olmamış ol, gərçi pirdir.

Ey qanıma təfail üçün qür'əyi salan,
Döndərmə falını ki, mübarək zəmirdir.

Eşqin yolunda üzünü xak eyləyən fəqir,
Adı cahanda xosrövi-sahibsərirdir.

Dünyada mülkə, mala sən aldanma, ey məlik
Kim, dünyanın mətahi bəğayət həqirdir.

Tozlu cahana silkin ətək kim, nəiminə
Hər bibəsər kim, oldu müqəyyəd əsirdir.

Ey Kə'bənin camalına aşiq, niyaz ilə
Meydani-eşqə gəl ki, müğilan həririrdir

Müştaqa dilpəzirdir anın cəfaları,
Mə'şuqədən həmişə cəfa dilpəzirdir.

Hər kimsənin ki, üzünə açıldı gözləri,
Sahibbəsirət olduvü adı bəsirdir.

Afaqa düşdü ğülğülə hüsnündən, ey qəmər,
Afaqa baxü gör ki, nə ahü nəfirdir.

Tərh eylədi Nəsimi yolunda vücudunu,
Gör anı kim, nə möhtəşəm olmuş fəqirdir.

Bu nə bərgüzidə candır ki, gəzər bu can içində?
Bu nə qiyməti gühərdir ki, yatar bu kan içində?

Səni kimdir adəm oğlu deyən, Allah, Allah, Allah,
Bu sifətdə kim, görübdür bəşəri-cahan içində?

Məgər uy verür ləbindən, irəməz yəqin bu sirrə,
Nə xəyal imiş bu, yarəb, xəbəri güman içində?

Qara qaşının, gözünün adı Qövsü Müştəridir,
Bu sitarənin oxun gör ərəbi kaman içində.

Üzünü niqab içində, yaşır, ey qəmər surətlü
Ki, rüxün qiyamət eylər bu axırzaman içində.

Səni məndən iraq, ey can, necə ayıra zəmanə,
Gözüm ilə görmüşəm çün səni hər məkan içində.

Yenə mey fəğanə gəldi, cigərim tutuşdu yandı,
Nəyə uğradı, nə gördü bu tühimiyan içində?

Dilərəm zaman-zaman kim, səni faş edəm cahana,
Necə bir yana bu şəm'in cigəri düxan içində?

Bu dərin məaniyi gör ki, bəyan qılur Nəsimi,
Fələkin dili tutuldu bu ulu bəyan içində.

Ey qılan də’va ki, şaham, ədlü insafın qanı?
Çün səfa əhlindən oldun, məşrəbi-safın qanı?

Hər quşun olmaz səadətli hümatək kölgəsi,
Çünki simurğam deyərsən, laməkan Qafın qanı?

Əhli-irfanın yeri mə’nidə çün ə’raf imiş,
Çün sən ariflərdən oldun, ürfü ə’rafın qanı?

Möhtəsib bazara girdi, həqqi batildən seçər,
Qəlbim aridir deyən, şol doğru sərrafın qanı?

Başımı top eylərəm, meydana girdim, oynaram,
Ey bu meydandan qaçan, şol urduğun lafın qanı?

Lütf əgər həqdən umarsan, göstər ehsan, lütf qıl,
Lütfü ehsanından uman yara əltafın qanı?

Kafü nun əmrindən oldu mayəkun məkan ilə,
Gər bu lövhün əbcədisən, nun ilə kafın qanı?

Ey Nəsimi, çün ulaşdın şeş cəhətdən yar ilə,
Bicəhət oldu hüdudun, həddü ətrafın qanı?

Gər bəyan edəm sana əsmayi-ruhəfzamızı,
Çün Məsiha seyr edərsən aləmi-balamızı.

Adəmi-xakidən əsma öyrənənlərdir mələk,
Divin əsli od idi, öyrənmədi əsmamızı.

Andan əsma oxuduq, əsmayi-küll derlər bizə,
Qəm degil div ər müsəlləm tutmasa də'vamızı.

Biz xəlifəzadəyiz, yer mülkümüzdür ta əbəd,
Heçə dəyməz kimsədir, kim bilməsə mövlamızı.

Gəl sən andan elmi-əsma öyrən, ey dil, lacərəm,
Aləm içrə gör müqabil bu tamam ə'zamızı.

İstivanın gərdişindən gər verirsən sən xəbər,
Görəsən əşyada, bişək, qamu istivamızı.

İnşirahi-sədr hasil qılmayan Musa kimi,
Kəsri-əlvah etmədi, görməz yədi-beyzamızı.

Tis'ə ayat atəşi Musavü lövhün sirrini
Anlayım dersən, gəl oxu sən bizim turamızı.

Xeymeyi-mir'ati-Israfilü Isa hikmətin
İstər isən gəl təvaf et məscidi-Əqsamızı.

Tə'n edərsə gər bizə nadanü ə'ma qəm degil,
Divi-zahirbin nə bilsin sirri-napeydamızı.

Səcdə edənlər mələkdir adəmə, ey adəmi,
Səcdə qıl ixlas ilə, ta görəsən simamızı.

Kəştiyi-Nuha ki, hər kim girmədi, oldu həlak,
Gər nicat istərsən, istə sən bizim dəryamızı.

Gəl səvadil-vəchini bil, fərdi-mütləqdir adı,
Rövşən anla qabü qövseyn ilə öv-ədnamızı.

Nəfyi isbat əslidir, lakin nə assi, müddəi
Lada qaldı, gəlmədi ta kim, görə illamızı.

Kafü nundur kainatın əsli, leyk kimsənin,
Yox macalı oxuya əsma, görə əczamızı.

Anların kim, həq taala gözün açdı dünyada,
Gördülər ə'lavü əsfəldə qədi-balamızı.

Ləzzətən lil-şaribin, xəmri-həqayiq içə gör,
Ola ki, eyb etməyəsən şurü şər qovğamızı.

Aliməm dedin vəlakin cəhlin oldu aşikar,
Gördülər cümlə xəlayiq mə'niyi-də'vamızı.

Nərrəşiri-bişeyi-tövhidi-sahibqüdrətəm,
Tülkülər qaçan biləsidir bizim mə'vamızı?!

Sirri-əhlin gər mütəvvəldir, yetər tənbeh, əgər
Anlar olursan bu rəmzin nükteyi-qərramızı.

Ey Nəsimi, çün Süleyman oldu quş dilin bilən,
Qafa varıb görmək istərsən bizim ənqamızı.

Qanı bir əhdü peymanı bütün yar?
Qanı bir qövlü gerçək, doğru dildar?

Qanı həqqi bilən bir gerçək ər kim,
Ola doğru anın dilində göftar?

Qanı dil ilə iqrar eyləyən kim,
Həqə yoxdur anın könlündə inkar?

Qanı bir incuyi-ari sədəf kim,
Buluna anda min lö'löi-şəhvar?

Qanı Mənsurləyin bir əhli-həq kim,
Asıla eşq içində başı bər-dar?

Qanı gerçəkləyin bir həqqə aşiq,
Qanı görmüş həqi bir əhli-didar?

Qanı qəflət şərabından bir ayıq,
Qanı əsrüklərin cəm'ində huşyar?

Qanı əhdində bir sabitqədəm kim,
Qoyam adın anın doğru vəfadar?

Qanı sadiqlərin razına məhrəm,
Qanı aşiqlərin rəncinə timar?

Qanı dünyada, yarəb, şol əmin kim,
Kim, anda gizlənə min dürlü əsrar?

Yar ilə çünki bir oldu Nəsimi,
Nə qəm, gər cümlə aləm olsa əğyar.

Ənəlhəq söylərəm həqdən, ələl-ərş istiva gəldi,
Üzündür sureyi-rəhman, ələl-rəhman əla gəldi.

Misali-Kə'bədir üzün fəla tə'du məəlallah,
Çü yetmiş yeddi hərf oldu, üzündən kafü ha gəldi.

Otuz iki hürufu kim, üzündən həq əyan etdi,
Bəşarət bu idi həqdən, xətindən tavü ha gəldi.

Üzündə gərçi həft ayət oxuram mən kəlamüllah,
Səlat ansız qəbul olmaz ki, həqdən bu nida gəldi.

ücuda gəlmədi şeytan, hidayət bulmadı nura,
Sənə hər kim sücud etdi, ana həqdən səna gəldi.

Mən ol Mənsuram, ey arif ki, daim söylərəm yahu,
Məni bər-dar edən həqdir, bu dar uş Mənsura gəldi.

Dəmi-İsa kimi nitqim, həyati-can derəm hər dəm,
Həqə minnət ki, vəslindən həyati-canfəza gəldi.

Saçından ətr olur hər dəm mana əhdü vəfa buyu,
Saçın əhdü vəfasından mana əhdü vəfa gəldi.

Nəsimi buldu vəslindən həyati-çeşmeyi-heyvan
Ki, Xızr abı içən, bişək, həyati-canbəqa gəldi.

Vücudi-Müstafa əsma degilmi?
Bu sirri bilməyən ə’ma degilmi?

Müsəmmadır xəfi, ey kənzi-məxfi,
Şühudu kənzi-həq ixfa degilmi?

Kitabi-həl-ətavü sirri-tənzil
Qaşınla zülfün öv ədna degilmi?

Təqərrüb, ya həbibülhəqq mənə,
Vücudun məscidül-əqsa degilmi?

Səmavat ilə ərziyyət bil kim,
Mədari-lamü bey ə’la degilmi?

Zühuri-nuri-Ibrahimü Haşim,
Bədini-Müstafa əzha degilmi?

Təcəlliyi-cəmali-laməkanı
Müsafi-həq üzün əsva degilmi?

Təmənnayi-liqayi-həq-təala,
Məzahir qibləsi ula degilmi?

Camali-Mustafa gördü Nəsimi,
Üzük övhavü ma-övha degilmi?

Üzündür gülsitan, billah, degilmi?
Sözündür kün-fəkan, billah, degilmi?

Ələl-ərş istiva rəhman yəqin kim,
Üzündür ol məkan, billah, degilmi?

Rüxün bağında, ey hurisifətlü,
Cahan oldu cinan, billah, degilmi?

Saçındandır Xətavü Çinü Ruma,
Səba ənbərfəşan, billah, degilmi?

Dodağındır ki, sirri-küntə kənzən
Bəyan eylər, bəyan, billah, degilmi?

Xətindən buldum ərrəhmanü taha,
Budur səndən nişan, billah, degilmi?

Ləbin abi-həyatındandır, ey can
Ki, Xızr oldu rəvan, billah, degilmi?

Sana Şirindəhan, ey Xosrovi-hüsn,
Deyən şirindəhan, billah, degilmi?

Qaşınla kirpigin, üzün günündə,
Əcəb tirü kaman, billah, degilmi?

Səni həq görməyən zahirdə ə’ma,
Gözündən həq nihan, billah, degilmi?

Üzündən çün cahan gəldi vücuda,
Gözündən həq nihan, billah, degilmi?

Ləbin eşqində can vermək həmişə
Həyati-cavidan, billah, degilmi?

Dəhanından hədisi qılmayan guş,
Sözü qeybü güman, billah, degilmi?

Üzündür, ey qəmərsurətli fitnə,
Zaman axırzaman, billah, degilmi?

Həq oldu könlümün şəhrində zahir,
Zəhi Mazandaran, billah, degilmi?

Vüsalın kişvərin fəth eyləyən can,
Şəhi-kişvərsitan, billah, degilmi?

Qılından incə gördüm, incədir həm,
Belin nazikmiyan, billah, degilmi?

Səvadi-ə’zəmilə Misri-came’
Üzündür, ya filan, billah, degilmi?

Saçınla arizin can müshəfidir,
Adı nurü düxan, billah, degilmi?

Üzündür Kə’bəsi əhli-səlamın,
Mübarək xanədan, billah, degilmi?

Məni vaiz bu gün-fərdaya salar,
Yalançı qissəxan, billah, degilmi?

Mana can sordu kim, zülfün nə yerdir,
Dedim, darül-aman, billah, degilmi?

Üzündən ta qəmər fərqü təfavüt
Zəminü asiman, billah, degilmi?

Deyən kim, nöqtədir adı dəhanın,
Əcaib xürdədan, billah, degilmi?

Cahanı dutdu hüsnün dasitanı,
Zəhi xoş dasitan, billah, degilmi?

Qiyamət qamətindən oldu zahir,
Bəlayi-nagəhan, billah, degilmi?

Nəsimi cövhəri-fərd oldu, anın
Məkanı laməkan, billah, degilmi?

Ey mana nahaq deyənlər, qandadır bəs yaradan?
Gəl gətir isbatını, kimdir bu şeyni yaradan?

Odu su, torpağü yeldən böylə surət bağlayan,
Böylə dükkan yasıyan kəndi çıxarmı aradan?

Gəl mana bir söyləgil, kimdir sənin nitqində kim,
Söyləyən, söylətdirən, eşitdirən hər yanadan?

Çünki bir şəhrin içində məscidü meyxana var,
Əhli-həq fərq eyləməz məscidləri meyxanadan.

Ol kim, özün bilmədi, düşdü cahana dərbədər,
Varlığın həq bilmədi, qurtarmadı əmmarədən.

Avara tək nə gəzirsən, ey özündən bixəbər,
Gəl həqin sirrini istə aşiqi-biçarədən.

Oynaram rəqqas olub çəngü dəfü tənbur ilən,
Çünki məndə şeş cəhət var, dönməzəm çarparadan.

Çün Nəsimi on səkiz min aləmin məqsududur,
Kim bu dövrü bilmədi, sür ta çıxa dəvvarədən.

Nari-cəhimə tə’n edər eşq odunun hərarəti,
Arif isən gəl, ey könül, bil bu dəqiq işarəti!

Dünyada cavidan evi kimsə üçün yapılmadı,
Keç bu keçən xərabədən, qoy bu fəna imarəti.

Süflü cahana vermədi könlünü hər ki, bildi kim,
Möhnətü rəncimiş anın təntəneyi-vəzarəti.

Səltənətü əmarətə eşq ilə təkyələnmə kim,
Beş gün imiş bu dünyanın səltənətü əmarəti.

Kə’bə içində görməyən şol sənəmi müayinə,
Heç imiş ol səfasızın sə’y iləvü ziyarəti.

İncədən incədir bu söz fətəbərukə kəndudan,
Dəxl edəməz bu məntiqə hər kişinin ibarəti.

Xəlq ilə əmri kün-fəkan zatü süfatıdır anın,
Həqqi bu rəsmə görməyən bağlı imiş bəsarəti.

Kim ki, bu bəhrə dalmadı, ma’i-təhuru bulmadı,
Təyyibü tahir olmadı, yoxdur anın təharəti.

Zərqü riya təriqinə düşməvü nəfsə uyma kim,
Kimsəyə assı eyləməz şol səfərin ticarəti.

Verdi Nəsimi canını vəsli-rüxün bahasına,
Gör bu şəravü bey’i kim, yoxdur anın xəsarəti.

İki aləm anındır kim, gözünə həq əyan oldu,
Həqi gördü, həqi bildi, həqi kim, bigüman oldu.

Əgər Musa kimi gəlmək, təcəlli görmək istərsən,
Nəzər qıl üzünə gör kim, iki aləm əyan oldu.

Təaləllah, nə zibasan ki, hüsnün dövri-bağında
Qaşınla kirpigin, zülfün üzündə gülsitan oldu.

Qiyamət qopdu hüsnündən, yedi iqlimə yayıldı,
Sənin qəddü qiyamından məgər axırzaman oldu?

Çəlipa zülfü xalından saçın leylidürür, amma
İrişdi ayəti-fanzur adı nurü düxan oldu.

Nigarın lə'linə hərdəm tökər şəhd üstünə şəkkər,
Vəli qafil nə bilsin kim, nədən şirin dəhan oldu.

Məkana sığmadı zatım, əzəldəndir bədayatım,
Nəsiminin bu mə'nidən məkanı laməkan oldu.

Kim ki, bildi bu siratil-müstəqimin rahını,
Əhli-irfan olduvü bildi yəqin Allahını.

Göydəki cümlə məlaik adəmə qıldı sücud,
Həq-təaladan gör anın bunca izzü cahını.

Həq buyurmuş ərzülillah aqibət lil-müttəqi,
Çün deyilsən müttəqi, mülk etmə ərzüllahını.

Çün əmirəlmö'minin mən nöqteyi-bayam dedi,
Kim ki, hərfin sirrini bilməz nə bilsin şahını?

Küllü-şey'ün halik oldu, qaldı illa vəchəhu,
Hər yanadan baxdı arif, gördü vəchüllahını.

Ey Nəsimi, hər kim öz nəfsindən oldu baxəbər,
Cümleyi-əşyada zahir gördü nitqüllahını.

Kişi kim, xacəsi birlə qənimət tutsa xəlvətni,
Qılır xadim eşigində səadətbəxt dövlətni.

Kəsilgil masivallahdan, özünü bağlagil həqqə,
Dilər isən qiyamətdə, ulu həzrətdə izzətni.

Bu il böylə qılam dersən, gələn il daxi həm böylə,
Gəl eylə-böyləni tərk et, qənimət tut bu fürsətni.

Tamah adəm vücudunda bəğayət zişt illətdir,
Qənaət nuşidarudur ki, dəf' eylər bu illətni.

Qəmindən geydigi şaldır, gör axır aşiqin halın
Ki, didar arzusun edər diləməz hurü cənnətni.

Yaman yaxşı ilə yaxşı müdara eyləsə, yaxşı,
Kişi yetməz muradınğa, bülənd dutmazsa hümmətni.

Rəvan düş mənbər üstündən, uzatma sözü, mövlana,
Əgər əqlin kamal olsa, gəl içgil, qoy bu höccətni.

Nəsimi laübalidir, ana eyb etmə, ey sufi,
Nəçün təbdil qılım dersən əzəl gündənki qismətni?

Surətin nəqşində hər kim görmədi nəqqaşını,
Vahibi-surət anın gözsüz yaratmış başını.

Qabü-qövseynin rümuzun sanma kim, fəhm eyləyə
Kim ki, zahir görmədi şol mahi-bədrin qaşını.

Ləbləri şirin nigarın firqətü hicranıdır,
Axıdar yanınca şəm'in gözlərindən yaşını.

Düşmədi batil xəyala, olmadı sevdası xam,
Hər kimin kim, eşq oduyla həq bişirdi aşını.

Gərçi fərraşi-məlikdir ənbərəfşan sünbülün,
Çünki mən sultanı buldum, neylərəm fərraşını?

Həqqə vasil rindü həqdən ayrıdır zahid, görün
Xanəqahın şeyxini, meyxanənin övbaşını.

Dəmbədəm sufi məlamət daşın atar aşiqə,
Daşı qiymətsizdir anın, içini gör, daşını.

Hasilin məscid bucağında gör axır kim, nədir,
Ey məlamət eyləyən meyxanənin qəllaşını.

Yaşını yandırdı eşqin, həm qurusun könlümün,
Kim ki, eşqə düşdü, yandırdı quruvü yaşını.

Könlümün şəhrində eşqin bir imarət yapdı kim,
Ta əbəd qoparmaz andan nöh fələk bir daşını.

Canımı eşqin əzəldə yoldaş etmiş özünə,
Qoymaya yoldaşlığın həqqin bilən yoldaşını.

Ey Nəsimi, halını gər kimsə bilməz, qəm degil,
Həq bilir xəlqi-cahanın sirrini, həm faşını.

Yarə qılan vəfasını, yara qılır cəfasını,
Ey dil, anın cəfasına qatlan, unut vəfasını!

Kim ki, irişmək istədi uca boyun vüsalına,
Oldu həmişə fərz ana çəkmək anın bəlasını.

Dərd ilə xoş keç, ey könül, qəmdən usanma, çün bilir
Aşiqi-dərdiməndinə dərdi verən, dəvasını.

Zülfü qaşın qarasına bağlamayan kişi könül,
Bilməmiş ol üzüqara, zülfü qaşın qarasını.

Vəslü fəraqa vasitə çünki qədərdir, ey könül,
Cəhd ilə kimsə qadirin mən' edəməz qəzasını.

Kövnü məkana vəslini qiymət edüb, bəha qılan,
Yoxdur anın gözündə nur, bilməz anın bəhasını.

Ta bilələr ki, az imiş aləmə feyzin, ey günəş,
Yerdəvü gökdə göstərər mehri-rüxün ziyasını.

Kə'bə üzündür, ey sənəm, üzünə səcdə eylərəm,
Hacısıyam bu Kə'bənin, mən bilirəm səfasını.

Ayinəsində görməyən surəti-nəqşini əyan,
Ayinədən gedirməmiş ol qaragünlü pasını.

Zülfi-dütasını anın kövnü-məkana, ey könül,
Al və iki cahana sən vermə bir incə tasını.

Canıma şol ala gözün eylədigi cəfaları
Ol nə bilir ki, görməmiş gözlərinin alasını.

Gərçi ətasıdır cəfa aşiqə şol vəfasızın,
Can ilə istər, ey könül, aşiq anın ətasını.

Çinü Xətaya surətin nəqşini göndər, ey sənəm,
Ta büti-Çinə tapanın göstərəsən xətasını.

Gərçi sözü Nəsiminin qabili-kimiya imiş,
Tuncü hədidə sanma kim, xərc edə kimyasını.

Mərhəba, insani-kamil, canımın cananəsi,
Aləmin cismi sədəfdir, sənmisən dürdanəsi?

Vəchini səb'ül-məsani oxuyan gündən bəri,
Gör ki, nə divana düşmüş aşiqin divanəsi.

Ta səqahüm şərbətindən içdi bu xəstə könül,
Seyri-öv ədnayı buldu, qaynadı xümxanəsi.

Çün bizə mə'lum olubdur mə'niyi-ümmül-kitab,
Arifəm, səm'imə sığmaz zahidin əfsanəsi.

Şol Xızır biçarə içmiş abi-heyvan dedilər,
Ta ləbin eyninə irməz, yoxdur onun xanəsi.

Əhsəni-təqvim bilən nəçük ənəlhəq deməsin?
Bəs nədən bərdar olubdur Mənsurun divanəsi?

Kafirin bütxanəsi var, mö'minin – Beytülhəram,
Aşiqin yar eşigidir Kə'bəvü bütxanəsi.

Şəm'i-vəhdətdir camalın, söhbəti rövşən qılır,
Qarşıda xoş-xoş yanadır Seyyidin pərvanəsi.

Bəhri-mühit imiş könül, yoxdur anın kənarəsi,
Lə'l ilə səlsəbil imiş, ab ilə səngi-xarəsi.

Faniyi-mütləq olmuşam, həqqiləyəm, həq olmuşam,
Kim ki, həqi dilər, budur çarəsi, üştə çarəsi.

Şə'şəəsində məhv olur ay ilə gün bu Zöhrənin,
Gör ki, nə afitabmış şol fələkin sitarəsi.

Kirpiginin xədənginə uğradı xəstə yürəgim,
Ey bu oxa inanmayan, uş cigərimdə yarəsi.

Sirri-ələsti-rəbbikum çünki götürdü pərdəyi,
Zahidə assi eyləməz xirqeyi-parə-parəsi.

Türrəsinin cəfaları sağişə gəlməz, ey könül,
Sən bu şümara düşmə kim, mən bilirəm şümarəsi.

Canü cahana zülfünün tarəsin alü verme kim,
Gər verəsən, ucuz ola canü cahana tarəsi.

Qanğı həzarədəndürür qəmzələri bölükü kim,
Durmaz anın xədənginə min çərinin həzarəsi.

Eşqə əzəldə vermişəm ücrətə könlüm evini,
Şər' ilə kimsə ta əbəd fəsx edəməz icarəsi.

Qaşlarının rümuzuna əql irəməz, Nəsimiya,
Gör nə qədər dəqiq imiş qaşlarının işarəsi.

Məqalindir bu rəncurun şəfası,
Şəfaül-qəlb məhbubun liqası.

Qaşındır vəhy, eynin ayətüllah,
Nəharü leyl anın ağü qarası.

Vüsalın şövqünü şol can bilir kim,
Anın canındadır eşqin bəlası.

Cəm ol arifdir, ey dilbər kim, oldu
Üzün ayineyi-geytinüması.

Gəl, ey aşiq, şəhid ol eşq içində
Ki, həqdir ol şəhidin qanbəhası.

Riyayi-zahid eylər eşqə inkar,
Bəladır zahidin zərqü riyası.

Fəqih adəmdən ürkər, səcdə qılmaz,
Məgər şeytandır ol şumun xudası.

Qiyamət qopdu, ey tacir, zərülbi'
Ki, yoxdur ol günün bey'ü şərası.

Əgər safisən, ey sufi, gey ətləs
Ki, biqədr oldu tamatın libası.

Nəsimidir vücudi-fərdi-mütləq,
Bu tövhidin əhəddəndir əsası.

Nə tubadır boyun, yarəb kim, irdi ərşə balası,
Nə sünbüldür saçın gör kim, cahanı tutdu sevdası.

Günəş təl'ətli üzündür bu gün aləmdə, ey dilbər
Ki, hər mə'nidə kamildir, bulunmaz mislü həmtası.

Nə yəğmaçı moğolçindir gözün, yarəb ki, dövründə
Yayılmışdır yasağından yedi iqlimə yəğması.

Sədəfdən gərçi, ey dilbər, çıxar qiymətli incular,
Vəlakin özgə cövhərdir dişin lö'löi-lalası.

Camalın vəslini həqdən dilər aləmdə hər aşiq,
Vəli şol dürri-məknunun bulunmaz qə'ri-dəryası.

Qaradır geydigi ya gög həmişə zahidin, yarəb,
Nə matəm düşmüş ana kim, tükənməz heç anın yası?

Şərabü şahidin zikri dilimdən getmədi ta kim,
Məni sevdadan əsritdi nigarın eyni-şəhlası.

Riyalı zahidin daim işi təzvirü iğvadır,
Vəli kar etməz ol divin mana təzvirü iğvası.

Qül Allahümmə malik çün mana tə'vizi-hirz oldu,
Xilas oldum yüvəsvisdən, gedir sən də bu vəsvası.

Bu gün-fərdadan, ey vaiz, məni qorxutma, əbsəm dur
Ki, qorxusuzdur ol arif ki, imruz oldu fərdası.

Üzün lövhündə, ey huri, ilahı görməyən qafil,
Yəqin kim, güzgüsü anın üzündən getməmiş pası.

Nəsimi çün səni buldu, irişdi cümlə məqsuda,
Muradı cümlə xətm oldu, tamam oldu təmənnası.

Ey üzün nuri-zati-yəzdani,
Vey rüxündür süfati-rəhmani.

Kirpigin, qamu zülfü rüxsarın,
Həq kəlamıdır, oxu Qur'anı.

Lövhi-məhfuzi-həq ələt-təhqiq,
Adəmi bil, əgər zi insani.

Qabü qövseyn ilə müsəlman ol,
Allah, Allah, budur müsəlmani?

Küfri zülfün savadına iman
Gətirən buldu nuri-imanı.

Ləbi-lə'lindən içən abi-həyat,
Nedə zülmətdə abi-heyvanı.

Yerü gög, xüldü rövzeyi-rizvan,
Cənnəti-ədn imiş gülüstanı.

Uyma şeytana, nəfsini öldür,
Oda buraxma cavidan canı.

Cana gir gör camali-canənə,
Qalmayan cana, buldu cananı.

Sirri-sübhanəlləzi-əsra
Yazdı vəchində dəsti-rəbbani.

Səcdə qıl adəmə firiştə kimi,
Sən təkəbbürdən olma şeytani.

Gəl bu gün fani ol, bəqa bulasan,
Danla sud eyləməz peşimani.

Ayü gün səcdə qıldılar üzünə,
Ey camalilə Yusifi-sani.

İxtiyar eylə fəqri, dərviş ol,
Fəqri bil tacü təxti-sultani.

Fəzli-həqdən Nəsimi, yetdi sana
Mülkətü xatəmi-Süleymani.

Dün gecə bir dilbər ilə eyşimiz mə'mur idi,
Leykin ol xunxarə gözlər uyxudan məxmur idi.

Gözlərin süzmüş və üzmüş canını aşiqlərin,
Asılı zülfündə yüz min Şiblivü Mənsur idi.

Sözlərindən zahir oldu şol Məsihin mö'cüzat,
Dodağından bir işarət aşiqə pək dur idi.

Hüsnü lövhündə yazılmış xubların şahı, deyü,
Sümmə ənşə nahu xəlqən axərin məşhur idi.

Zülfü sübhanəlləzi-əsra, biəbdi ayəti,
Yanağı üzrə müsəlsəl xətt ilə məstur idi.

Boyu tuba, üzü cənnət, adə kəlurcun qaşı,
Gözləri vənnəcm, anın sinəsi vəttur idi.

Həmnişin idi Nəsimi dün gecə bir yar ilə,
Könlü şadü vəxti xürrəm, məclisi pürnur idi.

Səndədir şol gənci-pünhan, gəzmə hər viranəyi,
Dəngizə dal, andan istə, ey könül, dürdanəyi.

Canı ver, cananəyi bul, olma bicananə kim,
Təndə canı yoxdur ol kim, bulmadı cananəyi.

Zahidin əfsanəsindən hasil olmaz faidə,
Var ikən eşqin hədisi, neylərəm əfsanəyi?

Ey səqahüm rəbbihüm xəmrindən ikrah eyləyən,
Əsrədün qəflət meyindən, sındır ol peymanəyi.

Ey həqi hər yerdə hazırdır deyən əgrinəzər,
Bəs nə mə’nidən seçərsən Kə’bədən bütxanəyi?

Hər kim aydır, Adəmi damə buraxan buğdadır,
Görməmişdir laləgun üzündə mişkin danəyi.

Ey çəkən uçmağa mişkin zülfi-pürçinin məni,
Cənnətə zənciri-zülfündür çəkən divanəyi.

Gənci-məxfidir saçın çün, ey bəşər surətli həq,
Niçün eylərsən bu gizli gəncə məhrəm şanəyi?

İncədir zülfün rimuzu, şanənin ağzı açıq,
Dilinə buraxma anın zülfi-mişkəfşanəyi.

Nara atan canını şol şəm’ üçün pərvanədir,
Nuruna şəm’ ol səbəbdən yandırır pərvanəyi.

Ey gələn qalu bəladan mə’rifətsiz canəvər,
Həq bəsirətsiz yaratmış ta əbəd biganəyi.

Çün məqalidüs-səmavat, ey Nəsimi, səndədir
Qafü lamından götürdü sinü şin dəndaneyi.

Ey ruhi-qüdüs, cifeyi-murdara yapışma!
Gülzari-cinanı qoyuban xara yapışma!

Məhbubi-əzəl, yari-əbəd var ikən, ey yar,
Əğyar ətəgin dutmavü əğyara yapışma.

Mənsur kimi istər isən mənzili-ali,
İtirmə bəqa darı, fəna dara yapışma!

Ey küpəyi incudan edən, məndən eşit pənd,
Söz dürrünü dut, lö’löi-şəhvara yapışma!

Qaludan əgər aləmə iqrar ilə gəldin,
İqrarını tərk eyləmə, inkara yapışma.

Ey mə’rifətin müshəfi, uş kənz ilə müsbah,
Miftah budur, məcməi-muxtara yapışma!

Mənlik satanın çünki dəğəl çıxdı qumaşı,
Var, ari mətah istə, bu bazara yapışma!

Kəsb eyləməyən axirəti, anı dəli bil,
Ey əql iyəsi, dünyayi-qəddara yapışma!

Saçı qaranın zülfünə yapışdı Nəsimi,
Ey badə verən ömrünü, zünnara yapışma!

Çarə yoxdur yara, əbsəm, ey könül, yar istəmə!
Dərdə çün dərman bulunmaz, rəncə timar istəmə!

Dünyanın yarından istərsən vəfa, əqlin qanı,
Hasil olmaz nəsnəyi, fikr eylə, zinhar, istəmə!

Münkirin iqrarı yoxdur həqqə, ey sahibnəzər,
Həqqə iqrar eylə sən, münkirdən iqrar istəmə!

Möhnəti çoxdur cahanın, zülmətindən gəl, saqın,
Ey gözüm aydınlığı, zülmətdən ənvar istəmə!

Güzgünü arıtmayınca, ey liqadan bixəbər?
Surətin görmək təmənna etmə, didar istəmə!

Dünyanın miqdarı yoxdur, gər bilirsən qədrini,
Qədrinə inanma, andan qədrü miqdar istəmə.

Dəgmə naməhrəm nə bilsin aşiqin əsrarını,
Məhrəm ol, əsrara gir, ya məndən əsrar istəmə.

Bunca möhnət çəkməyincə hər dikəndən bir zaman,
Bülbüli-aşiq kimi çağırma, gülzar istəmə!

İstəyən murdarı kərkəsdir müdam, ey türfə quş,
Həzrətin şahbazı ol, yə’ni ki, murdar istəmə!

Varlığı fanidir, ey qafil, bəqasız dünyanın,
Şol bəqasızdan bəqa mümkün degil, var, istəmə!

Gərçi həqdən vahid oldu nur ilə anəstunar,
Ey Nəsimi, çün ulaşdın nuruna, nar istəmə!

Sən sana gər yar isən var, ey könül, yar istəmə!
Yarü dildar ol sana, sən yarü dildar istəmə!

Bivəfadar çün bu aləm, kimdən istərsən vəfa?
Bivəfa aləmdə sən yari-vəfadar istəmə!

Gül bulunmaz bu dikənli dünyanın bağında çün,
Əbsəm ol, bihudə gülsüz yerdə gülzar istəmə!

Mə'rifətdir xalis altun, sikkəsi fəzlü hünər,
Altunu tanı, zəğəldən ari dinar istəmə!

Həqqə münkirdir fəqih, inanma ol şeytana kim,
Yoxdur ol cinxilqətin zatında iqrar, istəmə!

Ari göftar, ey könül, gerçəklərin nitqidürür,
Hər diliəgridə yoxdur ari göftar, istəmə!

Cifədir dünya, anın talibləri adı kilab,
Olma kəlb anın kim, oldu adı murdar, istəmə!

Şərbəti ağuludur fani cahanın, sən anın
Şərbətindən nuşudaru umma, zinhar istəmə!

Dünyanın sevgisi ağır yük imiş, məndən eşit,
Nəfsini yük etmə ana, ey səbükbar, istəmə!

Bir əmin məhrəm bulunmaz, ey Nəsimi, çün bu gün,
Xəlqə faş etmə bu rəmzi, kəşfi-əsrar istəmə!

Dil bazarçısı yalandır, varmazam bazarına,
Gerçək olmaz əgridil, inanmazam iqrarına.

Sadiq oldur, dilini könlü ilə bir eyləyə,
Əgri dildən nəsnə gəlməz, durmuşam inkarına.

Varı möhnətdir cahanın, nə umarsan, ey könül,
Lə’nət olsun bu cahana, həm cahanın varına!

Dilbəri oldu kimin kim, fani dünya, aqibət
Keçdi ömrü, doymadı, irişmədi dildarına.

Taxta çıxmaq istəməz Mənsur olan, ya minbərə,
Hər ki, Mənsur oldu, çıxdı şahi-eşqin darına.

Dünyanın nazü nəimi cifədir, yə’ni nəcis,
Ey könül, tahirsən axır, sunma əl murdarına.

Həq bilir işini, səbr et, fariğ ol, qüssə yemə,
Vəqti yetsin bu cahanın, qoy və qatlan karına.

Hiç gül olmaz dikənsiz, hiç şadi qüssəsiz,
Dərmə gülündən anın, çün gülü dəgməz xarına.

Çün Nəsiminin qəmindən Fəzli-həq vaqifdürür,
Qəm degil gər kimsə olmaz müttəle’ əsrarına.

Şol şəm'i gör ki, nuruna pərvanəyəm yenə,
Baş oynamaqda yoluna mərdanəyəm yenə.

Saqi, ləbindən əsrəmiş əvvəl qədəhdən uş,
Məstanə gözlərin kimi məstanəyəm yenə.

Qalu bəlada kuyi-xərabat idi yerim,
Şol mə'nidən mücaviri-meyxanəyəm yenə.

Bəzmi-əzəldə həmnəfəsim gərçi cam idi,
Şükr eylərəm ki, həmdəmi-peymanəyəm yenə.

Ey bilməyən bu cani-əzizin həqiqətin,
Canı bilənə sor ki, nə cananəyəm yenə.

Eşqində ay camalilə əfsanə, filməsəl,
Xəlqin dilində gör ki, nə əfsanəyəm yenə.

Əndişənin imarətini qılmışam xərab,
Şol gənci-binəhayətə viranəyəm yenə.

Yarəb, nə sehr edər şu pərişəklü şivə kim,
Zəncir-cə'di-zülfünə divanəyəm yenə.

Ey gövhərin bahasını, miqdarını bilən,
Əsdaf içində gör ki, nə dürdanəyəm yenə.

Üzündə, ey sənəm, görəli zülfü xalını,
Dami-bəlada danə kimi danəyəm yenə.

Kəşf eylədi Nəsimi dəhanın rümuzunu,
Müftahi-qeybə gör ki, nə dəndanəyəm yenə.

Kim ki, aldandı cahanın ağulu ləzzatına,
Düşdü şol mənsubəsi çox dünyanın şəhmatına.

Divi-məl'undur, saqın, əmmarə nəfsin mərkəbi,
Minmə, gər azğun degilsən nəfsi-şumun atına!

Də'va eylərsən ki, həqqi bilmişəm, sadiq degil,
Çün dəlilin yoxdur, ey münkir, anın isbatına.

Zülfü qaşın, kirpigindir tilkə ayatül-kitab,
Üştə müshəf, gəl bax anın surəvü ayatına!

Taətü zikrü namazı məkrü fəndir zahidin,
Arif ol, aldanma billah, zahidin tamatına!

Nəfxeyi-surun sədası dutdu afaqı, eşit,
Ey olan aşiq, həmirin ənkərəl-əsvatına!

Kafirin bütxanəsidir dünyanın kaşanəsi,
Yoxdur imanı anın kim, səcdə qıldı latına.

Cami-Cəmşid oldu hər şey, surətindən uy verür,
Ey günəş, feyzin irişdi aləmin zərratına!

Zatının eynidir Allahın süfatı, ey bəşər,
Leykin ol bildi bu rəmzi kim, irişdi zatına.

Surətin gör kim, nə müğləqdir anın mə'nisinə,
Kimsənin əqli irişməz kəndi idrakatına.

Çün camalından Nəsimi əbcədin qıldı tamam,
Eynü mimin əmməsindən irdi vəssafatına.

Əlhəmdülillah, Əhmədin girdik əbavü şalına,
Bu-fəzli-rəbbülaləmin oldu əliyyü alına.

Fani cahana qalmadıq, əmmarə nəfsə uymadıq,
Aldandılar, aldanmadıq dünyavü məkrü alına.

Aşiqləriz, qıldıq nəzər yarın camalü vəchinə,
K'ol vərdi-həmra çiçəgin səllü əleyhü alına.

Alnında çün şəqqül-qəmər açıldı iman əhlinə,
Əşrat saət hökmilə basıldı xatəm alnına.

Şeytan siratı görmədi üzündə yarın müstəqim,
Yalğunə qeyyəndir cəza divi-ləinin zallına.

Oxur yəqövlül-kafirun, ya leytəni küntü türab,
Nari-cəhimi duymayan yananda narın yalına.

Anlar ki, nar əshabıdır, çıxmaz tamudan ta əbəd,
Qalə xəsu fiha cəvab anlar necəkim yalına.

Ey istivayı bilməyən, doğru yolunu yanılan,
Ə'ma degilsən aç gözün, bax innəməl-amalına.

Cananə üzü qiblədir, mehrabi-məscid qaşları,
Div olma, candan səcdə qıl şol qiblənin iqbalına.

Qalu bəladan sidq ilə canım dolaşdı zülfünə,
Dövlətlü canim bəndədir həşmətli zülfü xalına.

Nəfsini bunda bilməyən Allah nurun görmədi,
Həqqini nisyan eylədi, baxmaz həq anın halına.

Tövhidi-xalisdir mana görmək camalın, ey sənəm,
Ölsün həsəddən müşrikin, lə'nət qamu dəccalına.

Qopdu qiyamət fitnəsi, uruldu surun nəfxəsi,
İştə nəfirin seyhəsi, çalındı sanma çalına.

Məcmərdə udi-zülfünün, mişkin qoxusu bəs mana,
Hacət degildir, ey pəri, ud üzrə ənbər salına.

Həqqə yəqin ixlas ilə çün niyyətül-mö'min gərək,
Eşqə mühübb ol, ey könül, bax innəməl-ə'malına.

Can ilə dilbər yoluna verdi Nəsimi könlünü,
Adəmdə rəhman surətin kim görsə könlü alına.

Yoxdur vəfası dünyanın, aldanma anın alına,
Rəngindən oldu münfəil, hər kim boyandı alına.

Nəqdi dəğəldir dünyanın, anınla bazar eyləmə,
Niçün ki, hər kim qəlb ilə eylərsə bazar, alına.

Çün cümlə qiylü qal imiş darül-qürurun hasili,
Şol bisəbatın düşməgil bihudə qiylü qalına.

Arısı yalandır, saqın, dadlusına aldanma kim,
Acıdır anın şəkkəri, ağu qatılmış balına.

Əsli dənidir dünyanın, zatında yoxdur bir əlif,
Tərkibinə gəl bax anın, şol yavü nunü dalına.

Fani cahanın sevgisi damu odudur yandırır,
Qaç ol qarıdan, ey könül, aldanma zülfü xalına.

Möhnətdir anın dövləti, zəhmətdir anın həşməti,
Müdbirdir ol kim, bağladı qəlbin anın iqbalına.

Təzvirü böhtandır işi, həm qövlü fe'li müxtəlif,
Halın sana şərh eylədim, fikr eylə anın halına.

Divi-rəcimin atıdır əmmarə nəfsin mərkəbi,
Tərk eylə divin atını, yapışma anın yalına!

Möhkəm oyunçudur fələk, mənsubəsindən gəl saqın,
Ey bibəsirət, bax anın şol surəti-əhvalına.

Şol bimisalın eşqinə verdi Nəsimi könlünü,
Dünya nola, ya axirət kim, qala mülkü malına?

Ey binəzirü vahid, hüsnün camal içində,
Üzün qiyamət eylər xoş xəttü xal içində.

Sübhi-əzəldə hər kim buldu səninlə vüslət,
Qaldı səninlə daim eyşi-vüsal içində.

Mən məndə həqqi buldum, həqqəl-yəqin həq oldum,
Uyxuda qaldı münkir nəqşü xəyal içində.

Ey aləmin həyatı, eşqin nə nar imiş kim,
Qərq eylədi cahanı abi-zülal içində.

Fərdiyyətin kamalı oldu sənə müsəlləm
Kim, qayətə irişdi hüsnün kamal içində.

Ağzınla zülfi-mişkin müşkati-nuri-həqdir,
Gəl həqqi xəlqə göstər şol mimü dal içində.

Ey istəyən liqayı, yarın günündə həqdən,
Fərdaya düşmə, qalma fikri-məhal içində.

Üzünlə xəttü xalın şol şəmsi-xavəridir,
Heç kimsə görməz anı hərgiz zaval içində.

Üzün şəmayilindən, qaşın dəlayilindən
Qövğayi-fitnə düşdü bədrü hilal içində.

Ruhül-əminə sordum əsrarını dodağın,
Nitqi dutuldu, qaldı ol bu sual içində.

Eşqin qəmidir, ey can, şadlığı əhli-eşqin,
Şad olmayan bu qəmdən qalsın məlal içində.

Ey məkr içində sufi, aldanmaz ala, dilbər,
Get, ömrünü çürütmə təzvirü al içində.

Şol qəmzə şivəsindən bir hala düşmüşəm ki,
Baxan bu hala, istər düşmək bu hal içində.

Üzün kimi Nəsimi, ey xubların əmiri,
Xurşidi-ləmyəzəldir miğü zilal içində.

Ey mükərrəm hüsni-surət, ey mütəhhər maü tin,
Rəhməti-lil-aləminsən, rəhməti-lil-aləmin.

Dövri-hüsnün ləmyəzəldir, ey camalın layəzal,
Bildigim elmül-yəqindir, gördügüm eynəl-yəqin.

Ey yanağın surəsi vəşşəms, üzün ayəti:
Hazihi-cənnati ədnin fədxəluha xalidin.

Külli-şey'ün halikün vəchindən ayrı şək degil,
Ey hidayət şəm'i üzün, vey saçın həblülmətin.

Qibləmizdir surətin, əlhəmdülillah, ey nigar,
Ta əbəd iyyakə nə'buddur camalın nəstəin.

Əsrimiş məstanə eynin sağərindən səlsəbil,
Susamış cənnətdə lə'lin abına mai-məin!

Nunü eynin, mimü dalın tilkə ayatül-kitab,
Lövhi-məhfuz oldu üzün, hüvə Qur'anün mübin.

Nəfxeyi-İsa gəlir şirin ləbindən canlara,
Sabit oldu kim, ləbindir möhbiti-ruhül-əmin.

Huri-eynin surəti ayinə oldu hüsnünə,
Şol səbəbdən xəlqə mərğub oldu həqdən huri-eyn.

Ey ləbin şə'nində münzəl ayəti-yöhyül-izam,
Canmıdır, yarəb, ləbin, ya xaliqi-canafərin?

Malikəl-hüsn oldu, ey dilbər, camalın ta əbəd,
Aşiqin dini budur, buldu Nəsimi yövmi-din.

Səfa bağışlamış bağa səba İsaləin dəmdən,
Yaşarmış quru ağaclar netəkim nəxl Məryəmdən,

Şol irmaqlar gülab olmuş, əbiri xoştürab olmuş,
Nəbata fəthi-bab olmuş, yenə ol kaşifi-qəmdən.

Yenə ol aləmül-qeybin xəbər gəldi çərisindən,
Ön əvvəl qarın altından gəlir casus çiydəmdən.

Nə dəryadır irişdim uş əcaib ləşkəri-xamuş,
Kimi al, kimi ətləspuş, kiminini donu göy qəmdən.

Əcəb gəncinə açılmış, çiçəklər yerə saçılmış,
Bəlirməz yer zümurrüddən, zümürrüd üzüdur həmdəm.

Gəlir susən qılınc ilən, soya donunu nəsrinin,
Çıxar xətmi sügü ilən, qapar qalxanı Rüstəmdən.

Gülə nərgis gözün süzdü, gül açıldı üzün düzdü,
Rəyahin sünbülün çözdü, saçar qoxuyu pərçəmdən.

Şəqayiq yasəmən dutar, şamama hülləvü əbhər,
Səmən simavü siminbər, ucalmış qamu xürrəmdən.

Sararmış ərğəvan bənzi kənari-cuyidən tanıq,
Sanasan Kə’bə sultanı üzün yur abi-zəmzəmdən.

Çü nilufər nəfərlənmiş məgər dildar lütfündən,
Bənövşə ikiqat olmuş, yatır çün zülfi-dərhəmdən.

Sənubər qafiyə əbhər sorar kim, nişə lal oldun,
Cavab ayıtdı, suç etdim dilim çəkdilər ənsəmdən.

Yerin yağmur həyatıdır, həyat uçmaq nəbatıdır,
Bahar onun səbatıdır ki, göstərər bu aləmdən.

Havada tutiyü qumru, çəməndə çəngü saz eylər,
Dutar ahəngini quşlar kimi zilü, kimi bəmdən.

Ağaclar hüllə puşindən, ya qönçə badə nuşindən,
Çəmən sərxoşi cuşindən, qədəh pürlə’li-şəbnəmdən.

Nə qafil evdə qalmışsan, sən ey qafil, bu mövsümdə,
Çü bülbül güldən ayrılmaz, ya aşiq yarü həmdəmdən.

Çü bilirsən sərəncamı, keçirmə püxtədən xamı,
Qənimət gör bu əyyamı, bu gün sən camı çək cəmdən.

Çü gördün güllər açılmış, suçular qeybə içilmiş,
Bulara qarşı biz daxi nuş etdik, içdik ol cəmdən.

Ələ gətir nigarını, ye, iç onunla varını,
Bu gün xoş keç qo yarını, qərəz xoş andır adəmdən.

Əyağa əl uralım uş, bu dəm eyşi sürəlim uş,
Dəmimiz xoş görəlim uş, neçələr qaldı bu dəmdən.

Gör ol salusü məhrumu, məni zöhd ilə qorxudur,
Sanasan kəndi dün gəlmiş bərat ilə cəhənnəmdən.

Bu asi qulların cürmü cahana imdimi gəldi,
Bizə ol dəmdə qalıbdır günah Həvvavü Adəmdən.

Nəsimi, asiyə uydun, vəli bunu dəxi duydun
Ki, cürmün bilənə rəhmət qılır həq matəqəddümdən.

Ey qəflətin meyindən məstü xərabü heyran,
Gər həqqi tanımışsan, qanı dəlilü bürhan?

Nəfsi-xəbisə uymaq nadanların işidir,
İşin nədir gör axır, fikr eylə, olma nadan?

Çün hər nə kim, əkərsən, anı biçərsən axır,
Dünyada əkmə anı kim, adı oldu üsyan.

Tərk eylə səyyiatı, saleh əməl qazan kim,
K'anın cəzası həqdən həm lütf imiş, həm ehsan.

Əyyamını həyatın badi-həvaya vermə
Kim, itirən həyatı üqbadadır peşiman.

Müflis ticarət eylər sərmayəsiz və leykin,
Sə'yi əbəsdir anın, sevdası cümlə xüsran.

Naqis vücuda çün kim, nöqsan gəlir həmişə,
Cəhd eylə kamil ol kim, gəlməz kamala nöqsan.

Dünyayi-dun qəmindən sayru olub sararma,
Aləmdə kimsə çün kim, bulmaz bu dərdə dərman.

Hirsü həsəd sifatın tərk eylə, ayrıl andan,
Neçin kim, ol sifətdən nacidir ayrılan can.

Çün əscədu buyurdu adəm qatında həq, gəl
Həqqin xitabına uy, qıl səcdə, olma şeytan!

Divin libasını qo, Xızr ilə yoldaş ol kim,
Zülmətdə zahir olmaz heyvana abi-heyvan.

Həqqin rizasın istə, qüfranə qabil ol kim,
Şol uca qədrü bəxtin kəsbi degildir asan.

Əbd olma, ey Nəsimi, fani cahana çün kim,
İmanü din içində sənsən əmirü sultan.

Olmazsa mülkü malın, andan nə qəm, nə qüssə,
Övladi-təyyibinsən, həm adəmü həm insan.

Cahanı tərk edib bezdim cahandan,
Cahan oldum, cahan oldum haçandan.

Əgər məhbuba istərsən ulaşmaq,
Gəlib keçmək gərəksən kün-fəkandan.

Cahanın səhl imiş sudü ziyanı,
Qo anın assisin, qurtar ziyandan.

Əgər cinni degilsən, adəmi bil,
K’anın əsli nədəndir, söylə andan.

Gümandan bilmədi heç kimsə həqqi,
Yəqindir kim, yəqin bitməz gümandan.

Gülü bitməz tikənsiz dünyanın çün,
Gülü tərk eylə, keç cövri-tikandan.

Dodağı candır ol şirindəhanın,
Məgər qafildir ol şirindəhandan?

Əyan oldu üzün, yarəb, saqınsın
Camalın fitneyi-axırzamandan.

Qamudan keçmişəm lillahi-fillah,
Məgər şol türreyi-ənbərfəşandan.

Əleyna cəm’əhü bəs latəhərrik,
Günəş müstəğnidir şərhü bəyandan.

Yerü gög dolu həqqin ayətidir,
Vəli gözsüz xəbərsizdir nişandan.

Nəsiminin muradı çün sən oldun,
Nəzər qət’ eylədi kövnü məkandan.

Ey bərgüzidə surət, cansan, vəli nə cansan!
Həm ism ilə müsəmma, həm cism ilə rəvansan.

Abavü ümühatdan sənsən xülasə, şəksiz,
Ey kainata məqsəd, məqsudi-kün-fəkansan.

Çeşmü rüxün süfatı kövnü məkana sığmaz,
Ey gövhəri-yeganə, sən gənci-laməkansan.

Leylü nəhar içində şəmsü qəmər kimi uş,
Hər yana kim, baxarsam eynül-yəqin əyansan.

Qərq eylədi camalın nurunda kün-fəkanı,
Ey gövhəri-həqiqət, şərh eylə kim, nə kansan?

Ərzü səmada yoxdur bir zərrə səndən ayru,
Ey cümlənin vücudu, bacümlə dərmiyansan.

Hər şeydə gərçi sənsən, ey məh, günəşdən əzhər,
Ə’ma sanır ki, gözdən laşey kimi nihansan.

Üzün kitabi-münzəl, zülfü rüxündür ayət,
Ey xaliqin kəlamı, dilimdə tərcümansan.

Həq surətində insan sənsən gələn cahana,
Ey Tanrının süfatı, aləmdə cavidansan.

Canü cahanı sənsiz neylər mühübbi-sadiq,
Ey aşiqin həyatı, həm canü həm cahansan.

Sevdalı nərgisindən düşdü cahana qovğa,
Ey hüsn içində fitnə, sərfitneyi-zamansan.

Qandırdı kainatı qəndü nabata lə’lin,
Ey xosrovi-məlahət, şirin, şəkərdəhansan.

Hüsnün təcəllisindən gəldi vücuda aləm,
Ey vaiz, əbsəm ol kim, yalançı qissəxansan.

Həqdən gələn kəlamın mö’cüzdür, ey Nəsimi,
Sənsən ki, küntü kənzin əsrarına bəyansan.

Gəl, ey dilbər, iki aləmdə cansan,
Gəl, ey ruhi-rəvanım, sən nə cansan?!

Fələk üstündə heyrandır, mələk mat,
Nə dəryasan, nə gövhərsən, nə kansan?

Həyati-Xızr axar daim ləbindən,
Anınçün çeşmeyi-abi-rəvansan.

Gözündən fitnə yayıldı cahana,
Məgər kim, fitneyi-axırzamansan!

Saçın buyu Xətavü Rumu dutdu,
Bu buy ilə məgər ənbərfəşansan?!

Saçından çün bəlirdi küntəkənzən,
Bəyan eylə, bəyan, şərhi-bəyansan!

Cahan oldu bu gün hüsnündə mə’mur,
Məgər ki, hüsn ilə kişvərsitansan!

Cahanın səhl imiş sudü ziyanı,
Ziyansız aşiqə sən biziyansan!

Bəladır qamətin, amma və lakin
Bu qədd ilə bəlayi-nagəhansan.

Camalındır bu gün aləmdə, ey can,
Əyan oldu cahan, həqdən əyansan.

Dəmadəm hüsnünə heyran olur can,
Məgər kim, sən həyati-cavidansan!

Cahan yandı bu gün eşqin oduna,
Yaxarsan aşiqi, atəşzəbansan!

Səba zülfün tozunu yelə verdi,
Məgər kim, sünbüli-ənbərnihansan!

Mana sən nəqlini ərz etmə, vaiz,
Anınçün kim, yalançı qissəxansan!

Nəsimi çün səni buldu əzəldən,
Həqiqət bildi ki, sən laməkansan!

Əgərçi candasan, candan nihansan,
Degilsən candan ayrı, bəlkə cansan.

Kişi verməz nişan səndən əgərçi,
Yerü gög dopdolu külli nişansan.

Necə gizlədəyim məndən səni kim,
Nəyə kim baxıram, andan əyansan.

Xəcil eylər rüxün hüsn ilə ayı,
Məgər sən fitneyi-axırzamansan?

Ərəb nitqi dutulmuşdur dilindən,
Səni kimdir deyən kim, türkmansan?

Canı tərh eylədim, bezdim cahandan,
Səni bildim ki, can ilə cahansan.

Görən sənsən, görünən sən gözümdə,
Nə var söyləmisən, külli lisansan.

Həqiqət, vəhyi-mütləqdir bu sözlər,
Bu sözü bil kim, andan tərcümansan.

Nəsimi, çün bu gün dövran sənindir,
Cahanda xosrovi-sahibzamansan.

Ətəgin silk, əlin çək kün-fəkandan,
Nə axır zübdeyi-kövnü məkansan.

Ey dürri-kani-hər şey, kim bilə kim, nə kansan?
Can səndən oldu çün hey, bilməz səni nə cansan!

Zatına kimsə irməz, vəsfini kimsə bilməz,
Zatü süfat ilə sən baqiyü cavidansan.

Bimislü bibədəlsən, bişibhü biməsəlsən,
Ey dürri-bərgüzidə, nə bəhri-bigiransan?

Ey künhü rif'ətindən bibəhrə əqli-mütləq,
Vey gənci-binəhayət, simurği-laməkansan.

Çünki cəmi'i-əşya səndən əyan olubdur,
Ey vahidi-yeganə, bəs nişə sən nihansan?

Ey müddəi, sən anın məhrumsan dəmindən,
Andandurur ki, hər dəm dərbəndi-inü ansan.

Həqq əzhəri-minəş-şəms rövşəndürür və lakin,
Sən qayəti-əmadən bihudə dər gümansan.

Dilər səni Nəsimi, aləmdə çaqə hər dəm,
Ta bilələr bətəhqiq sən qamudan əyansan.

Ey ruhi-qüdüs, canıma sən canü cahansan,
Məndən səni qaib deməzəm, üştə əyansan.

Mə’şuqə mana çün sən idin ruzi-əzəldə,
Ol gün nə idin, ta əbəd, ey fitnə, hamansan.

Zülfün qəmərin dövrünə yüz fitnə buraxdı,
Ey dövri-qəmər fitnəsi, fəttani-zamansan.

Hüsnün nə bilir qiymətini hər gözügörməz,
Sən aşiqə sor canı ki, cismində rəvansan.

Binamü nişan olmayanın səndə vücudu,
Fikr eyləməzəm anda ki, sən namü nişansan.

Can ilə təni yaxmaq əgər istər isən uş,
Gəl yandır anı, yanmağına gər nigaransan.

Verməz səni min cənnətü min hura Nəsimi,
Sən aşiqə həm cənnətü həm huri-cinansan.

Əvvəl ki, dila, dərd ilə yaran olamazsan,
Axır bil ani qabili-dərman olamazsan.

Mən xaceyi-dəhrəm deyü fəxr etmə, fəqir ol,
Dərviş olamazsan, yürü, sultan olamazsan.

Heydər kimi gər Xeybəri-şirki yıxamazsan,
Bu ərsədə bil, sən Şəhi-mərdan olamazsan.

Çün Turi-vücudunda təcəlli edəməzsən,
Fir'on ilə sən Musiyi-Imran olamazsan.

Gər quşlara tə'limi-zəban etməz olursan,
Bu ins ilə cins içrə Süleyman olamazsan.

Yə'qub olub axıtmaz isən xun cigərdən,
Misrə irişib, Yusifi-Kən'an olamazsan.

Can elmini bu hücrədə təhsil edəməzsən,
Adəm biki[1] bil, cisminə sən can olamazsan.

Səcdə etməz isən əhsəni-təqvimə görücək,
Həq fəzlivü həq surəti-rəhman olamazsan.

Ey sufi, təvaf etmə üzü həccinə yarın,
Ol eydə Nəsimi kimi qurban olamazsan.

---

[1] Kibi

Tərk eyləməz can eşqini, min gəz gər anı yaxasan,
Hicrində layiq görmə kim, hər dəm bu canı yaxasan.

Ey istəyən didarını, Musa kimi mə'şuqənin,
Vacib budur eşqində kim, canı, cahanı yaxasan.

Axırzamanın fitnəsi, bürqə camalından götür,
Ta eşqə üzərlik kimi pirü cavanı yaxasan.

Ey eşqə münkir müddəi, gir aşiqin tövhidinə,
Ta sərbəsər içindəki şirkü gümanı yaxasan.

Anəstünarın sirrini faş etdi şəm'indən üzün,
Ta nuruna pərvanətək kövnü məkanı yaxasan.

Ey qiyməti eşqin gühər, könlümdür onun mə'dəni,
Çün kan gərəkdir gövhərə, niçün bu kanı yaxasan?

Namü nişanü şöhrətin afətdir əhli-eşq üçün,
Var, ey könül, cəhd eylə kim, namü nişanı yaxasan.

Canıma eşqin odu çün kar eylədi, yaxdı tamam,
Şimdi gərəkdir, qaliba, bağrımda qanı yaxasan.

Ey axıdan dürdanəyi kirpiklərindən dəmbədəm,
Eşqin odundan qorxuram k'abi-rəvanı[1] yaxasan.

Ey lata tapan bibəsər, gəl gör bu mahın surətin,
Ta latü üzza başına deyri-muğanı yaxasan.

Çaxdı Nəsiminin dili Allahi-nurun sirrinə,
Ey nari-qüdsi, qandasan, ta ol zəbanı yaxasan.

---

[1] K'abi rəvanı - Ki abi-rəvanı, axar suyu.

Üzün müshəfdir, ey huri, yanağın qaf-vəl-Qur'an,
Budur həqdən gələn taha, budur yasinü ərrəhman!

Gün ilə ayı göglərdən gətirdi səcdəyə hüsnün,
Zəhi qüvvət, zəhi qüdrət, zəhi mö'cüz, zəhi bürhan!

Dodağın abi-heyvandır, mən anı sormuşam Xızra
Və lakin abi-heyvanı qaçan idrak edər heyvan?

Yedi gəz həq nə mə'nidən buyurdu səcdə şeytana,
Sən anı bil nə şeydənsən ki, anı bilmədi şeytan?

Qaşınla kirpigin, yarəb, nə fəttan yayü oxdur kim,
Fələkdir tirinə tərkəş, mələkdir yayına qurban?

Sən ol pakizə cövhərsən bu gün aləmdə, ey dilbər,
Dodağın abi-heyvandır, camalın rövzeyi-rizvan.

Səqahüm rəbbihüm xəmri ləbi-lə'lin şərabıdır,
Bu meydən məst olan bildi ki, həqdir mən əleyha fan.

Utanır arifin əqli, sana insan deməz, neçün
Ki, insandır deməz kimsə sana, ya xaliqül-insan!

Rüxün inna fətəhnadır, saçın vəlleyl-qəd-əfləh,
Bu lövhün əbcədin gör kim, qomuş həqq adını fürqan.

Həqə əyri baxan gözdən camalın yaşıran dilbər,
Götürdü pərdə üzündən gəl, ey zahid, gətir iman!

Təcəllinin çırağıdır camalın şəm'i, uş gör kim,
Necə nurü ziyasından münəvvər mehrü məh taban.

Bitibdir qisseyi-Şirin, tükəndi Şəkkərin dövrü,
Ləbin dövranıdır gəlgil ki, sənsən Xosrovi-dövran!

Nə dəryadır əcəb eşqin ki, yoxdur həddü payanı,
Zəhi eşqi nəhayətsiz, zəhi dəryayi-bipayan!

Nəsimi çün vüsalından həyati-sərmədi buldu,
Yəqindir gər desəm həqdir kim, oldu həyyü cavidan.

Mən ki, dərvişəm, fəqirəm, padişahi-aləməm,
Ruhi-birəngəm, əgərçi rəngə girdim, adəməm.

Şeş cəhətdən çar ənasirdir məni faş eyləyən,
Yoxsa mən gəncineyi-vəhdətdə nuri-əbhəməm.

Aləmül-qeybin süfatı məndən oldu aşikar,
Ey bəsirətsiz, məni gör kim, nə zati-ə’zəməm.

Söyləyən həqdir mənim dilimdə hərdəm, yoxsa mən,
Çar ənasirdən mürəkkəb bilisanü əbkəməm.

Ümmühat ilən nə var abaya olmasa xələl,
Aləmi təhqiqə baxsan cümləsindən əqdəməm.

Cənnəti-firdövs üçün bir ləhzə qəmgin olmazam,
Talibi-didari-yaram, şadimanam, xürrəməm.

Ey Nəsimi, çünki iş təqdir əlindən işlənir,
Fariğəm dünyadavü üqbada qəmdən, biqəməm.

Surəti-rəhmanı buldum, surəti-rəhman mənəm!
Ruhi-mütləq həq kəlamı qaf-vəl-Qur'an mənəm!

Həm mənəm anəstünarən sirrini faş eyləyən,
Həm Xəlil oldum, bu nara Musiyi-İmran mənəm!

Həm Məsihəm, həm Skəndər, həm mənəm abi-həyat,
Həm həyati-Xızr buldum, çeşmeyi-heyvan mənəm!

Həm mühitü həm kənaram, həm sədəf, dürdanəyəm,
Həm bu bəhrin gövhəri, həm gövhəri-ümman mənəm!

Həm xəyalam, həm camalam, həm süfatam, həm tələb,
Həm nüquşam, hə bu nəqşə valehü heyran mənəm.

Zülmətəm, mövtəm, məmatam, həm həyatam, həm məmat,
Mö'minə Nuham, nicatam, kafirə tufan mənəm!

Həm əlacam, həm təbibəm, həm kəlamam, həm Kəlim,
Həm bu rənc rəncuruyam, həm dərdlərə dərman mənəm!

Saqiyəm, şəm'əm, şərabam, həm xumaram, həm xəmir,
Səlsəbiləm, saqiyəm, həm sağərü peyman mənəm!

Həm səlatam, həm zəkatam, həm mənəm zərqü riya,
Həm mənəm imanü tövhid, şö'leyi-iman mənəm!

Həm nəiməm, həm rəhiməm, həm kəriməm, həm kərəm,
Həm nəimü xüldəmü həm cənnəti-rizvan mənəm!

Ey Nəsimi, sən həqi bil, həqqə iqrar eylə kim,
Çünki insanü bəşərsən, həq deyən insan mənəm!

Vəhdəhü laşərik ilə şübhəsiz iştə zatam,
Yə’ni kim, ibtidasız zatamü həm sifatam.

Yeddi dayə dörd ana doqquz atadan bərü
Həştü çəharü pəncəm uş yenə şeş cəhatam.

Qaynadı çün tənurum eşq ilə cuşa gəldi,
Gör bu tufan içində Nuhamü həm nicatam.

Gərçi türabü suyam mə’nidə, ey xəbisə,
Bil ki, iki cahanda təyyibü tahiratam.

Nurü nəharü leyləm, kəşfəm iki cahanda,
Qədrə irişdim iştə qədrəmü həm bəratam.

Əbcədəmü hecayam, hərfəmü sətri-katib,
Lövhəmü həm mürəkkəb, kilkəmü həm dəvatam.

Faili-mütləqəm mən, həqləyəmü həqəm mən,
Də’vidə ismi-məf’ul mə’nidə failatam.

Gərçi dəmi-Musayam nurilə nar içində,
Həm bir ölü dirildən Isayi-mö’cüzatam.

Ərşü günəşü fərşü ərzü səmadan bərü
Eşqilə layəmutəm, əqlilə həm həyatam.

Gör ki, məni nə bəhrəm qətreyi-eşq içində,
Dəcləvü Şəttü Ceyhun, həm Ərəsü Fəratam,

Həqdən enən kəlamam, yəni ki, lamü beydən
Elmü kitabü hərfəm, ayatü bəyyinatam.

Qibləyəm, həm imamam, Kə'bəyəm, ey səfasız,
Sövməmü həm səlatam, eydəmü həm zəkatam.

Müşrik olub bu gunə baxma gəl, ey yəqinsiz,
Ayəti-fəthi-babam, sureyi-mürsəlatam.

Nəsimiyəm ki, hər şey, külli-mühit oldum,
Həm bilənə həll oldum, bilməzə müşkilatam.

Küntə kənzin sirrini izhar edər madam dəm,
Kim degil ol adəmi kim, yoxdur anda dam dəm.

Nəfxeyi-İsa dəmi dəmdir, dirildir adəmi,
İstər isən ol dəmi, al dünyasından kam kəm.

Kim ki, mir'atın müsəffa qıldı ol didariçin,
Liməallahın rümuzun qıldı istifham həm.

Aşiqə meyxanə küncündən gəlir ilhamü vəcd,
Sufiyə məscid qucağından gəlir peyğami-qəm.

Nəhnü zərrəqna günündə qismət olmuş hər kimə,
Zahidə səccadəvü təsbih, rində cami-Cəm.

Ey Nəsimi, qılma də'vət zahidi sən eşqə kim,
Bu məsəl rövşəndürür kim, olmaz imiş xam xəm.

Qulluğa bel bağladım, sultanı gözlər gözlərim,
Dərdinə tuş olmuşam, dərmanı gözlər gözlərim.

Gözlərim gözləri gözlər həzrətini şahımın,
Necəsi gözləməsin, sübhanı gözlər gözlərim.

Gördügüm ol, bildigim ol, istəgim həm oldurur,
Əvvəl oldur, axır oldur, anı gözlər gözlərim.

Mən də şahın yoluna canımı qurban etmişəm,
Eşq ilə girdim yola, meydanı gözlər gözlərim.

Cür'eyi-eşqin dilər ki, könlümə mehman ola,
Xidmətə bel bağladım, mehmanı gözlər gözlərim.

Gecələr yahu deyib hər dəm təmənna eylərəm,
Rəhmətindən umaram, rəhmanı gözlər gözlərim.

Ey Nəsimi, sidq ilə yolunda xak olmaq üçün
Can elindən gəlmişəm, cananı gözlər gözlərim.

Fəzlim mənim, ey Xızrımü ey abi-həyatım,
Şəmsim mənim, ey bədrimü saçı zülümatım.

Sərvim, çəmənim, bağі-bahar ilə həzarım,
Tutim, şəkərim, şəhdimü qənd ilə nabatım.

Ruzim, şəbimü ayü ilim, həftəvü günüm,
Novruzumü eydim, diləyim, qədrü bəratım.

Qur'anımü hökmüm, hədisim, şərhi-bəyanım,
Elmim, əməlim, zikrimü sövm ilə səlatım.

İslamımü həm küfrümü imanımü dinim,
Şanım, şərəfim, şərhi-həbibim, sələvatım.

Təqvam ilə zöhdüm, ədəbim, elmilə helmim,
Təlqinimü tövbəm, tələbim, həccü zəkatım.

Həşr ilə hesabım, yenə mizanü siratım,
Ehsanımü lütfüm, kərəmim, həm həsənatım.

Hənnan ilə mənnanımü, ey Mərvə səfalım,
Həm zəmzəm ilə qibləmü Kə'bəm, ərəfatım.

Mə'budumü məqsudumü mətlubumü qəsdim,
Zahirimü batinimü zat ilə sifatım.

Həm mərkəz ilə kövkəbü bürc ilə mədarım,
Səyyarəmü çərxim, fələkim, seyri-səbatım,

Filcümlə, bu nitq ilət kəlamın, ey Nəsimi,
Afaqımü ənfusümü ərkanü cəhatım.

Surətinin səfhəsində gör nə yazmış ol qədim,
Oxudum ol xətti bismillahir-rəhmanir-rəhim.

Alnına əlhəmdülillah yazdı rəbbülaləmin,
Qoydu eşqin yoliçün haza siratül-müstəqim.

Surətin mahiyyətin təfsir edər inna-fətəh,
Hüsnünün keyfiyyətidir bəs əla-xülqil-əzim.

Qaşlarındır qabü qövseynü saçın leyli-təvil,
Rəsmdir vəş-şəms üzrə şol mübarək zülfi-cim.

Dedilər ol mimə fi-eynən-tüsəmma səlsəbil,
Şimdi kövsər lə'lin oldu küllə cənnatün-nəim.

Zülfünə seyr eylədi badi-səba vəqti-səhər,
Şol səbəbdən doldu aləm, əzrüxət ənbər-şəmim.

Qıl Nəsimiyə tərəhhüm, ey üzü bədri-münir,
Gər xəta qıldım isə əstəğfürullahil-əzim.

Nə hüsn olur, bu nə surət, zəhi behişti-nəim?
Nə lütf olur, bu nə mə'ni, zi rəbbi-ərşi-əzim?

Könül səba nəfəsindən dirildi, can buldu,
Qara saçın qoxusundan nə bu gətirdi nəsim.

Nəsimi-zülfünə baş ilə can nisar edərəm,
Nə simü zər kimi layiqdir ol nəsimə nəsim.

Görün bu çeşmeyi-heyvanləbi ki, şə'nində
Gəlibdir ayəti-yöhyülizamü vəhyi-rəmim.

Müsəlləm oldu sənə dilbəri cahanda bu gün
Kim, ay ilə günəş oldu camalına təslim.

Əzəldə var idi eşqin bu can içində mənim,
Zavala olmaya qabil binayi-əhdi-qədim.

Gərəksə cövr ilə öldür, gərək məni yandır,
Nə qayğu oddan ana kim, əti bəqəlbi-səlim.

Müəttər eylədi zülfün şəmimi afaqı,
Və laəcibə minəl-ətri an yəfuhə şəmim.

Yolunda qoydu Nəsimi cahan ilə canı,
Təfavüt etməz anı gər qəbul qılsa kərim.

Ay camalın hüsni-surət kim, qılıbdır ol həkim,
Faili-mütləqdürür hər şeydə məf'ul ol rəhim.

Saçların zilli düşəldən ruyi-bədrin tabına
Kim tilu' etdi cahana şəmsi-tabani-müqim.

Həm həqin sən məzhərisən la şərikü bigüman,
Səndədir nuri-təcəlli ərşü kürsi həm nəsim.

Üzünə səb'ül-məsani gər oxursam, la demə
Kim, qaşınla kirpigin zülfündən oldu bu rəsim.

Səcdə qılmazmı belə gör sidrəvü tuba tamam
Kim, məlaik qamusu aydır sücudini əzim.

Nitqiyəm şirin ləbinin, Isiyi-cana həyat,
Çün Məsiha istər isən, iştə gəldi dər rəmim.

Xızr çün bulmuş həyatı zülmətindən ta əbəd
Kim, ləbin eynidürür şol zülmət içrə dalü mim.

Yazma hərfin adını, ey öz-özündən bixəbər,
Çün ləbindən zahir oldu bu kəlam ilə Kəlim.

İstiva sirrini gər bildin isə eynəl-yəqin,
Xətti-vəchində şikaf oldu sirati-müstəqim.

Uş bu dünya fanidir, keç sən fənadan, bul bəqa
Kim, həyati-cavidan olsa sana ömri-səlim.

Ey Nəsimi, gər nəhayət bildin isə nüktə sən,
Bistü həştü sivü dü vəchində yazıldı müqim.

Əlminnətilillah ki, bu gün yarımı buldum,
Könlümdə duran dilbərü dildarımı buldum.

Dəgməz mana bir pula cahan varlığı ilə,
Neçün ki, gözəl sikkəli dinarımı buldum.

Torpaq ikən ol Zöhrə mana Müştəri oldu,
Dəllala çağırgil de ki, bazarımı buldum.

Firdövsə məni də'vət edən zahidə söylə,
Ol tikənə göz dikmə ki, gülzarımı buldum.

Yusif yeridir kim, mana qul yazıla, çünkim,
Misrində ləbi tüngi-şəkərbarımı buldum.

Faş eyləməzəm razımı naməhrəmə, çünkim,
Məhbubi-əmin, məhrəmi-əsrarımı buldum.

Bəxtim günəşi doğduvü uyxudan oyandı,
Mə'nisi bu kim, dövləti-bidarımı buldum.

Bağdada gəl, ey qasid, ilət şol xəbəri kim,
Şol şö'bədəçi dilbəri-əyyarımı buldum.

Ey nəqdini tərrara verən uyxulu qafil,
Şol üzüqəmər türreyi-tərrarımı buldum.

Mənsur kimi məndən əgər çıxdı ənəlhəq,
Ey xacə, itab eyləmə kim, darımı buldum.

Gər Musa kimi aşiq isən üzünə anın,
Gör səndə səni, söylə ki, didarımı buldum.

Verdi saçının küfrünə imanı Nəsimi,
Ey xirqə geyən, mən dəxi zünnarımı buldum.

Dilbərin ləblərinə çeşmeyi-heyvan demişəm,
Mə’dəni-ruha, əcəb, mən nə üçün can demişəm?

Xəcil oldum bu səbəbdən ki, nigarın üzünə
İrəmin gülşəniyü rövzeyi-rizvan demişəm.

Sənsən, ey surəti-Allah ilə rəhman, məscud,
Qılmayan səcdə sana, div ilə şeytan demişəm.

Lövhi-məhfüz ilə ərş oldu yanağın sifəti,
Mən bu mə’nidən ana surəti-rəhman demişəm.

Sürətin əhsəni-təqvimü üzün qiblə imiş,
Bu sözə yox deyənin adını heyvan demişəm.

Surətin münkirinə kafirü məl’un dedi həq,
Nə ki, ana dedi həq, mən iki çəndan demişəm.

Güli-xəndan deməzəm qönçəyə ayrux, nə üçün
Ki, yanağın güli-xəndanına xəndan demişəm.

Sədəfin içinə kar eylədi, incu əridi
Ki, ləbin cövhərinə lə’li-bədəxşan demişəm.

Demə hər tikənə sən bağü gülüstan, əbsəm
Ki, mən ol arizi-gülguna gülüstan demişəm.

Zülfünü nafeyi-tatara bəha qılma ki, mən
Qiymətin hər qılının mülki-Süleyman demişəm.

Ey Nəsimi, sana çün Fəzli-ilah oldu müin,
Məni eyb eyləmə kim, tapuna sultan demişəm.

Mən ol Musayi-İmranam ki, daim aşiqi-Turam,
Və leykin xeyli müddətdir cənabından ki, məhcuram.

Riyayi-zöhdü təqvadan kəsildim çün bəqa buldum,
Sözüm sirri-ənəlhəqdir, fəna darında Mənsuram.

Bu gün meyxanədə düşməz təmənnayi-şərab etmək,
Məni saqi içiribdir, əzəldən məstü məxmuram.

Dəxi əksüklügüm yoxdur, şikayət etməzəm, billah,
Həbibin asitanından budur eybim ki, mən duram.

Mənim korlar görə bilməz məqamım qansı aləmdir,
Əgər viranədir könlüm, bəğayət gəncə mə’muram.

Qəmimdən ağlaram hər şəb, dəmadəm xun olur çeşmim,
Nəsimiyəm ki, şövqündən iki aləmdə məhcuram.

Gəl, ey əgri, məni gör kim cahanın padişahıyam,
Üzümə doğru bax, doğru fələkin şəmsü mahıyam.

Hümayun zilliyəm bişək, cahan sayəmdədir üştə,
Mən ol dövlətli sadiqəm, səadətin külahıyam.

Süleymanam mən, ey arif ki, xatəm məndədir, məndə,
Mən anın hökmünə təslim, Süleyman mürğü mahıyam.

Neçə qalmışlara yaram, neçələrə həm əğyaram,
Nə yerdə istəsən varam, qamu aləm pənahıyam.

Şəriətəm, divanam mən, gah aşkara nihanam mən,
Həm ol müddəi də’vası, həm onun mən günahıyam.

Nəsimi, sən demə cüzvi deyilsən mim ilə nun, sin,
Vəli oldur deyən daim qamu aləm ilahıyam.

Ol Kə'beyi-mə'na mənəm kim, qibleyi-rəhmanıyam,
Ol nitqü rəbbani mənəm ki, höccəti-bürhanıyam.

Çün on səkiz min aləmin cudü vücudu xud mənəm,
Cümlə cahan təndir mana, mən bu cahanın canıyam.

Ol qabü-qövseynə irən, ol surəti ziba görən,
Həm surəti-ziba mənəm, həm surəti-yəzdanıyam.

Sən bu sərayi-fanidə istər isən eyni-bəqa,
Nəfsini əvvəl tanı kim, həqqi derisən tanııyam.

Ol küntə kənzi derisən, aləmdə rövşən gün kimi,
Ol gövhərə rövşən mənəm, bil ki, mən onun kanıyam.

Ol şəkkəri-lə'li-ləbin, ol tutiyi-məsti mənəm,
Ol cənnəti-qüdsün bu gün mən bülbüli-xoşxanıyam.

Götür vücudun zülmətin, eyvani-nura vasil ol
Kim, şə'ninin nuri mənəm, mən nurinin eyvanıyam.

Ariflərə hadi mənəm, çünki hidayət nuruyam,
Sevdasıyam, sevdasının məşhuruyam, heyranıyam.

Mən ol Nəsimiyəm bu gün abi-həyatım içənə
Xızrın bəqa ömrü mənəm kim, çeşmeyi-heyvanıyam.

Cana, rüxi-zülfündən əgər qılsa təəmmül,
Təhqiq ilə isbat edədir dövri-təsəlsül.

Ey saqi, çü saf oldu şərabi-xümi-vəhdət,
Gəl səcdəyə fəxr eyləmə çox, qılma təəllül.

Gər nəfsini bildin, həqi bişübhə tanırsan,
Kim kəndözünü tanıdı ol sahibi-Düldül.

Məhbub səninlədirü sən qafil özündən,
Bilmən ki, nədəndir sənə bu dəglu təğafül.

Ta eşqi-dilaram alıbdır məni məndən,
Könlümdə nə aram qalıbdır, nə təhəmmül.

Güdgün üzünü görməgə bülbül kimi zaram,
Mən bülbüləm, ey dust, həqiqətdəvü sən gül.

Məclisdə çü saqi kimi, ey dust, Nəsimi
Dərhal sücud etdi, sürahi dedi qülqül.

Nə sidrədir ki, boyundan qiyamət oldu faş,
Görün qiyam ilə, qəddin bu sidrənin şabaş.

Zəhi, türab ilə əqd eyləyən yel ilə odu,
Zəhi, su üstünə yazan bu surəti nəqqaş.

Kimin ki, eşq ilə başı əzəldən olmadı xoş,
Xoş olmasın iki aləmdə ol bəqasız baş.

Kimin ki, eşqi-həqiqətdən olmadı canı,
Sən adəmi demə ana, anın adıdır daş.

Sücuda gəlmədi illa bu mə'nidən şeytan
Ki, ta fəqihi, xətabın ilə ola dindaş.

Murada irmiyəsər kimsə həqsiz, ey qafil,
Gərəksə şahi-cahan ol, gərəksə ol övbaş.

Kimin ki, oldu nəsibi əzəldə həqdən eşq,
Ana nə şərbətü mə'cun gərək, nə əppəkü aş.

Fəraşü məfrəşə fəxr etmə, aşiq ol, aşiq
Ki, aşiqin eşigində mələkdürür fərraş.

Qaçan tutuş olusər axirətdə ol həqqə
Kim, olmadı bu cahanda anın ilə tutaş.

Qələndərin sifətidir fəna ilə təcrid,
Qələndər ol, ikilikdən mücərrədü qəllaş.

Şərabü şahidü sufi qaçan hərif olusər,
Bu rəsmə ala boyanmış, bu alı çox qulmaş.

Üzündür, ey sənəm, ol müshəfi-ilahi kim,
Bilindi xətti-siyahında həm quru ilə yaş.

Nəsiminin sözü çün kim, bahalı gövhərdir,
Bu rəsmilən nə üçündür ki, satır anı bəlaş.

Yarını satdın bahasız, bilmədin miqdarını,
Heçə dəgməz şol kişi kim, heçə satar yarını.

Cövhəri nadan əlindən müştəri alur ucuz,
Cövhəri bilməz nə bilsin gövhərin miqdarını.

Kim ki, yarından bəqasız canını gördü əziz,
Yarını itürdi nadan, bulmadı dildarını.

Aşiqin əsrarını aşiq gərəkdir kim bilə,
Olmayan aşiq nə bilsin aşiqin əsrarını?

Kim ki, qurban olmadı yolunda şol mə'şuqənin,
Çin degil də'vası anın, heçə say iqrarını.

Neyləsin yarın cəfasın çəkməyən aşiq müdam,
Çünki yar istər həmişə aşiqin azarını.

Dara çıx, yan, ey ənəlhəq söyləyən Mənsur, əgər
Axirət darından istərsən səlamət darını.

Kim ki, yarın zülfün əldən qodu yüz min can ilə,
Bibəsər torpağa saldı nafeyi-tatarını.

Ey Nəsimi, incuyi dürrü bilən sərrafa sat,
Cövhəri nadana satma lö'löi-şəhvarını.

İki aləmdəsən sultani-mütləq,
Fətəhna şə’ninə gəldi mühəqqəq.

Camalın vəzzüha, vəlleyl zülfün,
Sənin vəsfindürür ayati-müğləq.

Sənin zikrin oxurlar hər səhərgah
Təzərvü bülbülü qumru mütəbbəq.

Sana taha vü yasin oldu münzəl,
Qəmər oldu camalından müşəqqəq.

Sənin eşqin məni məndən alıbdır,
Salıbdır bəhrinə manəndi-zövrəq.

Bəqa oldum, fənadan fani oldum,
Bəqadan içmişəm cami-mürəvvəq.

Əzəldən içmişəm cami-səqahüm,
Anınçün söylərəm hər dəm ənəlhəq.

Olur hər gündə hey hər kim olubdur
Sənin vəsfindürür ayati müğləq.

Nəsimiyə əzəldən cür’ə sundun,
Anınçün zülhəyat oldu mühəqqəq.

Bahar oldu vü açıldı üzündən pərdə gülzarın,
İrişdi qönçənin dövrü, zamanı qalmadı xarın.

Gülüstan Turi-qüds oldu baharın nurü narından,
Gəl, ey Musa, gör asarın çəməndə nur ilə narın.

Çiçəklər müxtəlif əlvan, nə mə’nidir, anı bil ki,
Boyası bir imiş çün kim, bu ənvarın, bu əzharın.

Əbirindən çəmən, gör kim, nə teyb afaqa göndərmiş
Kim, olmuş buyü ətrindən məşamı tazə əttarın.

Nə ənbərdir tütən, yarəb, şəqayiq məcmərindən kim,
Ki, buyundan anın qədri sınıqmış mişki-tatarın.

Gəl, ey siminbədən saqi, mənə sun cami-səhbayı
Ki, gəldi rövnəqi-güldən meyi-gülrəngi xummarın.

Əgərçi sünbülü nərgis bəyani-kuntə kənz eylər,
Qaçan bəlhüməzəl bilsin işaratın bu əsrarın.

Bu gün gər aləmil-qeybin vücudun görmək istərsən,
Rəyahin uş bəyan eylər zühurun çərxi-səyyarın.

Bu musiqidən, ey same’, sana gər nəsnə kəşf oldu,
Məqamatın bəyan eylə, üsulun göstər ədvarın.

Əgər susənləyin əbkəm deyilsə nitqə gəl, söylə
Ki, hərfü nöqtə tərkibi nə yerdəndir bu göftarın.

Bu gün gər aləmül-qeybin nişanın görmək istərsən,
Rəyahin uş bəyan eylər zühuri çərxi-səyyarın.

Cahan cənnati-ədn olmuş, çəmən səhnində hurilər,
Bəzənmiş hüllədən bustan, açılmış gözü əşcarın.

Bu gün bazar edər gülşən səməndən laləvü güldən,
Qənimət gör ki, beş gündür tamaşası bu bazarın

Nəsiminin sözü gərçi dəmi-Isadır, ey münkir,
Sənə kar eyləməz niçün ki, yoxdur həqqə iqrarın.

İtirdin cami-Cəmşidi, oyan uyxudan, ey qafil,
Nə buldun uyxudan göstər, nə qıldın uyxudan hasil?

Məgər həqdən ziyan gördün ki, batil qövlə yapışdın,
Çevirdin üzünü həqdən, saqın kim, həq degil batil.

Əzazilin sözün dutma, anın vəsfasına uyma
Ki, iblisə uyan olmaz könül məqsuduna vasil.

Vəfasız dünyanın mehrin gedir könlündən, aldanma
Ki, dünya əhlinə hərgiz müti' olmaz dedim uş bil.

Bu taqü təmtəraqı qo ki, dövranı bu dünyanın
Keçər hər növ ilə dutsan, gərək asan, gərək müşkil.

Yalançı nəfsə uymuşsan, qucarsan dünyayı neyçün?
Məgər həqqi unutmuşsan ki, oldun dünyaya mail?

Məsihi-zat ikən, billah, nədən div olmaq istərsən?
Məgər cinnidürür əslin, deyilsən rəhmətə qabil?

Sədəf xas olmaz incusuz, bu rəmzi anla, fəhm eylə,
Bu sirri bilməyən bil kim, nə xaric oldu, nə daxil.

Bu göftarın işaratı dərindir, əql ana irməz,
Nə bilsin olmayan Məcnun ki, Leyli kimdir, ey aqil?

Neçə məf'ulü-faildən, neçə məs'ulü saildən,
Əgər danasan, anı bil ki, sənsən mütləqa fail.

Əgər gözlüsən, ey gizlü, vücudun şəhrinə gir gör
Nə mə'dənsən, nə gövhərsən, nə dəryasan, nə xoş sahil!

Vücudun şirkini məhv et, vücudi-vahidə fərd ol
Ki, zati-fərd vahiddən bu məsəl oldu, ol sail.

Nə axır sənsən ol gövhər kim, adın gizli gənc oldu,
Nədir halın kim, olmazsan özündən vaqif, ey zail!?

Hava camından əsrüksən, həvəs ardına düşmüşsən,
Bu ağulu şərabı qo kim, oldur şərbəti-qatil.

Nəsimi sirri-ma övha kəmahün gərçi şərh eylər,
Qaçan idrak edər anı özünü bilməyən cahil!?

Töhfəyəm, pakizə cövhər, laməkanın xasıyam,
Aləmül-qeybəm, vücudam, həm anın dəryasıyam.

Həm kəlamam, ayətəm, həm müshəfəm, səb'ülməsan,
Həm mənəm tövhidi-bürhan, pirimin mövlasıyam.

Cəbrəiləm, həm Mikail, Israfiləm, Əzrail,
Nazirəm, hər yerdə hazir, mən həqin kimyasiyəm.

Dəcləyəm, Niləm, Fəratam, həm mənəm abi-həyat,
Kövsərəm, mai-təhuram, səlsəbilin tasıyam.

Dəngizəm, bəhrəm, mühitəm, qətrəyəm, dəryayi-eşq,
Laməkan bünyadıyam, həm bəhrinin qəvvasıyam.

Musiyəm, Turam, əsayam, həm münacati-ilah,
Həm mənəm ruzi-həqiqət, Musinin beyzasıyam.

Tərsayam, həm qeyri millət əhliyəm, nəsraniyəm,
Həm mənəm zünnarü xaçü həm səlib cübrasıyam.

Davudam, xətmi-Süleyman, məndədir məcmui-zat,
Həm mənəm mehri-xudavənd, divlərin ustasıyam.

Həm Həməl, həm Qövsü Cövza, həm Əsəd Mərrix ilə,
Həm Sərətan, Sünbülə, həm Dəlvinin həmpasıyam.

Həm mənəm mizan, həşrin suruyam sər ta qədəm,
Həm siratül-müstəqimin şiveyi-əşyasıyam.

Məscidəm, həm mədrəsə, bütxanəvü meyxanəyəm,
Həm bu beytin əhliyəm, həm şəhrinin əsasıyam.

Qəmərəm, şəm'i-münəvvər, atəşəm, həm badü gil,
Həm havayam, dörd təbiət, atamın babasıyam.

Mən Nəsimiyəm ki, həqqin dinivü imanıyam,
Həm imami-məzhəbəm, həm dininin yəğmasıyam.

Küntə-kənzin kənzivü, Allahi-nurun nuruyam,
Rövzənin rizvanıvü, cənnati-ədnin huruyam.

Kafü nunun məbdəi', həm kainatın mənşəi,
Laməkanın şəmsivü bədrü şəbi-deycuruyam.

Aləmü zatü sifatam, mənbəi-mövtü həyat,
Həm həsari-kün fəkanam, həm anın məhsuruyam.

Söyləyən hər natiqin dilində məndən özgə yox,
Səqfi mər'fuin əsası, beytinin mə'muruyam.

Nitq ilə sövtəm, əzəldən ta əbəd həm qüvvətəm,
Hazıram hər yerdə, həm hazırların məhzuruyam.

Nuh ilə tufan mənəm mən, həm nicatam, həm həlak,
Həm yeməm, həm gövhərəm, həm ol yemin məbhuruyam.

Nazirəm, həm binəzirəm, həm bəsirəm, həm bəsər,
Həm ikilikdən münəzzeh, vəhdətin mənzuruyam.

Həm fəqirəm, həm dilənçi, həm məlik, həm padşah,
Həm mənəm ustadi-sənət, həm anın muzduruyam.

Şahidəm, şəm'əm, şərabam, saqiyəm, həm cami-Cəm,
Kövsərəm, həm səlsəbiləm, həm meyin ənguruyam.

Zahirəm, zahirdə faşam, məzhərəm, həm müzhərəm,
Batinəm hər şeydə, yə'ni batinin məsturuyam.

Həm bəqa darül-xüludun nazıyam, həm ne'məti,
Həm fəna darül-qürurun darıyam, Mənsuruyam.

Həm kəlamam, həm mələk, həm vəhy, həm ruhül-qüdüs,
Həm hesabın saəti, həm yövmi-həşrin suruyam.
İbtidasız cövhərəm qaim bənəfsi labəğeyr,
Həm nəimi-xalidəm, həm ne'mətin məşkuruyam.

Həm cəmiləm, həm camalam, həm vədudam, həm ədəd,
Kafirə mövtü müsibət, həm Xəlilin suruyam.

Həm mənəm Vadiyi-əqdəs, həm mənəm narü şəcər,
Həm mənəm nuri-təcəlla, həm Kəlimin Turuyam.

Həm cahanam, həm cahanın eynivü mahiyyəti,
Həm Xətavü Çinü Rumun qeysərü fəğfurüyam.

Lövhü Tövratü Zəbur, Incilü Fürqan, həm sühəf,
Həm kəlami-natiqəm, həm rəqqinin mənşuruyam.

Həm bəratü qədrü əsra, həm siyamü həccü eyd,
Həm mühərrəm, həm mühərrəm şəhrinin aşuruyam.

Həm uran ol nəfxeyi, həm ruhi-adəm, həm türab,
Həm qiyamət suruyam, həm məhşərin məhşuruyam.

Həm Süleymanam, həm anın mülkəti-layənbəği,
Həm Süleymanın quşu, həm Xatəmin dəsturuyam.

Katibəm, kilkəm, dəvatam, əbcədəm, lövhəm, heca,
Nöqtəyəm, hərfəm, bu hərfin sətriyəm, məsturuyam.

Həm ənasir, həm təbaye, həm mürəkkəb, həm bəsit,
Cümlənin əslivü fər'i, qadirin məqduruyam.

Həm rəbiəm, həm xərifəm, həm mənəm seyfü şita,
Həm qışın məbrudu oldum, həm yayın məhruruyam.

Buğdayam, həm asiyabam, həm xəmirü həm fətir,
Səlsəbilin xəmriyəm, xummariyəm, məxmuruyam.

Həm səvadi-ə'zəməm, həm Misri came', həm mühit.
Həm bu bəhrin gövhəri, həm lö'löi-mənşuruyam.

Həm mənəm məqsudü məqsəd, həm təmənna, həm dilək,
Həm mənəm hər işdə zakir, həm anın məzkuruyam.

Həm mənəm hadivü nafe, həm mənəm zarü müzürr,
Həm mənəm qüfranü rəhmət, həm anın məğruruyam.

Həm təbibəm, həm əliləm, həm əlacam, həm səqim,
Həm şəfanın səhhəti, həm ne'mətin rəncuruyam.

Həm hürufam, həm kitabam, həm kəlamam, həm Kəlim,
Fəthənin mənsubuyam, həm kəsrənin məcruruyam.

Hə cəbəl, həm kəhf, həm Əshabi-kəhfəm kəlb ilə,
Həm Qafrın simurğuyam, həm quşların əsfuruyam.

Ey Nəsimi, sən degilsən, cümlə oldur, cümlə ol,
Ol kim, aydır bu zəminü asimanın nuruyaım.

Ayəti-inni-ənəllaham, bu narın nuruyam,
Həm münacatü təcəlli, həm Kəlimin Turuyam.

Əvvəlim nun vəl-qələmdir, axırım mayəstərun,
Sureyi-mərfuəm, bu bəhrin nükteyi-məcruruyam.

Misrəmü həm came'əm, həm cüm'əyəm, həm adinə,
Ruhi-qüdsün nəfxəsi, həm beytinin mə'muruyam.

Həm imamam, həm hidayət, məhdi həm məhdiyyəti,
Həm kitabi-vəhyi-münzil, həm riqin mənşuruyam.

Həm həzizəm, həm ürucam, həm qərinəm, həm büruc,
Gərdişi-çərxü mədaram, şəhrinin məşhuruyam.

Laməkan xurşidiyəm, həm Sə'di-Əkbərdir adım,
Nəhsü kənzü təl'əti-bədri-şəbi-deycuruyam.

Kaf ilə nun məbdəimdir, mənşəimdir kainat,
Uşbu kövnün küntə kənzi, kənzinin məğruruyam.

Həm mürəkkəb, həm bəsitü həm cəvahir, həm ərəz,
Münfəsil, həm müttəsil, həm zakirin məzkuruyam.

Cənnətəm, həm tubiyəm, tuba ləhüm hüsnəl-məab,
Şahidəm, şahənşəhin həm şahidi, məsturuyam.

Zahirü batin mənəm, peydavü həm pünhan mənəm,
Məzhərəm, həm müzhərəm, həm məzhərin məzhuruyam.

Saqiyəm, həm sağərəm, həm səlsəbilü həm səbil,
Məndədir həm hurü qılman, həm anın məqsuruyam.

Həm mənəm bəzmi-əzəl, həm məndədir cami-ələst,
Həm şərabi-kövsərəm, həm xəmrinin məxmuruyam.

Həm munadiyü nidayam, həm ətufam, həm rəuf,
Həm qulam, həm qulların rəzzaqiyü qəyyuruyam.

Həm mənəm meyxanəvü künci-xərabati-əzəl,
Həm şərabam, həm anın peymanəvü ənguruyam.

Həm Xətayam, həm Xütən, həm nafəsi tatarının,
Çinü Maçinü Moğolçin, həm gözəl fəğfuruyam.

Mülki-Iran, Mülki-Turan, Mülki-Hindü Mülki-Sind
Mülki-Şamam, Mülki-qeysər, Rumiyəm, Ənkuriyəm.

Həm mənəm Bağdad ilə Şətt, həm xəlifə, həm zaman,
Həm ənəlhəq söylərəm, həm dar, həm Mənsuruyam.

Ne'mətəm, həm layəzalam, növ-növü lövün-lövün,
Qismiyəm, qəssamiyam, həm şakirin məşkuruyam.

Rövzənin rizvanıyam, cənnati-ədn oldu adım,
Həm xəyamü dəxi məqsurat içində huriyəm.

Həm hüveylayam, müqəddəs, cümlə ləzzət məndədir,
Həm mənəm balü şəkər, həm nəhlü həm zənburuyam.

Altı avaz, on iki pərdə yigirmi dörd şüəb,
Həm rübabüərğənunam, çəng ilə tənburuyam.

Asimanam, həm zəminəm, həm bulutü həm buxar,
Əbri-neysanam, yəməm, həm lö'löi-mənşuruyam.

Aləmi-kübravü suğra, həm vəzi'ü həm şərif,
Aləməm, həm xəlqiyəm, qəmmariyəm, məsruruyam.

Həm mənəm Bilqeysi-dövran, insü cinnü vəhşü teyr,
Həm Süleymani-zamanam, həm anın dəsturuyam.

Həm Xəliləm, həm nicatam, həm həyatam, həm məmat,
Məqbərəyəm, həm əzabam, həm hesabam, suruyam.

Sən degilsən söyləyən, həqdir Nəsimi, söylədi,
Ol kim aydır həm zəminü asimanın nuruyam.

Həq ta ki, yar oldu mənə, sər ta qədəm yar olmuşam,
Ta görmüşəm didarını, müştaqi-didar olmuşam.

Anəstünarən sirrini Musa nə bilsin, ya şəcər,
Anı mana sorsun ki, mən ol nur ilə nar olmuşam.

Zikrim ənəlhəqdir mənim, həq sözlərim həqdir mənim,
Darın içində qeyrəna həm leysə-fiddar olmuşam.

Arif qatında mədhü zəmm bir əsl imiş, sən arif ol,
Gör kim, necə hər natiqin dilində göftar olmuşam.

Mail-ənəbdəndir əgər hər sərxoşun sərxoşluğu,
Mən içmişəm eşqin meyin, sərməstü xumar olmuşam.

Xüldün güli-xəndanıdır gülgün yanağın, ey günəş,
Bülbül kimi məstəm, anın eşqindən uş zar omluşam.

Gülşən kimi açılmışam buyi-gülündən arizin,
Gör kim, camalından necə fərxəndə gülzar olmuşam.

Mişkin saçından bulmuşam şol buyi-canəfzayı kim,
Teybindən anın sanasan teyyibü əttar olmuşam.

Şirin dodağın vəsfini ta söylər oldu məntiqim,
Ey Misri-hüsnün Yusifi, qəndü şəkərbar olmuşam.

Yarəb, nə fəttan ay imiş tabəndə üzün bədri kim,
Ənvari-tabından anın ta bəndə ənvar olmuşam.

Sevda meyindən sərxoşam məstanə eynintək, vəli,
Qəflət meyindən taibəm, niçün ki, huşyar olmuşam.

Zülfü rüxün əsrarını ta həq mana kəşf eylədi,
Üzündəyəm gənci-xəfi, zülfündə bərdar olmuşam.

Sərvi-güləndamın kimi aləmdə azadam, vəli
Zənciri-zülfin qeydinə möhkəm giriftar olmuşam.

Lö'löi-nabın vəsfini ta söylər oldu məntiqim,
Səm'ində hər siminbərin lö'löi-şəhvar olmuşam.

Buldu Nəsimi ta səni zatında, şəksiz-şübhəsiz,
Olmuş Nəsimidən bəri, yə'ni ki, bizar olmuşam.

Gəlmişəm həqdən ənəlhəq, gör nə Mənsur olmuşam,
Ruhi-qüdsün nitqiyəm, sər ta qədəm nur olmuşam.

Lövhi-məhfuzu mənəm, ruhül-əminin həmdəmi,
Həşr üçün mizanü Israfilü həm sur olmuşam.

Bavücudam vəhdəti kəsrətdə isbat eyləyim,
Musayam anəstünara, nur ilə Tur olmuşam.

Gərçi qaibdir vücudum hər nəzərdən daima,
Gör nə nazir, gör nə mənzər, gör nə mənzur olmuşam.

Laməkanın gənciyəm, gərçi yerim viranədir,
Eylərəm mə’mur anı, gör kim, nə mə’mur olmuşam.

Surətü mə’ni mənəm, həm ism ilə, həm cismü can,
Gör necə mə’ni ilən surətdə məstur olmuşam.

Şöhrət afətdir, usandım şöhrətindən aləmin,
Gərçi həm ə’ladavü əfsəldə məşhur olmuşam.

Atəşi-mehri-rüxün canımda tə’sir eylədi,
Mən bu oddan yanıram, yə’ni ki, məhrur olmuşam.

Misr came’dir vücudum, anda qıldım cüm’əyi,
Gör nə şəhrəm, gör nə möhkəm qəl’əvü sur olmuşam.

Zakirəm, zikr eylərəm, yə’ni ki, şeyxəm, sufiyəm,
Gör nə göyçək ad ilə aləmdə məzkur olmuşam.

Ey Nəsimi, cənnətü hur ol nigarın vəslidir,
Çün mən ol məhbubu buldum, cənnətü hur olmuşam.

Gəl gör məni eşqində kim, mən necə giryan olmuşam,
Tərk cahanı qılmışam, cismə girib can olmuşam.

Dərdin dərunumda mənim aləmlərə çaxdı məni,
Qabil dəlildir, dərdimə həqdir ki, dərman olmuşam.

Dövri-qəmərdə gözlərin bir gəz qıya baxdı mana,
Zülmündən ol xunxarənin qan ilə qəltan olmuşam.

Ey bağü gülzarı üzün çün cənnətül-mə’va imiş,
Sən rövzəsisən, mən sənin qapında rizvan olmuşam.

Ey Turi-Sina, ərzə qıl həqqin təcəllisin mana,
Musa kimi didarına müştaqü heyran olmuşam.

Ol dəm ki, üzün görmüşəm, yüz yerdə səcdə qılmışam,
İman şəhadət etmişəm, anda müsəlman olmuşam.

Ey sayeyi-rəhman mənə, ey surəti-yəzdan mənə,
Dutdum üzüm səndən sənə, çün əhli-iman olmuşam.

Eşqinlə mövc içində mən dişlərinin əksin görüb,
Dürdanələrdir gözlərim, lö’löi-mərcan olmuşam.

Könlün Nəsiminin xarab etdisə eşqin, qəm deyil,
Mən gizli gənci bulmuşam, şol gəncə viran olmuşam.

Daim ənəlhəq söylərəm, həqdən çü Mənsur olmuşam,
Kimdir məni bər-dar edən, bu şəhrə məşhur olmuşam.

Qibləsiyəm sadiqlərin, mə’şuquyam aşiqlərin,
Məqsuduyam layiqlərin, çün beyti-mə’mur olmuşam.

Musa mənəm kim, həqq ilə daim münacat eylərəm,
Könlüm təcəlli nurudur, anın üçün Tur olmuşam.

İrdim qaşın me’racına kim, qabü-qövseyin oldurur,
Vüslət şəbindən gör məni, sər ta qədəm nur olmuşam.

Bəzmi-əzəldə içmişəm vəhdət meyinin cür’əsin,
Şol cür’ədən kim, ta əbəd sərməstü məxmur olmuşam.

Ey ay üzündür vəzzüha, vəlleyl imiş saçın qara,
Lə’lin mana darüş-şəfa, oldur ki, rəncur olmuşam.

Hər yana kim, dönər üzüm, yarı görə anda gözüm,
Çün bu qəmindən qəm yedim, şadanü məsrur olmuşam.

Ol şahidi-qeybi mənəm kim, kainatın eyniyəm,
Ol nitqi-rəbbani mənəm kim, dildə məzkur olmuşam.

Çün on səkkiz min aləmə oldu vücudum ayinə,
Ol surəti-rəhman mənəm kim, xəlqə məstur olmuşam.

Ol gizli gəncin sirriyəm kim, zahir oldu gövhərim,
Ol gövhərəm kim, gün kimi aləmdə məşhur olmuşam.

Çün mən, Nəsimi, gövhərəm, gəncim sizə faş eylərəm,
Mən bir dəli divanəyəm, gör kim, nə mə’mur olmuşam.

Nitqi-Allah mənəm ki, zatiləyəm,
Vəhdəhü laşərik sifatiləyəm.

Vahidi cümlə seyri-əşyada,
Kün-fəkan seyri-kainatiləyəm.

Ölməzəm, mən öləsi xud degiləm,
Əzəlidən bəri nicatiləyəm.

Oxuyun həyyi-layəmut məni
Ki, məmat olmazam, həyatiləyəm.

Faili-mütləqəm, həqəm, həqilən,
Kimsə bilməz, nə bəyyinatiləyəm.

Ruhi-məhzəm ki, düşmüşəm bu yerə,
Mö'cüzəm, bunda mö'cüzatiləyəm.

Bistü həştəm bu dörd təbiət ilə,
Kimsə bilməz ki, nə səbatiləyəm.

Gövhəri-laməkan mənəm, mənəm, uş
Qədrə irdim bu gün bəratiləyəm.

Nəsimiyəm bu gün bilənlərə mən,
Bilməyənlərə müşkilatiləyəm.

İxlas ilə ta canımı canana yetirdim,
Düşmənləri bu həsrət ilə cana yetirdim.

İsgəndəri zülmata irişdirdimü döndüm,
Xızrın sifətin çeşmeyi-heyvana yetirdim.

Həm Yusifi mən çahi-biyabana buraxdım,
Həm atəşi mən Musiyi-Imrana yetirdim.

Bəhri-mühiti həm ləbi-çeşmimdən axıtdım,
Həm qətrəyi mən bəhr ilə ümmana yetirdim.

Həm tutiyə mən şəhdi-şəkərdən səmər etdim,
Həm bülbülü mən bağ ilə bustana yetirdim.

Həm seyrdə mən mütrib ilə həmnəfəs oldum,
Həm saqiyi mən sağərü peymana yetirdim.

Özümnü Əsədullaha kəmtər qulam etdim,
Həm mö'cüzü mən şahi-Xorasana yetirdim.

Həq gördüvü həq dedi, Nəsimi nə desin kim,
Həm şe'rimi mən ayəti-Qur'ana yetirdim.

Əgərçi rahi-eşqində əsirəm,
Şəha, ol ad ilə aləmdə mirəm.

Təmənna dər cəhan mara həmin əst
Ki, pişi-həzrəti-pakət bemirəm.

Qədəh sun, saqi, dövründə bu gün mən.
Cavanbəxti-cahanam, gərçi pirəm.

Fərağət darəm əz şahani-dünya,
Betəxti-bəxti-xud şahü vəzirəm.

Sinəm gəncineyi-sirri-xudadır,
Nola gər surətən xürdü həqirəm.

Bəyani-ruyi-xud kərdəm mən əz can,
Be nuri-şəm'i-rovşən dilpəzirəm.

Çü zahir batinin əlvanı oldu,
Dərunumda nə kim, var anı derəm.

Besaqi dər əzəl mən əhd bəstəm,
Bedəsti-xiş cami-mey nəgirəm.

Görünən gözümə həqdir, anınçün,
Həqiqət nurilə sahibbəsirəm.

Həmə aləm bebin, por şod ze avaz,
Ze ahü naleyi-suzi-nəfirəm.

Bular canlar sifatından cahanda,
Anınçün kim, məqamati-həririm.

Süleymanəm, çe pəndari to mara,
Fərazi-ərşi-həq əz tu səriram.

İkilik mülkünü viranə qıldım,
Onunçün guşeyi-vəhdətdə birəm.

Çera manəm be qəflətha gereftar,
Çü Fəzli-rəhnuma şod dəstgirəm.

Fərağət olmuşam sudü ziyandan,
Nəsimiyəm ki, dərvişəm, fəqirəm.

Qaluda məni saqi əsritdi şərabından,
İçirdi ləbi-lə’li Xızrın mənə abından.

Üzündəki həft ayət kim, fatihədir adı,
Tə’vili-kəlamullah açıldı kitabından.

Tabəndə üzün nuru, yarəb, nə günəşdir kim,
Sərgəştə gəzər, yanar gün ay ilə tabından

Üzün nə qızılgüldür, saçın nə qara sünbül,
Həyy oldu iki aləm reyhanü gülabından.

Gəl fə’təbərudan göz aç, nəzər əhlini gör,
Nə hüsn ilə çıxdı gör mə’şuqə niqabından.

Həq xirqəyə, ey salik, baxmaz, içini arıt,
Gir aləmi-tövhidə, çıx xirqə hicabından.

Ey fitnəsi çox eynin uyxuda sanan yarı,
Şol fitnə qanı kim, ol oyanmadı xabından.

Həşrin günəşi doğdu şamında iki zülfü,
Gəl vaqif ol, ey zahid, mizanü hecabından.

Təsbih ilə tamatın bazarı kasad oldu,
Dükkanını yıx anın, köç eylə xarabından.

Xızrın abi-heyvanı nitqidir anın gəl iç,
Gör kim, nə həyat axar mərcani-xoşabından.

Yarəb, necə saildir aləmdə Nəsimi kim,
Ruhül-qüdüsün nitqi bağlandı cavabından.

Mai-təhuru bil kim, həqdən bu gün nidadır,
Yovmül-məzidi gör kim, məscidi-pürsəfadır.

Həqdən həqi gəl istə, həq ilə vasil ol kim,
Həq və’də verdi çünkim, cüm’ə günü liqadır.

Əvvəl bu nəfsini bil, ardınca rəbbini bil
Kim, kəndi gəldi həqdən, mənbərdə Mustafadır.

Sultani-arifinin qövlüdürür inan kim,
Yarın ləbindən içmək la-ibtida bəqadır.

Həqqil-yəqini gördüm, vüslətə vasil oldum,
Cümlə murada irdim, gör kim, nə xoş ətadır.

Zərqü riyası çoxdur, sufi sözünə uyma,
Niçün ki, daim işi təzvir ilə riyadır.

Misri Nəsimi buldu, Qur’an imamı oldu.
Came’də cüm’ə qıldı, məqbuli-kibriyadır.

Arifi-laməkan otuz ikidir,
Sahibi-cismü can otuz ikidir.

Aç könül gözünüvü güzgüyə bax,
Ki yəqin, bigüman otuz ikidir.

Çün üzündür kitab, ayatı
İstiva ilə san otuz ikidir.

Endi İsa, gətirdi şirki-xilaf,
Uştə sahibzaman otuz ikidir.

Sidrətül-müntəhanın əqsamı,
Sayır isən, haman otuz ikidir.

Sənsən ümmül-kitabın əsrarı,
Bil ki, səb'ül-məsan otuz ikidir.

Vəhyü ilhamü ya nəbiyyü vəli,
Verən, alan əyan otuz ikidir.

Gör Nəsimi ki, surətü mə'ni,
Aşikarü nihan otuz ikidir.

Təala-şanəhü hüsnün süfatı kim, müəlladır
Ki, ərrəhman ələl-ərş istiva, ol səhni-mövladır.

Bu hüsnün iştirakından misalın laşərik olmuş,
Pəs amənna və səddəqna sana ərz etmək övladır.

Hürufi-eyni-əlqabın bu mahiyyətdürür, çünkim,
Süfati-zatına gəlmiş bu əsma kim, müsəmmadır.

Əzəl bəzmində rüxsarın nə şey kim gördü məst oldu,
Əcəb meydir kim, içənlər hənuz uş məsti-şeydadır.

Həkimin şərbəti olmaz gözün sevdasına nafe',
Vüsalın şərbətin istər, dimağında bu sevdadır.

Vücudum lövhünə yazdım sənin eşqin, hürufundan,
Zəhi, ey münşiyi-əşya, bu nə sün'ü nə inşadır?

Üzün xurşidi-xavərdir, ana mətlə' günəşdir kim,
Nə şəmsi-ləmyəzəlsən kim, camalın adı yektadır.

Saçından bil ki, şərh oldu ələm nəşrəh ləkə, yarəb,
Camalın şəm'i yasindir, yanağın nuru tahadır.

Müənbər zülfünə həqdən qədimi sabit olmuşdur
Ki, sübhanəlləzi-əsra anın şə'nində əsradır.

Yədi-beyza imiş hüsnün ki, Musa ana məhrəmdir,
Təala şanəhü əkbər, bu necə Turi-Sinadır?

Nəsiminin bu gün düşdü gözünə dişlərin əksi;
Zəhi pakizə gövhər kim, mühiti eyni-dəryadır.

Yarəb, nə eyni-lütfisən, ey hüsni-lanəzir
Kim, əqlü fəhm vəchinə bir zərrədir həqir.

Qalu bəla rümuzunu zülfün əyan edər,
Hər kim ki, gördü anı, səmi’ oldu həm bəsir.

Allahu nurun ayəti vəchindədir əyan,
Əhsən bu hüsni-lütfə, təalallah, ey qədir.

Arif bilir ki, Tuba boyun e’tidalıdır,
Cahil nə Tubi arzular ol himməti-qəsir.

Qaşın dəbiri gör necə çəkmiş bu qövsü kim,
Yasini-nunu yazmaya bu şəklə min dəbir.

Divi-ləin ki, əhsəni-təqvimi bilmədi,
Mərdudvar əsfəlü safildədir əsir.

Elmül-yəqin ilə oxuyan vəchin ayətin,
Eynəl-yəqin görər həqi, həqqül-yəqin tanır.

Ə’madır ol kim, əlləməl-əsmayı bilmədi,
Bu ismi-ə’zəmi oxu kim, şərhidir kəbir.

Cahil xaçan bilir ki, nədir fatehül-kitab,
Bilməz anı fəqih kim, bəyan eylədi fəqir.

Hər kim ki, Nəsimi kimi oldu zülhəyat,
Məhşər günündə arzulamaz nəfxeyi-səfir.

Əya, şahi-səidəxtər, üzün ərşi-müəlladır,
Dodağın çeşməyi-heyvan, ləbin cami-müsəffadır.

Camalın surəti-rəhman, vüsalın cənnəti-rizvan,
Kamalın gənci-bipayan, vücudun cani-əşyadır.

Boyundur tuba, ey huri, üzündür aləmin nuri,
Camalında görər həqqi anın ki, eyni binadır.

Qəmər dövründə, ey fitnə, sən oldun xublara xatəm,
Sənin xalın xəyalından cahan pür-şurü qovğadır.

Qiyamət qopdu hüsnündən məgər axırzaman oldu,
Bəlalardan iraq olsun, bu nə qəddü nə baladır.

Bu dünyanın zərü gənci görünməz eynimə, billah,
İki aləmdə məqsudum cahanda hüsni-zibadır.

Şəha, lütfi-kərəm eylə Nəsimiyə zəkatından,
Qəribü aşiqi-şeyda, əsirü zarü tənhadır.

Hər kişinin sorman əslin, izzətindən bəllidir,
Söhbəti-irfan görənlər xidmətindən bəllidir.

Həq təala elm içində çünki simahum dedi,
Hər kişinin üzünə bax, surətindən bəllidir.

Dərvişin pirini sormaq dedilər adət degil,
Arifanə bir nəzər qıl, kisvətindən bəllidir.

Hər zərin qəlbi məhəkdən bilinür bəllü bəyan,
Nitəkim bimari-eşqin illətindən bəllidir.

Sorsalar səndən rəqibi, sən nəsindən biləsən,
Mən bilirəm, sözü əgri ənsəsindən bəllidir.

Ey Nəsimi, nəqdini nadan əlinə verme kim,
Cövhəri dana bilir həm qiymətindən bəllidir.

Aşiqə birdir əzəldən sevgili dildar, bir,
İkilik yoxdur arada yar birdir, yar bir.

Munca kim seyr eylədim, gəzdim vücudum şəhrini,
Şəhr bir, dükkan birdir, söyləyən göftar bir.

Aşiqi-divanəyəm, gəldim, ənəlhəq söylərəm,
Nar birdir, nur birdir, əslü rəsmi-dar bir.

Aşiq olanlar səxidir, aqil olanlar bəxil,
İki aşiq arasında gizlidir əsrar bir.

Zahidi-nadana söylən, özünü tərk eyləsin,
Bu həqiqət aləmində olmasın inkar bir.

İnkar əhlin söylədirsən birə yüz der, yüzə min,
Əhli-iqrarın qatında varı birdir, var bir.

Aşiqü mə'şuq yolunda doğrudur həq mənzili,
İki arif arasında xirqəvü zünnar bir.

Qəhrinə bel bağladım, lütfün görüm şayəd sənin,
Canı verdim, başı qoydum, vermişəm iqrar bir.

Pir birdir, sirr birdir, sirr ilə bir olmayan,
İkilik sığmaz arada, sirr ilə sirdar bir.

Gər Nəsiminin pənahı Şahi-Mərdandır Əli,
On səkiz min aləmə hökm eyləyən sərdar bir.

Eşq yolunda kim ki, ol yarına canfəşan gedər,
Əhli-yəqin bilir kim, ol cənnətə bigüman gedər.

Qəddü üzün hekayətin eşidəlidən, ey sənəm,
Sərv gəlir xəyalıma, cöhrədən ərğəvan gedər.

Yox xəyalı dəmbədəm gözlərimin sarayına
Ab kimi rəvan gəlür, yaş kimi rəvan gedər.

Ey həvəs eyləyən kişi eşqə, eşit bu nüktəyi,
Xubların xəyalına vermə könül ki, can gedər.

Yar ilə söhbət eyləmək bir dəm, iki cahan dəgər,
Dövlət anın ki, yar ilə söhbəti cavidan gedər.

Nərgisi-şuxu dilbərin fitnəyi-axır eylədi,
Sərv qədinə qıl nəzər, gör necəsi rəvan gedər.

Kirpik oxilə yarəlü qıldı gözün Nəsimiyi,
Anınüçün gözündən uş ləhzədə bunca qan gedər.

Üzünə əhli-nəzər surəti-rəhman dedilər,
Oxuyanlar bu kəlamüllahı Qur'an dedilər.

Səb'əxan hafizə sordum qaşın ilə üzünü,
Həqq ilə batili fərq edici fürqan dedilər.

Üzünə, arizinə xazini-cənnati-nəim,
Xüldü firdövsi-bərin, rövzeyi-rizvan dedilər.

Ləblərin çeşməsinə Xızrü Skəndər, Dara
Zəmzəmü kövsər ilə çeşmeyi-heyvan dedilər.

Ləbi-lə'lin şəkərindən bal utandı, əridi,
Səni Şirini-zaman Xosrovi-xuban dedilər.

Sibqətüllah və mən əhsənə həqdən üzünə,
Abidun gözlərinə sibqeyi-sübhan dedilər.

Müntəhi sidrə boyun qaməti şümşadi-səhi
Ki, boyun sidrəsinə sərvi-xuraman dedilər.

Üzün üstündə saçın cəm'i pərişan kimidir,
Aşiqin könlünə məcmui-pərişan dedilər.

Aşiq ol, eşq ilə bil məntiqi-eşqin dilini,
Mö'minə Nuhi-nəcat, kafirə tufan dedilər.

Əkrəmüzzeyf əmanət dedi peyğəmbəri-həq,
İzzət etgil bu gün ol nitqə ki, mehman dedilər.

Mən ərəfna tanıyan nəfsini ol kimsənədir,
Bildi rəbbini, anın adını insan dedilər.

Səcdə qıl, məscidi bul, sacidü məscudunu bil,
Kim ki, torpağa sücud etmədi, şeytan dedilər.

Möhkəm ayatü dəlilü rüxü vəchül-həsənə
Ki, Nəsimi sözünə höccətü bürhan dedilər.

Eydi əkbərdir camalın, eydə can qurban olur,
Abi-heyvandır dodağın, hər kim içər can olur.

Gərçi eşqin məskəni viranəsidir könlümün,
Gənci-bipayana layiq qanda hər viran olur?

Ey qaşın mehrabü üzün qiblə iman əhlinə,
Aşiqin beytülhəramı surəti-rəhman olur.

Surətin əsrarını zahid nə bilsin, ya fəqih,
Qul-kəfa billahə məhrəm qanda hər heyvan olur.

Ey qaşınla kirpigin, mişkin saçın ümmül-kitab,
Əhli-tövhidin imamü mürşidi Qur'an olur.

Canmısın, ya adəm oğlu, ey günəşrüxsarə kim,
Surətin nəqşində insan valehü heyran olur?

Sanein ehsanıdır hüsnün təala şanəhu,
Qüdrəti kamil olanın adəti ehsan olur.

Yarəb, ol pakizə cövhər kim, bəşərdir surəti,
Qanğı aləmdən gəlir, adı nədən insan olur?

Sünbülün çinində könlüm eyləsə məskən, nola,
Əhli-tövhidin məqamı rövzeyi-rizvan olur.

Surəti hər şeydə çün kim vazeh olmuş, ey könül,
Kim dedi, huri görünməz, ya pəri pünhan olur?

Gül nə çiçəkdir ki, anı bənzədəm rüxsarına,
Qanğı gülzarda rüxüntək bir güli-xəndan olur?

Ey ki, müşkildir deyərsən vasil olmaq yar ilə,
Qoy səni, səndən kəsil kim, müşkilin asan olur.

Nəfsini hər kimsə kim, bildivü həqqi tanıdı,
Arifi-rəbb oldu, adı əbd ikən sultan olur.

Düşdü sevdayi könül aşüftə zülfün damına,
Düşməyən şol ənbərin zəncirə sərgərdan olur.

Külli-şey'un halikə lareybə illa vəchəhu,
Gör bu vəchi kim, nə vəchin vəchinə bürhan olur.

Surəti-rəhmana, inkar eylədi divi-rəcim,
Əhsəni-təqvimə inkar eyləyən şeytan olur.

Ey Nəsimi, abi-kövsərdir məgər nitqində kim,
Hər kim içər ol şərabı, məsti-cavidan olur.

Bəhri-fənada fani ol, gör ki, nə xoş həyat olur,
Abi-həyat imiş fəna, gərçi adı məmat olur.

Kə'bə yolunda eşq ilə yoldaş ol, ey həcə varan,
Susamaz ol ki, yoldaşı Zəmzəm ilə Fərat olur.

Canü cahanü dinü dil oynamayan bu ərsədə,
Şahi-cahan olursa gər, ol rüxə şahı mat olur.

Çıxdı tufan tənurdan, qərq edisər cahanı, gəl
Gir gəmiyə ki, canına şol səbəbi-nəcat olur.

Qeyrə müqəyyid olma kim, hər nə ki, qeyridir anın,
Gər həmə kün-fəkan isə, arifi-zata Lat olur.

Əql ilə namü nəngini var, oda sal və yax anı,
Talibi-zat olan qaçan mültəfiti-sifat olur?

Qıldı fəna vücudumu, eşq güm eylədi məni,
Bəllisiz oldu hər kim, ol qərqeyi-bəhri-zat olur.

Şol günəşin şüasına zərrəcə kim ki, buldu yol,
Hər günü eydü gecəsi qədrü şəbi bərat olur.

Fikr edərəm ki, yazayım zərrəcə eşq sirrini,
Bəhr midad, ağac qələm, tasi-fələk dəvat olur.

Eşqə fənayi-mütləq ol, keç bu rəvaqü taqidən,
Gövhəri-laməkan necə bəsteyi-şeş cəhat olur?

Hər həsənat kim, səni doğru ilətmədi həqə,
Qoyma anın adın həsən, gər həmə səyyiat olur.

Məscidü xanəgaha sən sufitək olma qürrə kim,
Aşiqə cümlə yerü gög mə’bədü sovməat olur.

Zövq iləvü hüzur ilə Fəzlə pərəstiş eylə kim,
Qəlbi hüzursuz olanın taəti lasəlat olur.

Canü cahana ur qafa, aşiq isən gəl, ey könül,
Aşiqə fərzü müstəcəb tərki-təəllüqat olur.

Dövlətinə bu dünyanın olma müqəyyəd, ey məlik,
Anın üçün ki, dünyanın dövləti bisəbat olur.

Vəhdəti-sərfə ta əbəd oldu Nəsimi bəllisiz,
Hər ki, bu rəsmə məhv ola, zübdeyi-kainat olur.

Könlü ə'ma olanın nuri-təcəlla nə bilür?
Bu sözün şərhini binaya sor, ə'ma nə bilür?

Mö'minin güzgüsü çün mö'minimiş, gözünü aç,
Görməyən güzgüdə şol surəti, mə'na nə bilür?

Dara çıxmaq bu fəna ərsədə Mənsura düşər,
Bilməyən sirri-ənəlhəqqi, o də'va nə bilür?

Leylinin bildigini Məcnuna sor, Məcnuna,
Aqilin əqli qaçan bildi ki, Leyla nə bilür?

Bənzədirlər dodağın xəttini reyhana, vəli
Şol zümürrüd göhərin qiymətin əf'a nə bilür?

Cənnət içində olan huriliqanın zövqün
Cənnətin əhlinə sor, cənnəti-ə'la nə bilür?

Ey verən könlünü Çin nəqşinə, şol surətə bax,
Qüdrətin nəqşi yazan nəqşəni Mana nə bilür?

Axirət halını hal əhlinə sor, ey qafil,
Bu səfərdə olanın yoldaşı dünya nə bilür?

Ey Nəsimi, nəfəsin gərçi Məsiha dəmidir,
Mö'cüzün rəmzini Musa bilə, Isa nə bilür?

Surətin xətti-ilahi, anı nadan nə bilür?
Divi-məl’unsifət mə’niyi-Qur’an nə bilür?

Hər ki, də’vi qıla kim, surətü mə’ni bilürəm,
Görməmiş üzünü ol surəti-rəhman nə bilür?

Tövratü Incilü Fürqan qamu hüsnün sifəti,
Adəmin şərhidüdür, ayəti şeytan nə bilür?

İnsü cinnin dilini gərçi Süleyman bildi,
Sən bilən dili bu gün yə’ni Süleyman nə bilür?

Kə’beyi-mə’niyə hər kim çü Nəsimi irəməz,
Möhnəti-biədədü xari-müğilan nə bilür?

Sirri-ilahi bilən, şol xətü xali bilür,
Hala xəbir olmayan, sanma bu halı bilür.

Qaşü gözü mö'cüzü vəhyi-mübindir anın,
Ol bilür ol sirri kim, eynivü dalı bilür.

Gərçi ə'la şə'nəhu yazaram ol şaha mən,
Hüsnünə xətm etdigim cəllə-cəlalı bilür.

Nəqlü rəvayatilə zahid uzadır sözü,
Munca nə söylər, əgər doğru məqalı bilür?

Hafiz əgərçi oxur yövmü-yünadi, vəli
Sən bu nidayı ana sor ki, Bilalı bilür.

Əhsəni-surət kimin vəsfidir, ey müddəi,
Kim ki, cavabı verə, ol bu sualı bilür.

Şol sənəmin surətin kim ki, əyan görmədi,
Qanda bu vəchi-həsən ya bu camalı bilür?

Şə'ninə nun-vəl-qələm nazil olubdur qaşın,
Kim ki, bu hərfi oxur bədrü hilalı bilür.

Mehri-rüxün vəsfini hicrə yanan cana sor,
Firqətini çəkməyən qanda vüsalı bilür?

Gərçi Nəsimi sözün dadını verdi, vəli
Kim bu sözü fəhm edər, kim bu xəyalı bilür?

Hər nəyə kim, baxırisən anda sən Allahı gör,
Qəncərü kim, əzm qılsan sümmə-vəchüllahı gör!

Bu ikilik pərdəsindən keç, hicabı rəf' qıl,
Gəl bu birlik rövzənindən bax, bu sirrüllahı gör!

Keç ənaniyyət sözündən, könlünü viranə qıl,
Necəsi tezcik bilürsən küntə-kənzüllahı gör!

Həcci-əkbər qılmaq istərsən gəl, ey zahid, bəri,
Aşiqin qəlbi içində sən bu Beytüllahı gör!

Can gözilə baxdın isə kainatın eyninə,
Andan özgə nəsnə varmı həsbətənlillahı gör!

Münkiri-rö'yət degilsən surəti-həq görməyə,
Baxdığınca hər nəzərdə eyni-zatüllahı gör!

Lövhi-ixlas eylədinsə könlünü, ey müttəqi,
Kürsiyi-rəhmana ağdın, gögdə ərşüllahı gör!

Ölmədən nəfsini öldür, arifi-rəbb olasan,
Nəfxeyi-ruhülqüdüsdən məhz rühüllahı gör!

Elmi-hikmətdən bilirsən bir bəri gəl, ey həkim,
Sən Nəsimi məntiqindən dinlə Fəzlüllahı gör!

Saqiyi-vəhdət meyindən dilbəri-mövlayı gör,
Gəl ki, məstani-ələst ol, bu məhəl övlayı gör.

Qəmzəsidir dilfiribü dilkəş xətti anın,
Həq təcəllisin nəzər qıl, əlləməl-əsmayı gör.

Cümlə əşya məst olubdur ol camalın eşqinə,
Ayü gün müştaqdır, ol nərgisi-şəhlayı gör.

Abi-heyvandır dodağı kəndi həyyi-cümlədən
Nəfxeyi-İsa bağışlar ol ləbi-əhyayı gör.

Zülfü qaşü kirpigin gördükcə adam məst olar,
Fitnələr çünkim qopar, ol surəti-Həvvayı gör.

İgirmi səkkiz hərf kim, həqqin kitabıdır üzü,
Oxugil dörd gəz yenidən sirri-ma-övhayı gör.

Gəl, bəyan nəqşini gər bilmək istərisən bu gün,
Musayı anlarsan, ey sahir, yədi-beyzayı gör.

Çünki gəlmişdir xitabı sana vəscud vəqtərib,
Ey Nəsimi, qıl sücudu, məscidi-əqsayı gör.

Nöqteyi-sirri-ilahi bai-bismillahdır,
Kim ki, bilməz bu sirri müşrikü gümrahdır.

Natiqi-elmül-yəqindir cümlə əşya, ey könül,
Bu cəhətdən həq kitabı yəskurunullahdır.

Həm qiyamü həm qüudü həm yəminü həm şimal,
Hər yanadan baxaram, ol sümmə vəchullahdır.

Küntə kənzən sirrini adəmdə qıldı aşikar
Kim, vücudi-adəmi sirri-kəlamüllahdır.

Xaliqül-cinnin vücudu istivadır əşr ilə,
Hadiyi-əhli-yəqin təhqiq ilə ol rahdır.

Sirri-tənzili-ilahi dilbərin vəchindədir,
Sahibi-tə'vil edər kim, surəti-Allahdır.

Seyr əgər qılsan Nəsiminin vücudundan yəqin,
Biləsən həqqül-yəqin nə vəch ilə agahdır.

Mö'minin qəlbi içində çünki beytüllahdır,
Neçin izzət eyləməzsən, anda çün Allahdır.

Ol məqamı tanrının kim, ərş oxuyurlar anı,
Mö'minin qəlbidürür kim, təxti-şahənşahdır.

İstəgil bir əhli-dili, ol bilir həq yolunu
Kim, anın rövşən dilində həqqə doğru rahdır.

Yerdə, göydə hər nə kim var, dünyada, üqbada həm,
Cümləsindən bəlkə yaxşı bir dili-agahdır.

Ey Nəsimi, hər kim ol dil Kə'bəsin qıldı təvaf,
İrdi məqsudü murada, vasili-dilxahdır.

Qeybi-mütləq sirrini əgərçi pünhan göstərir,
Aşikarə kəndözin bər vəchi-insan göstərir.

Gər dilərsən, görəsən həq üzünü eynəl-yəqin,
Bistü-həştü sivü dü tə’vilü bürhan göstərir.

Üzü müshəf, xətti bismillah, xalı nöqtədür,
Sözü rəhmanir-rəhim, məcmui-Qur’an göstərir.

Hazihi cənnati ədnin, fədxəluha xalidin,
Sureyi-səb’ülməsani hurü qılman göstərir.

Qəm degil bər dar olur Mənsur, ənəlhəq çün dedi,
Əcrinə buldu savabı, dərdə dərman göstərir.

Dürlü-dürlü don içində gördüm anı dəmbədəm,
Şivə birlə külli-yövmin hüvə fiş-şan göstərir.

Əvvəl-axır, batinü zahir həqiqət halını
Surətü mə’ni mana dər cism, dər can göstərir.

Gecə-gündüz zülmətü nuru cəlal ilə camal,
Qəhrü lütfü aşiqə küfrü həm iman göstərir.

Vəslə vasilsən, qənimət dut, Nəsimi, bu dəmi,
Gərdişi-çərxi-fələk nagah hicran göstərir.

Zey günəş kim, zərrəsindən mahi-taban göstərər,
Zey dəniz kim, qətrəsindən bəhri-ümman göstərər.

On səkiz min aləmə ayinə oldu surətin,
Çar ənasir surətində şəkli-insan göstərər.

Canü dil Beytülhəramı vəslin oldu, ey nigar,
K’əlləzi əsrayı hər dəm anda sultan göstərər.

Cameyi-cümlə xəlayiq nüsxeyi-ümmül-kitab
Olduğiçün, bu bəşər şəklində Qur’an göstərər.

Tövhidin bəhrinə fərdi-vahid olub qalmayan,
Yoxdurur tövhidi anın, küfrə iman göstərər.

Eylədi çün bu Nəsimi faş ənəlhəq sirrini,
Dönmədi, eşqin yolunda əhdü peyman göstərər.

Vəhdətin şəmsi üzündür, laməkanı göstərir,
Zi kəmali-nəqşi-qüdrət bu nişanı göstərir.

Sureyi-səb'ülməsanidir, camalın, ey günəş,
Surəta mə'ni mənə səb'ülməsani göstərir.

Zilli-sanidir saçın, inna ileyhür-raciun,
Qül kəfanın afitabı xoş məani göstərir.

Hüsnünə heyran olubdur mahü xurşidi-səma,
Mahü xurşidin camalı bu bəyanı göstərir.

Mə'dəni-lö'lö dişindir, cövhəri bilməz anı,
Cövhəri cövhər nə bilsin kim, dəhanı göstərir.

Vəl-qələmdən kafü nunun katibi şəqq eylədi,
Cə'bədən şəqqül-qəmər gör kim filanı göstərir.

Laməkanidir vücudun, qül təbarək, ya həbib,
Gəl məkanı gör, məkansız kün-fəkanı göstərir.

Eşq meydanında gəl, də'vi nədir, ey pirhünər,
Də'viyə mə'ni gərəkdir, tərcümanı göstərir.

Cənnətin mülkünə düşmüşdür Nəsimi la-yəzəl,
Dari-üqbada məgər ruhi-rəvanı göstərir.

Gerçək ərisən uşbu dəm ta biləsən nəzər nədir?
Bir nəzər eylə dopdolu gör ki, cahan, bəşər nədir?

Gənci-nihanı aşikar etdi bu dəmdə ləm-yəzəl,
Gəldi gələn fəna üçün, geri ona səfər nədir?

Gənci-əzəl bilinməyə, hicdə həzar aləmə,
Gəldi bəzəndi cümləsi, gör ki, bunu görər nədir?

Lövhə qələm çalınmadan elmi-lüdəndə var idi,
Elmini zahir etməyə zir ilə bu zəbər nədir?

Mən-ərəfə bu nəfs üçün gəldi xitab surətə,
Sirr ilə seyr etməyə ortada bu xəbər nədir?

Cana dilək verən kişi, ərş üzə ol şikar edər,
Anda şikar edən quşa qüvvəti-balü pər nədir?

Qeyrətə gəlsə adəmi, elmini hasil eyləsə,
Cəhli mürəkkəb olmasa, bilsə bu dəm hünər nədir?

Nəfsini bilməyən bu dəm qorxu nədir nə bilsin ol,
Kəndözünü bilənlərə sud nədir, xətər nədir?

Elmi-lüdən tələb qılan təşnə Xızırsifət gərək,
Cami-əzəldə əsriyən abi-həyat əmər nədir?

Vəqti-səadət istəyən tacü kəmər tələb qılır,
Fürsətə bir nəzər baxan bilə yəqin kəmər nədir?

Xalisü müxlis olmağa tərki-iradət eyləgil,
Tərki-iradət eyləyən bildi ki, şiri-nər nədir?

Vüslətə çinə çin olub, razını aşikar edən,
Gəl kərəm eylə zahir et, bu dediyin xəbər nədir?

Şəm'ini gör necə yanar, sirrinə irməz adəmi,
Bir ana sor, gör necə daima tərki-sər nədir?

Eşqi-həqiqət anlayan can ilə başa qalmadı,
Qəmzələrinə dilbərin canü könül sipər nədir?

Şö'leyi-həq doğurmağa, cübbə, qəba gərək müdam,
Zülmət içində görünən şəms ilə bu qəmər nədir?

Mə'rifətin gülün dərən, tutiyə şəkkər istəyən,
Gör bu Nəsimi sözləri bülbüli-tazətər nədir.

Uş bu mənim sualımın həll edə gör cavabını,
Gerçək ərisən uşbu dəm, ta biləsən nəzər nədir?

Ey qılan də’vi ki, sufiyəm, fütüvvatın nədir?
Gər səfa əhlindən oldun, həqqə mir’atın nədir?

Arifi-nəfs olmayınca kimsə bulmaz həqqə yol,
Də’viyi-irfan edərsən, göstər isbatın nədir?

Olmayan fani, özündən mürtəfe olmaz hicab,
Faniyəm dersən, əcəb, bu zərqü tamatın nədir?

Nuri-həqdən urma laf, ey kəndisindən bixəbər,
Bilmədin çün səndə ol müsbahü müşkatın nədir?

Buriyavü teyləsanü xirqədən yox hasilin,
Keç bu surətdən, özünü tanı kim, zatın nədir?

Eyləmişsən surəti-sufiliyi dükkani-kəsb,
Bundan özgə var isə göstər kəramatın nədir?

Çünki sən məhkumi-nəfsi-şumsan, ey bülhəvəs,
Kimsəyə kafir demə, qoynundakı latın nədir?

Də’vi eylərsən ki, mən seyri-məqamat eylərəm,
Bilməzəm, ey xər, bu yolda mindiyin atın nədir?

Çün bulunmaz biriya aləmdə bir sahibkamal,
Ey Nəsimi, fariğ ol, bunca məqalatın nədir?

Ey bilən həqqin süfatın, ismi-əsması nədir?
Ya bu əsmadan murad olan müsəmması nədir?

Nə səbəbdəndir qəmər gah bədr olur, gahi hilal,
Sirri-xurşidin əcəb, başında sövdası nədir?

Niçün olmuş mərkəzi-xaki, əcəb biçün misal,
Ya bu taqi-sərnigunun səqfi-minası nədir?

Hər sənubərüzlünün üzündə xəndandır bu hal,
Hər bir ahugözlünün zülfi-mütərrası nədir?

Çün ibadət həqqədir, mə’bud bir həqdir yəqin,
Mö’minin bəs məscidi, gəbrin kəlisası nədir?

Zahirü batində çün mövcüd həqdən özgə yox,
Ya bu mövcudatın ara yerdə qovğası nədir?

Çünki həqqin zatın isbat eyləməz ərbabi-əql,
Aşiqi-həqbin ilə hər dəmdə də’vası nədir?

Ey Nəsimi, çün sənə həqdən liqadır arizu,
Nari-duzəxdən nə qəm, firdövsi-ə’lası nədir?

Fatihə ümmül-kitabın göstər ayası nədir?
Bistü həştü sivü dü hərfin xülasası nədir?

Doqquz ata, yeddi ana, dörd tayadan ver xəbər,
Dü çəharü pəncü şeşin saqü bünyası nədir?

Üç yüz altmış altı mənzil, qırx səkiz yerdə mizan,
Ey ki yetmiş yeddi hərfin on iki xası nədir?

Çöhrənin şövqü nədən, məhəbbətin qullabı nə,
Aşiqü mə'şuq nə demək, eşqin əsası nədir?

Sidrəvü kövsər nədəndir, nöh fələkin gərdişi,
On iki bürcü kəvakib cayı, mə'vası nədir?

Yeddi yerdir, yeddi gögdür, yeddi dərya, yeddi xət,
Yeddi müshəf, yeddi ayət, yədi-beyzası nədir?

Küllü şey'ün halikə çün rəbb ayıtdı yəqin,
Ey Nəsimi, arifin qəlbində çerası nədir?

Dörd müxalif cəm olanda bil ki, əsması nədir,
Elm ilə bilgil anın ismü müsəmması nədir?

Arif isən, nəfsini qurtar məqami-suflidən,
Dəgmə əhvəl nə bilür mənzili-ə'lası nədir?

Şöhrətü zərqü riyadır zahidin əfsanəsi,
La deyər hər dəmbədəm bilməz ki, illası nədir.

Mən münacat eylərəm hər dəmbədəm dər-kuyi-dust,
Çün vücudun Tur olanda bil ki, Musası nədir.

Əhli-həq hər yerdə məskən dutsa həqdir mənzili,
Kə'bəvü bütxanəvü məscid, kəlisası nədir?

Dünyanın qalü qilindən keç, Nəsimi, fariğ ol,
Aləmi-vəhdəti gözlə, bunca qovğası nədir?

Camalın, yarəb, ey dilbər, nə taban mahi-ənvərdir
Kim, anın afitabından iki aləm münəvvərdir.

Üzün xəttindən, ey huri, bəyani-küntü kənz eylər,
Təaləllah, zəhi dəftər, bu dəftər qanğı dəftərdir?

Rüxün xəttilə xalından çəri çəkmişdir, ey dilbər,
Zəhi şahzadəyi-ə’zəm ki, xoş uğurlu ləşkərdir.

Nə rə’na sidrədir, yarəb, boyun aləmdə, ey huri
Kim, anın qəddi-balası yedi iqlimə sərvərdir.

Yedi xəttin kitabından, səkiz cənnət əyan oldu,
Bu vəch ilə yəqin oldu ki, ol zati-mütəhhərdir.

Xəyalımdan deyil xali xəyalın xeyli bir saət,
Həmişə surətin nəqşi bərabərdə müsəvvərdir.

Ləbin camından ol can kim, Xızırtək irdi məqsuda,
Çıxa gəldi çü zülmətdən, bu gün adı Skəndərdir.

Bəbəktək bəslədim daim gözümdə xali-hindunu,
Bəbək şoylə əziz olmaz kim, ol xali-müdəvvərdir.

Nəsimi, Fəzlin-Allahın üzün nurunda çün gördü,
Təvafi-Kə’bə xətm oldu, səfavü həcci-əkbərdir.

Həmdüllillah kim, camalından cahan pürnurdur,
Şol cəhətdən mülki-can viranəsi mə’murdur.

Yeddi ayətdir ki, yazmış dəsti-paki-ləm-yəzəl,
Xətti-mişkin rəqqi-mənşur üstünə məsturdur.

Oxuyan hərfü kitabü xəttin, ey can, bildi kim,
Əhmədə tahavü yasin, Musaya vət-turdur.

Qibləyi əhli-səfa dedi əmini-ənbiya,
Səcdə bil kim, qibləsiz cayiz degil, məşhurdur.

Kim ki, can tərk etmədi yolunda gerçək dilbərin,
Gər ənəlhəq söyləsə sən sanma kim Mənsurdur.

Fatihə, sövmü səlatü rövzeyi-Darüssəlam,
Xazini-əbvabi-cənnət həm nəimü hurdur.

Qaməti sərvü sözü şəkkər, ləbi abi-həyat,
Surəti həqdir, üzü gör kim, nə xoş mənzurdur.

Həqqə minnət, çün Nəsimi buldu vəslindən bərat,
Şol cəhətdən dəmbədəm bu suz ilə məsrurdur.

Üzün mehrindən, ey dilbər, həqin ənvarı-lame’dir
Ki, anın məzhəri, yeri ilaha Misri-came’dir.

Camalın yeddi ayatı ki, zülfü qaşü kirpikdir,
Qılır izhari-həq zahir, bəyanı gör ki, vaqe’dir.

Müdəvvər nöqteyi-ağzı ki, sövtü nitqidür bürhan,
Əyandır hər kəlamından, bu höccət bil ki, qate’dir.

Dönər həqdən yəqin zahid ki, qılmaz adəmə səcdə,
Yəqinsiz əbləhi gör kim, necə şeytana tabe’dir!

Çü əhli-mə’rifət qədri bu yerdə qalmadı, arif,
Rəvan ol bir yerə daxi ki, ərzüllah vase’dir.

Rümuzi-əlləməl-əsma hər əhvəl bilmədi həqqa
Ki idrakatı mə’nidə gümanü zənn mane’dir.

Hicabı rəf’ edən arif görər mir’atı vəchində,
Camali-həqqi bişübhə kim, ol işbaha rafe’dir.

Nəsiminin sözü həqdir, gətir iqrar, ey münkir,
Kitabi-vəch ilə, üştə, dəlil – ayati-sabe’dir.

Şirin hədisin hər sözü min gövhəri-yekdanədir,
Ənvarına şəm'i-rüxün ay ilə gün pərvanədir.

Üzündür ol taban qəmər, k'ənvari-tabından anın
Xurşidü mahın məş'əli daim tutuşmuş, yanədir.

Dövründə eynin sağəri sahibtəriqət salikin,
Piri-muğan oldu adı, sərhəlqeyi-meyxanədir.

Təsbih ilə səccadəyi əldən burax, ey müttəqi,
Şol zülfü xala bax, anı gör kim, nə damü danədir.

Aşiqlərin cananəsi həqdir, həqə ver canını,
Neçin ki, cansız qalısər ol can ki, bicananədir.

Eşqin hədisin gəl eşit, əfsanəyə aldanma kim,
Qur'an satan hər vaizin nəqli uzun əfsanədir.

Düşməz xumarın rəncinə vəhdət meyindən ta əbəd,
Şol məsti-həq kim, saqisi ol nərgisi-məstanədir.

Şirin ləbidir dilbərin vəhdət meyin peymanəsi,
Ey zahid, ol peymanədən məst ol ki, xoş peymanədir.

Şol surəti-rəhmana ol sacid ki, mərdud olmadı
Ol əhli-həq kim, səcdəsi şol surəti-rəhmanədir.

Arif biləndir rəbbini, gəl rəbbini gör, arif ol,
Həqdən bu gün məhcub olan şeytan kimi biganədir.

Mişkin saçın zəncirinə düşdü Nəsimi, ey sənəm,
Zənciri-zülfün qeydinə seyd olmayan divanədir.

Şəm’ oldu könlüm, üştə fəraqında yanədir,
Hər kim bu rəsmə eşqə düşə, işi ya nədir?

Eşqində hər oxu ki, fələkdən atar qəza,
Amacam ol xədəngəvü könlüm nişanədir.

Şirin hədisü dadlu kəlamından özgə söz
Aşiqlərin qulağına sığmaz, fəsanədir.

Mişkin saçınla qaliyədən vəz’ olan bənin,
Ol dam içində mən bilirəm kim, nə danədir.

Ey surətin camalü məlahətdə binəzir,
Gəlgil ki, hüsn içində camalın yeganədir.

Ol yar üçün əzəldə qul oldum bəhanəsiz,
Kimdir bəhanəsiz qulu satan, bəha nədir?

Ey xanəgaha taət evidir deyən füzul,
Meyxanəyi həm aravü gör kim, nə xanədir.

Ey ömrünü murad ilə sərf etmək istəyən,
Ver dilbərin vüsalına kim, cavidanədir.

Mə’dənsiz altun olmazü kansız degil göhər,
Ey gövhəri-yeganə, rücuun nə kanədir?

Yarın vüsalın istə bu gün, qoyma yarına,
Yarın vüsalı yarına qalmaq gümanədir.

Zülfündə məskən eylədi canı Nəsiminin,
Canın həmişə məskəni şol aşiyanədir.

Mə’anilü sözün dürri-səmindir,
Bəyanın məhbiti-ruhüləmindir.

Rəvan oldu zülali-nəzmü nəsrin,
Şərabi-kövsərü mai-məindir.

Kəlamın mö’cüzü zahirdir, amma
Dürəfşan məntiqin sehrafərindir.

Sana tiğü qələm Bəhram ilə Tir
Müsəlləm qıldılar, bürhan mübindir.

Vücudun cövhəri rütbətdə nafe’
Mükərrəm əslü fərri maü tindir.

Yəqin oldu ki, bulmuşsan hidayət,
Dəlilin çün hüda lil-müttəqindir.

Yəqinsiz olmaz iman əhli, niçün
Ki, iman, həq buyurdu kim, yəqindir.

Yəqin çün səndədir, mö’min sən oldun,
Sən ol mö’min ki, mö’min əhli-dindir.

Nəsiminin təhiyyatü salamı
Ələl-əhbabəhu vəl-aşiqindir.

Ey üzün səb'ülməsani, nəzzələl-Fürqan budur,
Vəhyi-mütləq həq kəlamı, qaf-vəl-Qur'an budur!

Şol həyat abı ki, buldu Xızr anı zülmətdə, uş
Bulmuşam lə'lində, yə'ni, çeşmeyi-heyvan budur!

Ey Irəm gülzarı üzün, vey dodağın səlsəbil,
Aşiqin rizvanı sənsən, rövzeyi-rizvan budur!

Söyləmək vəqtində şirin ləblərindən can yağar,
Afərin ol cana, ey can afərin, bürhan budur!

Zərqü təzvirin zamanı keçdi, ey zahid, oyan,
Eşqə taət qıl ki, oldu hökm anın, fərman budur!

Ey qılan tövhidü iman küfrü şirkin adını,
Gər bu ziba surətə qıl səcdə kim, iman budur!

Əhsənül-təqvimi inkar eylər imansız fəqih,
Şol əzazilin ki, adın həq dedi şeytan, budur!

Gər desəm həqsən, nigara, qüssədən iblis ərir,
Vər desəm insan, bu sığmaz əqlə kim, insan budur.

Gözlərin Allahu nurün ayətin təfsir edər,
Ey bu mə'nidən xəbərsiz, surəti-rəhman budur!

Dilbərin yolunda qurban ol, fəda qıl canını,
Ey bəqasız cana aşiq, cavidani can budur!

Aşiqin başilə oynar şol nigarın zülfü, uş
Aşiq ol, meydana gir kim, top ilə çövkan budur!

Eşqə çün dərman bulunmaz, keç əməkdən, ey həkim,
Gəl bilinməz nəsnədən keç, əbsəm ol, dərman budur!

Ey deyən xəndan ağızlı bitmiş ongünlük gülə,
Gəl bu rüxsarın gülün gör kim, güli-xəndan budur!

Gəl Nəsiminin əlindən badəyi nuş eylə kim,
Layəzali işrət oldur, qüssəsiz dövran budur!

Qəmzəsi bimarü eyni natəvandır sanma kim,
Kimsə halin bilməz anın, üştə hali məndədir.

Dünyavü üqba cəmalin vəslinə oldu tüfeyl
Vəslini çün buldum anın ittisali məndədir.

Gərçi fəttandır gözün, aydır yanağın, ayə kim
Fitneyi-axirzəmanın məkrü ali məndədir.

Surətin pakizə nəqşi, layəzalı məndədir,
Məndən ayrılmaz bu surət, uş xəyalı məndədir.

Qəmzəsi bimarü eyni natəvandır sanma kim,
Kimsə halın bilməz anın, üştə halı məndədir.

Dünyavü üqba camalın vəslinə oldu tüfeyl,
Vəslini çün buldum anın, ittisalı məndədir.

Gərçi fəttandır gözün, aydır yanağın aya kim:
Fitneyi-axırzamanın məkrü alı məndədir.

Gərçi gözdən getdigin acı fəraq oldu, vəli
Hər cəhətdən baxıram, vəslin vüsalı məndədir.

Turi-eşqindir vücudum, şol cəhətdən layəzal,
Hüsni-rüxsarın təcəllisi, camalı məndədir.

Çün dodağın kövsərindən bulmuşam abi-həyat,
Səlsəbilin eyniyəm, Xızrın zülalı məndədir.

Zülfü xalın şərhini mən yazaram hərfən bəhərf,
Çün bu mövzün nöqtənin hərfin misalı məndədir.

Ərşi-rəhmandır camalın zülcəlal aydır anı,
Ey üzün Qur’an, bəyani-zülcəlalı məndədir.

Zülf ilə qaşın hürufun yazamaz hər yazıçı,
Əbcədin buldum bu lövhün cimü dalı məndədir.

Bulmuşam mülki-Süleymanı və Qarun gəncini,
Fəzli, həqdən çün vüsalin mülkü malı məndədir.

Sorma eşqin qiylü qalın hər fəqihü şeyxə kim,
Bilmədi divani-eşqin qiylü qalı məndədir.

Ey müsəlsəl zülfünün eşqində sərgərdan olan,
Gəl mana sor kim, cavabı, həm sualı məndədir.

Ta itabın zövqünü bildirdi lə’lin camına,
Cənnətin şirü şərabı, xəmrü balı məndədir.

Laməkanın aləmin gər seyr edərsəm nə əcəb,
Cəbrailəm, ruhi-qüdsün pərrü balı məndədir.

Eşqə məhv oldu Nəsimi, ta ki, ayruq şəm’inə
Yanmasın pərvanə kim, eşqin kamalı məndədir.

Aşiqəm hüsnünə, eşqin ehtimalı məndədir,
Aqiləm, əmmarə nəfsin guşmalı məndədir.

Ta səmumun narına yandırmışam şeytanı mən,
Zill min yəhmumi-əshabun şimalı məndədir.

Fəzli-həqdən çünki mən əhləl-yəqini-cənnətəm,
Ta nəim firdövsi-məskunun sülalı məndədir.

Sidreyi-məhzur içində təlhi-mənzud uş mənəm,
Şol çəkilmiş zilli-məmdudun zilalı məndədir.

Çinü Maçinü Həbəş rüxsareyi-Rum üstünə,
Basmış zəngi saçın xeyli-xəyalı məndədir.

Sormuşam lə'lində cənnət irmağı ləzzatını,
Şəkkərin abü şərabı, şirü balı məndədir.

Məndən iç cami-müsəffa, saqiyi-şafi mənəm,
Eyni-hövzün, kövsərin abi-zülalı məndədir.

Vacibül-mümkün, vücudu biərəz cövhər mənəm,
Şəhpəri-zati-süfatın bimisalı məndədir.

Saili-eşqəm, gərəkdir cümlədən şafi cavab,
Sirri-xəttin həm cavabı, həm sualı məndədir.

Müshəfi üzündən açdı çünki zülfün, kirpigin,
Barəkallah, ol kəlamüllah falı məndədir.

Maziyü müstəqbəli bu eşqə təbdil etmişəm,
Bu dəmi arif bilir kim, eşq halı məndədir.

Baxmazam ənqayi-Qafa, qürbəti-lahuta mən,
Seyr ilə simurği-eşqəm, pərrü balı məndədir.

Ol nigari-nazənin siminbərü nəsrinbədən
Sərv qəddi, gül üzarı, xəttü xalı məndədir.

Əhli-irfana,m bilirəm xəlqi mən sima ilən,
İttisali-həqqü batil infisalı məndədir.

Çün Nəsimi adəmi bildi ilahın məzhəri,
Üştə rövşən məzhərin mədlul dalı məndədir.

Dürri-beyzadır vücudun, həq nişanı qandadır?
Zahirü batin çü sənsən, bəs filanı qandadır?

Laməkanidir vücudun qul-kəfa şəhrində uş,
Ol rüxün inna-ileyna bu bəyanı qandadır?

Kirpigin Tövratü Incilü Zəburun sirridir,
Dörd kitabın mə’nisi səb’ülməsani qandadır?

Ta libasi-nuri-ərrəhmanü taha geymədin,
Bilmədi kimsə səni kim, xanimanı qandadır.

Bilmişəm həqqi ki, mir’atıdürür fəxri-zaman,
Əqlə sığmaz bu hekayət, tərcümanı qandadır?

Ayəti-lövlak oxu, ey nüsxeyi-nun vəl-qələm,
Ta sana mə’lum ola canü cahanı qandadır.

Əhsəni-təqvim bil məktubi-sübhanəlləzi,
Üştə me’racı, ə’layi-laməkanı qandadır?

Surətin inna-hüdeynadır, camalın vəzzüha,
Mə’niyi Allahü əkbər kün-fəkanı qandadır?

Çün Nəsimi sirri İbrahimü Haşimdir bu gün,
Çün həqqə vasil olubdur, cismü canı qandadır?

Bəhri-mühitə düş kim, dəryayi-ə’zəm oldur,
Adəmdən olma qafil, neçin ki, adəm oldur.

Ruhülqüdüs dəmindən şol mürdə kim, dirildi,
Mə’nidə şöylə bil kim, İsəbni-Məryəm oldur.

Əsrari-küntə-kənzən hər sinə məhrəm olmaz,
Arif gərək bu sirrə, niçün ki, məhrəm oldur.

Kirpiklərin oxundan bir ox bu yana göndər,
Çünki, bu yarəlinin zəxminə mərhəm oldur.

Surətdə gərçi dilbər mə’şuqədir və leykin
Mə’nidə, filhəqiqə, aşiq dəxi həm oldur.

Qəmginə şadlıqdır yarın qəmi və leykin
Qəmginə əm bulunmaz yarın qəmi, qəm oldur.

Hər arifin kim, oldu ayinəsi camalın,
Aləmdə şək degil kim, Iskəndərü Cəm oldur.

Qalu bəlada zülfün canımla həmdəm oldu,
Yə’ni həmişə bil kim, ərvaha həmdəm oldur.

Cansız bədən nə bilsin ənfasını Məsihin,
Şol cana sor kim, anı bildi ki, dəm, dəm oldur.

Mənsur əgərçi həqdən rüsvayi-aləm oldu,
Andan ana nə qəm kim, rüsvayi-aləm oldur.

Ey Kə’beyi-həqiqi, lə’lin nə Zəmzəm olmuş,
Kim susamış, Nəsimi aydır ki, Zəmzəm oldur.

Cami-səfayı bizə sun, saqiya
Kim, susamış ol meyə əhli-səfa!

Şol meyi kim, günəş anın camıdır,
Şol ki, buyurmuş və səqahüm xuda.

Şol kim, anın şə'ninə oldu nüzul,
Sureyi-taha ilə həm həl-əta.

Ərşi-ilahi ilə içər müdam
Cam ələl-ərş meyi-istiva.

Kim ki, bu meyxanəyə basdı qədəm,
Bisərü pa olduvü sər, ya nə pa?

Şahidi-qeybi ilə oldu hərif,
Həstiyi-pəndardan oldu cüda.

Hur ilə cənnətdə məqam eylədi,
Ömri-əbəd bulduvü gördü liqa.

Xızr kimi içdi həyat abını,
Canü təni cümləsi oldu bəqa.

Ey çəmənü rövzə boyun sidrəsi,
Hüsnü məlahətdə rüxün müntəha!

Məskəni-ərvah saçındır, saçın,
Lə'li-ləbin canlara darüş-şəfa.

Zülfünü vəl-leyl oxuram hər gecə,
Üzünü hər ertədə şəmsüz-züha.

Gör bu Nəsimi nəfəsi kim, necə
Buyi-Məsiha kimidir canfəza.

Nəzmi-Nəsimi ki, dürərdir adı,
Gör ki, nə gövhər satar, olmaz bəha.

Çün bəyan oldu rümuzi-əlləməl-əsma bizə,
Rövşən oldu nükteyi-sirri-şəbi-əsra bizə.

Zərreyi-mehriz, əgərçi mətləi-nur olmuşuz,
Qətreyi-bəhriz və lakin mövc urar dərya bizə.

Zahida, biz çəkməziz imruzü fərda qüssəsin,
İbni-vəqtiz, lacərəm imruz olur fərda bizə.

Ümmuhatın zübdəsiyiz, həqqə məzhər düşmüşüz,
Şoylə zatız kim, bulunmaz bir dəxi həmta bizə.

Bilmişiz dünyayi-faninin nədir keyfiyyəti,
Rövşən olubdur xifayi-aləmi-üqba bizə.

Yar eşiyindən bizi, zahid, çağırma cənnətə,
Cənnətül-mə'va sizə, bu surəti-ziba bizə.

Çar ənasirdir bizi surətdə qıldıran qərar,
Yoxsa mə'nidə məqami-qürbi-həqdir ca bizə.

Mən ki, mə'ni gülşənində söylərəm bülbül kimi,
Həsrət eylər nitq ilə tutiyi-şəkkərxa bizə.

Cənnəti-didar imiş məqsudi-əhli mə'rifət,
Bir nəfəs ansız gərəkməz cənnətul-mə'va bizə.

Ey Nəsimi, qafil olma şol humayun kölgədən
Kim, qılır hərdəm təcəlli Qafdan ənqa bizə.

Ey kəlamüllah, əşya nitqi-həqdir sərbəsər
Kim, oxur inni ənəlhəq ayəti-nurən şəcər.

Ey kəlamüllaha vaqif, bil kəlamın sirrini,
Qalmıya məxfi zəmirin dər ülumi-xüşkü tər.

Anda kim, əyanü sabit gövhəri-laşey idi,
Fəzl idi kim, qıldı həqdən feyzi-ənvari-nəzər.

Şey'ilillah nuru vəchindən təala şanəhü,
Mərhəba, ya Mustafa, səllü əla xeyrül-bəşər.

Üzü vəşşəmsüz-zühadır, yanağı bədri-düca,
Yədi beyzadır əli, barmaqları şəqqül-qəmər,

Ol şahın adı ki, həqdən Əhmədü Məhmud idi,
Ta qəzadır, maməzadır, ta müqəddərdir qədər.

Çərxi-gərdun çakəri-dərgahın oldu daima,
Həm mürəssə don geyibdir, bağlanır zərrin kəmər.

Məcməi-məcmui-əsma oldu insanın adı
Kim, əhəd adından oldu şol müsəmma namvər.

Qaşları nəsri-minəllah, çün saçı fəthün qərib,
Kirpigi inna-fətəhna, çeşmi mazağəl-bəsər.

Firqətindən kanda gövhər cigəri qan olmasa,
Qanda qiymət tapar idi lə'lü yaqutü göhər?

Hər könül ki, həqqə vasil oldu, buldu e'tibar,
Hər gəda ki, şaha məhrəm oldu, oldu mö'təbər.

Seyyidü sadat mədhin söylədi seyyid Nəsim,
Tutiyi-şirinməqala nitqdən tökdü şəkər.

Ey kərimi-ləmyəzəl, ey xaliqi-pərvərdigar,
Həm sənin qatındadır sirri-nihanım aşikar.

Baxmagil hər rusiyahın cürmi-bie’dadına,
Əfv qıl, səndəndürür yüz min ki, ola bişümar,

Vayə vay ol vaxta kim, hər kəs mətahın ərz edər,
Mən qalam bivayəvü miskinü müflis, şərmsar.

Küllə şey’ün halikün lareybə illa vəchəhü,
Kim qalıbdır mən qalam dünyada həyyü payidar?

Ömr olunca səcdə qılsan, mində bir olmaz qəbul,
Anca mən dilxəstədən səhv ilə keçdi ruzigar.

Cahil idim, bilmədim şimdən geri cəhd eyləyəm,
Ol gedən getdi əlimdən, çünki yoxdur ixtiyar.

Çün əməldir azuğun bu yolda, cismin bəsləmə,
Tən qalır səndən geri, oldur qidayi-murü mar.

Bir hörümçək toruna asılmışam, ya dəstgir,
Alt yanım bamövcdəryayi-xətərdir bikənar.

Dünya hiçü malı hiçü ömrü hiçü sə’yi hiç,
Heç yerə niçindürür bu munca zəhmət, karübar?

Ey Nəsimi, və’z ilə çox və’z edərsən aləmə,
Hazır ol, fe’lin gözət kim, ömrə yoxdur e’tibar.

Həqiqət həqqi biləndir, verən varını yəğmaya,
Təraş olub nəməd geyən dolaşmadı bu sevdaya.

Səfasız sufiyi gör kim, haram der, dinləməz sazı
Ki, əhli-həq olan kişi, nə qəm, girsə kəlisaya.

Təkəbbür olma, ey münkir, vücudun bəhrinə qərq ol,
Həzaran mə’ni assi edər ki, qərq olan bu dəryaya.

Çıxıb mənbərdə, ey vaiz, yeyin gərm olma, əbsəm dur,
Daha məşğul idi şeytan ki, səndən zöhdü təqvaya.

Nəsimi, qəlbini pak et, cahan sevdalarından keç
Ki, mən əbdəm və ol mövla ki, nəsnə girməz araya.

Təvafi-Kə'bənin gərçi səvabı çoxdur, ey mövla,
Könül Allah evidir gəl, təvaf etmək anı ovla!

Yedi göydən dəxi ə'la könüldür billah, ey arif,
Könül içində buldular rümuzi-sirri-ma övha.

Olar kim, aşiqi-həqdir, nedərlər hurü qılmanı
Ki, huri, xüldü qılmandır tüfeyli-aşiqi-şeyda.

Gəl ey həqq istəyən talib, müqəddəs vadini teyy et
Ki, zəhmətsiz ələ girməz nə kim, istərsən, ey dana.

Vücudun şəhrinə, gir gör, könül Turunda can gəldi,
Münacat etdi həqq ilə, təcəlli gördü çün Musa.

Kişi hər nəyi kim sevsə, odur həm zikri-təsbihi,
Netəkim, daima Vamiq dilində zikridir Əzra.

Müyəssər olmadı vəslin Nəsimiyə, əya dilbər,
Xəyalın munis etmişdir, dünü gün zikrisən, şaha!

Bistü həştü sivü düdür ayəti-nitqi-xuda,
Görmüşəm eyni-əyanı, məndədir həq biriya.

On səkiz min aləmin mövcudu könlümdür mənim,
Bulmuşam dəryada gövhər eylə bilgil bariha.

Fərdü mütləqdir vücudum, bilgil, ey əhli-yəqin,
Şol səbəbdən vaqif oldum, keçdim əz hirsü həva.

Bistü həşt vəchimdə xəttim həq bəyanın eylər uş,
Bilgil, ey salik, bu sirri, uş güvahım istiva.

Dörd kitabın mə'nisi, şərhi bu bistü həştdir,
Həm dəliləm, həm bəyanam, həm süfatam xoşliqa.

Gər dilərsən həqqə vasil olmağa əz hər cəhət,
Aşiqü heyran ola gör kəndözündən biriya.

Hər nə kim, istərsən, indi, lövhi-dildən istəgil,
Ayəti-inna fətəhnadır dəlili-qul kəfa.

Çünki canın müşkilatı səndən oldu aşikar.
Bulmuşam Fəzli-ilah, əz mö'cuzati-Mustafa.

Çünki gördüm bu kitabı, kafü nunu oxudum,
Həm bu mə'ni üz veribdir könlümə işbu əta.

Mən bu sirri hər necə kim, gizliyə gördüm, vəli
Bihicab oldu vücudum, zahir oldu lafəta.

Ey Nəsimi, həqqi bildin, nəfsi əmmarəni qoy,
Anı dut kim, buyurar qafi-qənaət bifəna.

Həqqi bilən bilir bu gün eşqi hədisi-pürbəla,
Nəhvlə sərfi neylər ol, oldu şəhidi-Kərbəla.

Məntiq ilə məaniyi çox oxuma, bu gün yenə
Gəldi, gətirdi bigüman müdhəti-eşqi-həl-əta.

Rahəti-ruhi-canmısan, yoxsa pəri bu şəkl ilə
Kim, dünü gün oxur bu can surəti-lövhi-rəbbəna.

Qıldı nəzər bu canıma ol şəhi-layəzali-həyy,
Həyyi-qədimi-künfəkan gör ki, nədir bu gün sana.

Ol əzəli həbibi gör, ləmyəzəli təbibi gör,
Qıl canını fəda ana, gör bu süfatı basəfa.

Şirü şərabı ol verər canına bir nigah ilə,
Şirü şərabı içə gör, demə ki, ağudur mana.

Şəhd isə düşmənin əli, alma sunarsa ol balı,
İçmə əlində şəhdi sən, ol ki, xətadurur, xəta.

Möhnəti-eşqi-yar ilə gərçi çəkişsə can bu gün,
Günü budur, keçirməgil sən dünü günü pürbəla.

Çəkdi qəmin Nəsimiyi surət ilə məaniyə,
Can ilə kuşiş eylədi, buldu bu eşqdə səfa.

Hər kimin kim, rəhbəridir sidqü ixlasü səfa,
Oldurur darın içində bəndeyi-Fəzli-xuda.

Sadiqil-qövlül-əmini istərisən sən bu gün,
Çün biləsən sadiqül-qövlül-əmini-Müstafa.

Cövrünə səbrü təhəmmül eyləgil müşriklərin,
Necə kim, gördü Rəsul ilə Əliyyül-Mürtəza.

Şərbəti-maü təhuru istər isən, qəm yemə,
Dövr əlindən zəhr nuş et, çün Həsən xülqi-riza.

Gər bu gün bunda susuzluqdan olursan sən şəhid,
Yarın onda həşr olursan ba Hüseyni-Kərbəla.

Taətin fövt etmə, şeytan gərçi yüz nur göstərir,
Qiblədən döndərmə üzün, necə kim, Zeynəl-Iba.

Şol Məhəmməd Baqiri gör şər' bazarında kim,
Necə verdi hədyəni çün lütf ilə Allah ona.

Cə'fəri-Sadiq məratibin dilərsən, sadiq ol,
Sidq ilə bu yolda qul ol, bulasan mənzil ə'la.

Müddəi tə'ninə səbr et Museyi-Kazim kimi,
Həq bilir kim, həqq iləvü necə oldu macəra.

Gəl Əli, Musa Riza kimi həqin əmrini tut,
Necə kim həqdən gəlir canü könüldən çun riza.

Həm Təqi kimi vücudun mülkünü viran qılıb,
Bu fənada fani ol kim, bulasan mütləq bəqa.

Sirri-əsmadan xəbər bilmək dilərsən çün Nəqi,
Müttəqi ol, müttəqi ol, müttəqi ol, biriya.

Əsgəri kimi əgər nəfsin çərisin basasan,
Bigüman sənsən yəqin kim, maliki-hər dü səra.

Şol Məhəmməd Mehdi kimi ədl edib, cəhd edəsən,
Hiç gümansız məskən ola cənnətül-mə'va sana.

Ta ki, mən qıldım nəsihət uşbu xəlqə hər sözün,
Kim qəbul etdi bu və'zi, buldu həqdən çox əta.

Gecə-gündüz fikrü zikrim şahidü şəm'ü şərab,
Hər zəmanü hər nəfəsdir karü barım ahü va.

Şol Məhəmməd Mustafanın üz suyu çün, ya ilah,
Rəhmət etgil mən fəqirü asiyə ruzi-cəza.

Həm bu on iki imamın hörməti-həqqi üçün
Bu həva ilə məni yandırma fin-naril-zəla.

Ta səqahüm şərbətin içdi Nəsimi dər-əzəl,
Həqqi kəşf etdi rümuzi-sirri-əsmai-xuda.

Ey könül, hər bivücuddan can umarsan, nə əcəb!
Bikərəmdən lütf ilən ehsan umarsan, nə əcəb!

Bişəriətlər nə bilsin ənbiyanın şərtini,
Bitəriqətdən rəhi-ərkan umarsan, nə əcəb!

Bibəsərdən mə'niyi-şövqü kamali-mə'rifət,
Bixəbərdən söhbəti-irfan umarsan, nə əcəb!

Hər qayanın lə'li olmaz, hər dənizin gövhəri,
Hər sədəfdən lö'löi-mərcan umarsan, nə əcəb!

Çün əzazil əhsəni-təqvimə baş endirmədi,
Anda sirri-Kə'beyi-hənnan umarsan, nə əcəb!

Divi-naməhrəm ki, dutmaz ismi-ə'zəmdən xəbər,
Əhrimədən rəhməti-rəhman umarsan, nə əcəb!

Hiç imiş zöhdü vü zərqi, zahidin əfsanəsi,
Şol fəqihdən mə'niyi-Qur'an umarsan, nə əcəb!

Umma hər qəlbi zəğəldən aşiqin əsrarını,
Kafirin könlündə sən iman umarsan, nə əcəb!

Ey Nəsimi, bivəfadan ummagil rəsmi-vəfa,
Bivəfadan əhd ilə peyman umarsan, nə əcəb!

Çünkim gözümə gəlmədi hərgiz xəyıali-xab,
Saqi, gətir piyaləyi, doldur şərabi-nab.

Fürsətdürü gəlin bu gecə içəlim meyi,
Şəm’ ilə mütribü mənü sən, şahidü şərab.

Mə’mur tutun nişat ilə can mülkünü müdam,
Bu ömri-nazənin çü bilirsiz qılır şitab.

Zaye’ keçirmə fürsətin, aldanma bir nəfəs,
Bir gün ola pürab ola çeşmü könül xarab.

Hərgiz zəmanə kimsəyi xoşnud qılmadı,
Hər fikr namüvafiqü hər fe’l nasəvab.

Nacins söhbəti degil illa yedi damu,
Fəzl ilə eylə ya ilah, əcrən minəl-əzab.

Divi-rəcimi adəmə həmsöhbət etməyə
Sahibnəzər bilir ki, xətadır, degil səvab.

Həmdəm nə rəsm ilə ola Cəbrilə Əhrimən,
Munis nə vəch ilə ola tuti ilə qürab.

Gəl, ey hərif, şimdi nəsihət qəbul qıl,
Cövr eyləmə hərifə ki, hacət degil itab.

Zərraq zahidin içəlim qanını səbuh,
Məhrum sufinin qılalım bağrını kabab.

Aləmdə kim ki, fitnə qapısını bağladı,
Əlhəq zəhi səadətü vallah zəhi savab.

Çün qılmadı piyalə, Nəsimi, bu gün sana
Bir dustkamlar içəlim dolu-dolu qab.

Lövhi-Musa çün üzündən sıydı, açıldı niqab,
Sirri-tövhidi əyan etdivü götrüldü hicab.

İstiva sirrinə yol buldu üzündən ta ana,
Cəbrail çəkdi Büraqı mindi getdi çün üqab.

Qabü-qövseynə dəkin getdivü durmadı haman,
Gördü həqqin üzünü, gəldi dilindən bu xitab.

Ayəti-səb'ül-məsanini üzündən buldu çün,
Ümmətinə dönübən dedi: budur əsli kitab.

Kirpigin, qaşınla zülfün yeddi ayət oldu çün,
Bu yedi ayət sualına nə verirsən cavab?

Fatihə səb'ül-məsanin çün üzündən fəth olar,
Rövşən ola sənə bu elmi-lüdən ilə savab.

Üzünə qarşı sücudu etmədi divi-rəcim,
Dedi: Mən oddanəm, anı görərəm üştə türab.

Üzünə qarşı sücudu mana müşkil görünür,
Qılmadın səcdə ana, uş yeridir narü əzab.

Üzünə qarşı sücudun eylərəm, oldur murad
Kim, irə məqsuda canım, cəhd ilə etdi şitab.

Lə'linin vəsfini gər şərh eylər isəm bir-bir,
Dözməyə, sına qələm, ahım ilə yana kitab.

Çün Nəsimiyə bu Fəzl açdı hidayət qapısın,
Çalınız çəngü rübabı, içəlim nüqlü şərab.

Ey xəti-xalın kəlamüllah, həm ümmül-kitab,
Həsrətindən dideyi-üşşaq olubdur qərqi-ab.

Qəmzeyi-çeşmin işarət qıldı əhli-vadiyə,
Musiyə gəldi xitabi-lən-təranidən cavab.

Leylətül-əsrada vəlleyl endi zülfün şə’ninə,
Ayəti-vəşşəms vəchindən göründü afitab.

Ey mənim eynimdə rüxsarın çü nuri-ləmyəzəl,
Dil saçın hər tarəsindən aləm üzrə mişki-nab.

Aləmi qıldı münəvvər nuri-vəchin ta əbəd,
Lövhi-məhfuzunda rövşən oldu həm yövmil-hesab.

Zarü bimaram, əgər təşrif qılsan bir nəzər,
Xaki-payın məqdəminə süzəyim gözdən gülab.

Ol xətu xalü rüxü zülfün hesabın qılmağa,
Hacibi-eşqə müyəssər oldu həqdən ehtisab.

Surətin ayineyi-eşq oldu əhli-vəhdətə,
Lövhi-məhfuzunda Qur’an oldu hikmətdən kitab.

Ey Nəsimi, başını qoy ol cənabi-həzrətə,
Qoymağıl əldən vüsalın ta əbəd, əz hiç bab.

Çeşmeyi-heyvan mənəm, məndədir abi-həyat,
Dur necə bir yatəsən fiz-zülmətil-məmat.

Cənnətü hüri mənəm, Kövsərü Tubi mənəm,
Nariyü nuri mənəm, həm susuzam, həm Fərat.

Çərxi-müəlləq mənəm, faili-mütləq mənəm,
Həqq iləyəm, həq mənəm ayət ilə bəyyinat.

Bağ ilə bostan mənəm, tazə gülüstan mənəm,
Kafirə tufan mənəm, mö'minə Nuhün-nəcat.

Qibləvü iman mənəm, surəti-rəhman mənəm,
Lövh ilə Qur'an mənəm, həm orucam, həm səlat.

Höccəti-bürhan mənəm, Musiyi-Imran mənəm,
Yusifi-Kən'an mənəm, Misr ilə qəndü nabat.

Həm yetirən, həm yetən, həm bitirən, həm bitən,
Cümlə mənəm, cümlə mən, dəhr ilə həm kainat.

Gənci-nihan uş mənəm, kövnü-məkan uş mənəm,
Cümlədə can uş mənəm, vacib ilə mümkünat.

Şəm' ilə pərvanəyəm, bəhr ilə dürdanəyəm,
Məscidü meyxanəyəm, mə'bəd ilə sovmənat.

Ərşi-münəqqəş mənəm, çar ilə nöh, şeş mənəm,
Həm həsənat işlərəm, həm qılıram səyyiat.

Bay ilə yoxsul mənəm, yolçu ilə yol mənəm,
Kim ki, bu mənsubəyi oynamadı, oldu mat.

Mülk ilə malik mənəm, mühyüvü halik mənəm,
Mürşidü salik mənəm, abidi-əsnamü lat.

Qaf ilə ənqa mənəm, ab ilə səqqa mənəm,
Cümlədə həqqa mənəm, üştə tanıq şeş cəhat.

Həşr ilə məhşər mənəm, sahibi-kövsər mənəm,
Həm gəzərəm dərbədər, əhli-zəkatam, zəkat.

Əhsəni-təqvimə çün qılmadı şeytan sücud,
Uyma ana, səcdə qıl, lə’n et, anı nara at.

Kim ki, dilaram ilə ömrünü sərf eylədi,
Hər günü eyd oldu eyd, hər dünü qədrü bərat.

Mö’minə mö’mindürür güzgü, arıt güzgünü,
Ta görəsən sən səni, zat olasan, həm sifat.

Nəfsini hər kimsə ki, tanımadı, şübhəsiz,
Arifi-rəbb olmadı, yetmədi ol bisəbat.

Kəndü vücudunda çün buldu Nəsimi səni,
Bildi yəqin kəndidir məzhəri-ənvari-zat.

Əya lətifi-zəmanə, əya xülaseyi-zat!
Eşit bu pəndimi, tut kim, bulasan anda nəcat.

Şəriət əmrini mürşid edən təriqətə gir,
Kim, ol təriqət ilə sən içəsən abi-həyat.

Həqiqət əhli olasan, görünə hər nə ki, var,
Dəmində mə’rifətindən buluna çox həsənat.

Bu gün duruş özüniçün, eyi əməl edə gör,
Yarınkı mə’rəkələrdə behişt ola ərəsat.

Səni diri tutanı sən bilirsən əlbət əziz
Ki, hər nəfəsdə bulasan eyicə qədrü bərat.

Bu gün bu dari-fəna bir nəfəsdürür, biliniz,
Bu bir nəfəsdə qılın səd həzar sovmü səlat.

Rəsuli-səyyidi-kövneynə mö’min ayinədir,
Bü mö’min ayinəsində göründü cümlə sifat.

Fəna məmat ilə nəfsin bu üçü bil gecədir,
Bəqa həyat ilə gündüz, bu əql ilə mir’at.

Bəqa elindən irişdin, fənada elm oxudun,
Bu elm ilə özünü bildin ömrünə bərəkat.

Bu elmi oxuyuban bilmədinsə kəndözünü,
İlət şu dəftərini tez bazarda bir pula sat!

Həzər qıl, anla səni, sən özünü bilməkçin,
Saqın ki, cənnət üçün olmaya yerin dərəkat.

Dilərmisən ki, yəqin əl verə təcəllilər,
Gözün ayırma özündən, bu nəfsini oda at.

Qaçan ki, qətl edəsən, nəfsini oda atasan,
İrişə ayəti-ünzür, dönə həyata məmat.

Dürüş bu mə'rifətin xirqəsinə cəm' ola gör,
Dağılma dörd yana aşiq ki, qandasan heyhat?

Gətirdi zatını doğdu o yuca aləmdən,
Bəzəndi nuri-təcəlli, sürüldü çün zülmat.

Olur ki, təşnədilə sözlərimdən irdi həyat,
Bəriyyə içrə qalanlara mə'tə fis-sələvat.

Dilimdən irdi, qələmdən töküldü kağıza dürr,
Dirildi cümlə lətayif, cəvahir odlu səbat.

Bu mə'rifət, bü təriqət, həqiqət oldu tamam,
Şəriət əmri üçün ver Məhəmmədə sələvat.

Bu mə'rifət sözünün sirrini bəyan edəvüz,
Əya lətifi-zəmanə, əya xülaseyi-zat!

Bir qətrə bəhri-həqiqət sözünü dərc edəlim
Ki, bir təriqətə min dürlü göstərir hərəkat.

Bu gün Nəsimi sözünün həlavətinə irən,
Həzar səcdə qılır tuti birlə qəndü nabat.

Ey pərtövi-diyari-rüxün nuri-kainat
Kim, sünbülün səlasili həllali-müşkilat.

Yarəb, sifatını necə verim bu aləmə,
Gər sən mənimlə olasan, ey dürri-bəhri-zat.

Etdi nüzul şə’ninə göydən kəlami-həq,
Şərhü bəyanü surətin ismi tənəzzülat.

Nari-cəhimə saldı məni hicri-firqətin,
Musayi-ləntərani kimi istərəm nəcat.

Xanda bulam təriqi-vüsalın məhəbbətin,
Mən binəvaya olmasa gər səndən iltifat.

Məndən zəkati-hüsnünü, ey şah, əsirgəmə,
Daim qəni zəkatın umar vacibüzzəkat.

Kəşf oldu sirr xali-xətindən Nəsimiyə,
Elmül-əruz içində məfailü failat.

Ya rəsuli-fəxri-aləm, seyyidi-zatü sifat!
Bəhri-zatın gövhərisən, həm sifatın eyni-zat.

Qüvvəti-zati-əzəl daim səninlə müstəqim,
Hikməti-darül-əbəd qaim səninlə mümkünat.

Məzhəri-sirri-həqayiq mətləi'-nuri-əzəl,
Məzhəri-kani-dəqaiq, mənbəi-hər mö'cüzat.

Əhmədü Mahmudü Qasim, şahü sultani-rəsul,
Küntə kənzin mə'dəni, həm kəşfi-həlli-müşkilat.

Vəsfini vənnəcmü vəşşəmsü təbarək söylədi,
Şə'ninə tahavü yasin gəldi həqdən bəyyinat.

Surəti-ənvarının hər zərrəsi şəmsü qəmər,
Türreyi-ənbərfəşanın leylətül-qədrü bərat.

İzzü iqbalından ötrü oldu tərkibi-cahan,
Yerü gög, insü məlaik, əslü fər'i-kainat.

Gövhəri-dəryayi-eşqin qətrəsindəndir yəqin,
İsmü rəsmü fövqü təhtü dörd təbaye, şeş cəhat.

Ey mütəhhər gəldigin dəm çün vücuda anədən,
Kafirin deyri yıxıldı, titrədi latü mənat.

Elm ilə helmü həyavü tövbəvü zöhdü vərə'
Xəlqə fəzlindən irişdi rövzəvü həccü zəkat.

Hər ki, imanın yəqin etdi sana, ey pakdin,
Layəzal oldu həmişə, cavidan əndər həyat.

Mö'mini-sadiq, müvəhhid canfəşan oldu sana,
Gərçi müşrik şübhədən pak olmadı ol bisəbat.

Ya şəfiül-müznibin, rəhm et Nəsimiyə bu gün,
Hasilim iki cahanda sənsən, ey pakizə zat!

Kövsərin eynindən axır çeşmeyi-abi-həyat,
Zülmətin dövranı keçdi, aradan getdi məmat.

Daima həq söylərəm, həm Fəzli-həqdən gəlmişəm,
Həq mənəm, həq məndədir, həm ayət ilə bəyyinat.

Tubiyəm, həm səlsəbiləm, həm mənəm cənnatü hur,
Həm şərabam, həm sərabam, həm susuzam, həm Fərat.

Həm mənəm Musilə ataş, həm mənəm anəstünar,
Həm Kəlimin Turiyəm mən, həm təmənna, həm nəcat.

Gənci-pünhanam, bu sirri mən nə pünhan söylərəm,
Cismü canam, kün fəkanam, vacibəm, həm mümkünat.

Şəm'iyəm, həm aləmin şəm'inə mən pərvanəyəm,
Misr came' uş mənəm, həm mə'bəd ilə sövmənat.

Hə mənəm Musiyi-Imran, həm mənəm həqdən kəlam,
Həm mənəm Fəzl ilə rəhman, şəkkərəm, qəndü nabat.

Həm mənəm insü mələk, həm adəmi-xaki ilən,
Bulmuşam həm ərşi-rəhman, cümlə oldum kainat.

Lövhi-məhfuzam, hürufam, əbcədəm mən, həm heca,
Həm Xəlilə Kə'bə oldum, həm mənəm sövmü səlat.

Adəməm, həm Adəmə qıldım sücud ixlas ilə,
Tutmadı ol əmri, şeytani-ləini nara at.

Həm mənəm həşr ilə məhşər, həm mənəm yovmül-hesab,
Həm bu yövmün hacəti, həm olmuşam əhli-zəkat.

Mö'minin qəlbi, səfası, həm mənəm ruhülqüdüs.
Həm sifatımdan olubdur aləmə nuri-nəcat.

Nəfsini hər kimsə kim, tanıdı, ol həqqi bilir,
Arifi-rəbb oldu ol kim, tanıdı buldu səbat.

Bildigim sənsən, Nəsimi, səndən özgə kimsə yox,
Hər yanadan bildi sənsən məzhəri-ənvari-zat.

Kim büsati-eşq içində oynadı şətrənci-zat,
Otuz iki istivadır mə'ni içrə kainat.

Rast oyna sən dəxi həm evlərini yaxşı gör,
Ta müdam olmayasan eşq evində şaha mat.

Mat olsa bu vücudun, eşq evin xali qılar,
Eşq evin kim qıldı xali, ta əbəd tapdı məmat.

Külli-şey' oldu mühitü ta həyati-cavidan,
Yəxrücül-meyyit oluban tapdı ol zatü sifat.

Çün sifatın zat oldu, qıldı ol mə'nil-hüruf,
Surəti-vəchin içində oxuram mən eyni-zat.

Zahirən qıldın niyyət sən dil ilə, yoxdur könül,
Niyyətin təsdiq olunmaz, ol namazın lasəlat.

Niyyətin ola dürüst kim, mənliyin başdan gedə,
Mənliyin kim getdi isə məhv oldu səyyiat.

Ey Nəsimi, salik oldun, mə'rifət yetdi sana,
Ol nisabi-mə'rifətdən müstəhəqqə ver zəkat.

Divi-rəcimə, ey könül, etmə dəxi mütabiət,
Tanrı sözün eşit, derəm, sidq ilə qıl mülazimət.

Hər kişinin ki, əsli çün div ola, ol eşitməyə,
Min deyəsən qulağına nükteyi-pəndi-moizət.

Söz bilə cahilin dili alim önündə lal ola,
Mə’rifəti nə söyləyə olmayan əhli-mə’rifət?

Mən ərəfə çün oxudun, Tanrıyı tanıdın isə,
Özünü bil ki, Tanrıdan zatına var münasibət.

Çünki özünü tanıdın, həq sənə kərrəmna dedi,
Gər biləsən həqiqəti, qılmayasan ənaniyət.

Yaxşılıq eylə sən, sənə yaxşılıq eyliyə xuda,
Aqibət əslinə qılır xeyr ilə şər müraciət.

Çünki, Nəsimi sözlərin əhli-məani yey bilir
Kim, bu təriqi-mə’niyi bilmədi, bilmədi lüğət.

Ey camalın məzhəri zatü sifat,
Səndə zahir oldu rəsmi-fe’li-zat.

Ay üzündür həq təala güzgüsü,
Pərtövi-çöhrəndən oldu kainat.

Müshəfin övraqü ayatı üzün,
Qaşların mehrabına qıldım səlat.

Dilədim zər ləblərindən, ey nigar,
Şər’də buyurmadı lə’lə zəəkat.

Ey Nəsimi, “Cavidani-namə”dir
Həlli-əşkali-cəmii-müşkilat.

Aç bu sərapərdəyi gir içəri, cana bax,
Gör nə təcəlli qılur pərtövi-canana bax.

Dost gözündə görüb sürməyi könül gözü,
Eşq ilə ondan dönüb təl’əti-sultana bax.

Əksini gör ol üzün istər isən görməyə,
Can ilə canan gözün, ayineyi-cana bax.

Açdın isə həq gözün görmək üçün həq üzün,
Küfrü əlində kimi şö’leyi-imana bax.

Sövmiəvü məscidə guşənişin oluban,
Kafiri kisvət geyib, sən bu müsəlmana bax.

Gözlərinin ayəti əksi əyan göstərir,
Dilər isən görməgə surəti-insana bax.

Niçün əgər şir isən meşədə zinharəsən,
Murçələrdən olub dedigi mərdanə bax.

Surəti-şirazidən gözünü ayırma kim,
Eylə ki, bu sən deyən dövləti-pünhana bax.

Canavü həm cahana versə əgər vəslini,
Al, ey Nəsimi, anı, qiyməti-ərzana bax.

Fəzlinə bel bağladım, ya vahidü fərdü əhəd!
Cümlənin mə’budu sənsən daima həyyül-əbəd!

Oxuram ismində bismillahir-rəhmanir-rəhim,
Ey sifatındır sifati-qül hüvəllahü əhəd.

Əvvəlü axır hüvəllahil-ləzi sən la-yəmut,
Zahirü batin hüvəlbaqisən, Allahüs-səməd.

Ləm yəlid sənsən oxurlar, ey vələm yuləd, səni,
Ləm yəkun zatü sifatındır ləhü küfüvən əhəd.

Ol zaman kim, lütf ilə bir gövhərə qıldın nəzər,
Zahir ol gövhərdən oldu cümlə əşya laədəd.

Kaf ilə nundan yaratdın on səkiz min aləmi,
Qüdrətindən ərbəin gündə tamam odlu cəsəd,

Seyyidin könlündə sənsən, səndən özgə nəsnə yox,
Həm dilində bu fəqirin daim aydır ya əhəd.

Ey xətin səb’ülməsani, ey ləbin mai-təhur,
Vey camalın pərtövündən sərbəsər aləmdə nur.

Və’deyi-yövməl-qiyamət endi həqdən arifə,
Ruzi-həşr oldu, çalındı vəhdətin günündə sur.

Xilqətin şanında münzil oldu əmri-əscuda,
Bilmədi şeytan bu rəmzi, şükrünü qıldı qəyur.

Şübhədən arınü əhli-sacid olgil, səcdəyə,
Leysə məqbuləl-səlatül-qəlb illa bilhüzur.

Xatiri-cəm’iyyət ol zülfi-pərişanındadır;
Şol cəhətdən olmadı xali xəyalın əz xütur.

Eynimə gəlməz cahanın zülməti bir şəmməcə,
Çün iki aləmdə sənsən mərdümi-eynimdə nur.

Həmdilillah kim, Nəsimi buldu yarın vəslini,
Fariğül bal əz qəmi-dünyavü min həşrən nüşur.

Ey saçın zilli-ilahi, vey rüxün Allahu nur!
Rövzənin sərvi boyundur, indəha cənnatü hur.

Ey sifatın qülhüvəllah, vey camalın fatihə,
Üştə Fürqan, üştə Tovrat, üştə Incilü Zəbur.

İstivasıdır saçın inna hüdeynahüs-səbil,
Cənnət anındır ki, qıldı şol sirat üzrə übur.

On səkiz min aləmin ayinəsidir surətin,
Kim ki, şol mir'ati buldu, oldu min-əhli-sürur.

Adəmin vəchidir Allahın kitabı, uş kitab,
Ey kəlamüllahə münkir xəf minəllahül-qəyur.

Küntə-kənzin pərdəsindən qafirüz-zənb oldu faş,
Zahid istiğfara gəldi, hər dəm aydır: Ya qəfur!

Aləmül-qeybin vücudu kainatın eynidir,
Ey şəhadətdən xəbərsiz, caəna yövmən-nüşur.

Qəhrü lütfün illəti mə'nidə vahiddir, vəli
Bilmədi şeytan bu tövhidi, əhəddən düşdü dur.

Eynü şinü qafa bax, yarın camalın anda gör,
Qül təbarək ya müsəvvər, leysə fiha min fütur.

Qopdu hüsnündən qiyamət, ey hesabın yanılan,
Uyxudan dur kim, irişdi və'deyi-mən fil-qübur.

Faili-mütləqdən özgə nəsnə yoxdur arada,
Gər sən idrak eyləməzsən, bil ki, səndəndir qüsur.

Mö'minin qəlbidir, ey sahibdil, Allahın evi,
Leysə məqbulüs-səlatün əbdə illa bilhüzur.

Kim ki, Əyyubun bəlasın sevdigindən çəkmədi,
Geymədi məhbub əlindən xəl'əti-əbdiş-şəkur.

Ruhi-qüdsidir Nəsiminin həqiqət sözləri,
Gər Məsiha tək diriysən, yatma ki, çalındı sur.

Üzündür lövhi-Musa, qamətin Tur,
Xətin Fürqan, üzündür rəqqi-mənşur.

Kəlimüllahın əsli sivü dü hərf,
Camalın lövhü üzrə oldu məstur.

Saçındır küfrümüz, üzündür iman,
Nə küfr, iman ilən zülmat olur nur.

Camalın küntə kənzidir, əya can,
Mənim könlüm xarabın qıldı mə’mur.

Görən sənsən mənim eynimdə, yarəb,
Nə nazirsən, nə mənzərsən, nə mənzur?

Boyun tuba, dodağın abi-heyvan,
Rüxündür cənnəti-ədnü xətin hur.

Nəsimi sözünə qılın tətəbbö,
Zi Fəzl oldu bu əbdi-Fəzlə dəstur.

Yəqin, yarəb, üzündür rəqqi-mənşur,
Məhəmməd şər'i andan oldu məşhur.

Təvaf əmr oldu çün Beytül-ətiqə,
Rəsul ol evi çün xoş qıldı mə'mur.

Sifatındır, bilirəm Kə'bə mütləq,
Ziyarət eyləyənlər oldu məğfur.

Saçın həblülmətindir, surətin həq,
Hidayət şəm'i üzün, ərz edər nur.

Yanağın hazihi-cənnati-ədnin,
Üzündür kəşfi-müşkil, cənnəti-hur.

Sənin məstanə eynin sağərindən
Rəvandır səlsəbil, uş məstü məxmur.

Məsiha nəfxədir şirin dəhanın
Ki, səhhət bulur andan sorsa rəncur.

Qaşınla kirpigin, mişkin saçınla
Vücududur Süleyman, eynidir mur.

Ənəlhəq dedi, zülfün darlığından,
Çıxardı gögə fəryadını Mənsur.

Sifatın batini eylədi rövşən
Ki, aləm varına olmadı məğrur.

Sən əhsənsurətə inkar edənlər,
Əzazildir ki, düşdü tanrıdan dur.

Nəsimiyə təcəlli qıldı qəmzən,
Gözünə nurü könlün etdi məsrur.

Gərçi eynimdən, nigara, surətin pünhan degil,
Firqətindən yanaram kim, vəslilə həmsan degil.

Ey könül, nadan qatında razını faş eyləmə,
Əhli-irfandır bu razın məhrəmi, nadan degil.

Cəhlini rəf' eylə, ey zahid, Allahı tanı kim,
Cəhl imiş, cəhl ol mərəz kim, qabili-dərman degil.

Nəfsini öldürməyən gər Bijənü Söhrab isə,
Pəhləvan olmaz adı, həm Rüstəmi-dəstan degil.

Ey könül, darüssəlamı dünyanın ləzzatına
Satma kim, şol bisəbatın dövrü cavidan degil.

Xızr ilə Isa, nigara, buldu vəslindən həyat,
Lə'lini kimdir deyən kim, çeşmeyi-heyvan degil?

Həq sevər xubu, nə mə'nidən mən anı sevməyim,
Sevməyən şol nəsnəyi kim, həq dedi, insan degil.

Surətin eşqi kimin kim, qılmadı canında kar,
Şol gəzən cismindəki mə'nidə cindir, can degil.

Gərçi asandır der, ey can, eşqini hər bixəbər,
Kim ki şol sevdaya düşdü, bildi kim, asan degil.

Arizumənd oldu könlüm vəslinə yarın, vəli
Buyruğu təqdirə keçməz, hökmünə fərman degil.

Eşq ilə meydana möhkəm ər gərəkdir kim, girə,
Hər hünərsiz hümmətisüstün yeri meydan degil.

Ey ki, sultan olmaq istərsən fəqir ol kim, yəqin
Kim ki, sultan oldu dərviş olmadı, sultan degil.

Gərçi yegrəkdir vəfadan səndən, ey dilbər, cəfa,
Sən vəfalısan, vəfa qıl kim, cəfa çəndan degil.

Ey mənə hərdəm deyən kim, baxma xubun üzünə,
Aşiqin axır gözü var, ol qədər nadan degil.

Tutma şeytani-rəcimin qövlünü, rəhmana uy
Kim, uyan şeytana cindir, tabeyi-rəhman degil.

Eşqilə can yoxdur ol bimə'rifət heyvanda kim,
Surətin nəqşində daim valehü heyran degil.

Ey Nəsimi, çün yəqin imanımış, iman yəqin,
Hər şəhadət kim, yəqindən tışradır, iman degil.

Bu cism evinə, taliba, seyr edərək çün can gəlir,
Bu evdə baqi sanma kim, bir-iki gün mehman gəlir.

Vardır sualım çün sana, vergil cavab, qalma dona:
Bu ruhi-qədimi mana, degil ki, sən qandan gəlir?

Çün xakdan edər səfər, mə'dən, nəbat olur şəcər,
Rövşən görər əhli nəzər k'ol[1] tö'meyi-heyvan gəlir.

Çün tö'meyi-heyvan olur, o da ki, insü can olur,
İnsana vasil olmağa bidəstü pa pərran gəlir.

Çün tö'meyi-insan olur, ol ruh, ol heyvan olur,
Ətü dəri, iligü qan pəs tö'meyi-insan gəlir.

Biixtiyarü biədəd gəlir-gedər kim, vəsl ola,
Ta vəsl olunca adəmə çəndan gedər, çəndan gəlir.

Çün adəmə vasil olur, məqsud ana hasil olur,
Ol nütfədən insan olur, lö'lö kimi qəltan gəlir.

Çün tö'meyi-insan olur, insanü cismü can olur.
Pəs ruhi-insani olub, çün surəti-rəhman gəlir.

Ol aləmi-itlaqdan, ol şəmsi-din xəllaqdan,
Ayrıldığiçün zərrəvəş bu dünyaya nalan gəlir.

Bu aləmə çün kim gəlir kəsbi-kəmalü mə'rifət
Etməz olursa dəmbədəm, nadan gedər, nadan gəlir.

Çün min lüdən elminə ol olmadı alim, ey fəqih,
Əhli-nəzər önündə ol bir cahili-hirman gəlir.

---

[1] Ki ol.

Şol cahilü müşrik olan, ol kafirü əbtər olan,
Dəccala oldur xər olan, görməz ki, ol canan gəlir.

Çün mə'rifətdən xalidir, xali şu qiylü qalidir,
Ol hər zaman bu ərsədə üryan gedər, üryan gəlir.

Hər kim kitabi-nəfsinə olmadı alim, ey həkim,
Anın vücuduna ədəm dersəm, sana yalan gəlir.

Zərrati-aləm oldu çün ol şəmsi-dinin məzhəri,
Ol müshəfi-cananiyə əşya qamu tibyan gəlir.

Ol zati-paka masəva ayati-müshəfdir, vəli
Bu ənbiyavü övliya bil, filməsəl ünvan gəlir.

Ol müshəfi-ba bəsmələ insani-kamildir kim ol,
Hər yerdə bilgil kim, yəqin ol əbbi-insü can gəlir.

Çün Müştəri, Mərrixü Şəms növbətlərin edə tamam,
Zöhrə, Ütaridlə Qəmər, pəs dövr ilə Keyvan gəlir.

Qalu bəladə "la" deyən canlar ki adı cindürür,
Ol bibəsər bu dünyadan bican gedər, bican gəlir.

Həq sözə insaf eyləsən, ayinəni saf eyləsən,
Şunlar ki, bikr oldu yəqin, övrət gedər, oğlan gəlir.

Hər kim ki, adəmzadədir, etməzsə insana sücud,
Surətdə adəm, mə'nidə şeytan gedər, şeytan gəlir.

Şol naxələf ki, adəmə gördün kim olmadı xələf,
Nabaliğ ol oğlandurur, andan bəsi üdvan gəlir.

İsmi cəlalın məzhəri olan kişidə daima,
Xülqi-həsən, lütfü kərəm, həm fəzl ilə ehsan gəlir.

Gör kim vücudi-adəmi bə'd əz fəna nəş'ət verib,
Hər üzvü bir dürlü giyah olub qamu yeksan gəlir.

Məhbub ilə məhbubənin lə'li-ləbü dürri-dişi,
Sünbül saçı, arizi gül, yasəminü nö'man gəlir.

Xalü xətü zülfü anın can müshəfidir oxuram,
Gördüm mühəqqəq biqubar ol nəsx ilə reyhan gəlir.

Ol can ki, safi-dil olub keçdi cahandan, ey sənəm,
Billahi, ol hər dəmbədəm həmçün güli-xəndan gəlir.

Əhli-fəna olsa fəna, iqlimi-həftin varına,
Bil kim, həqiqət söz durur kim, Mehdiyi-dövran gəlir.

Şol kim fənadan filfəna buldu olub sahibqıran,
Ana bu xəlqin əksəri ənsarü həm ə'van gəlir.

İqlimdə bil fani olan əhli-sülukun zümrəsi,
Daravü Bəhmən, Keyqubad ya Xosrovü xaqan gəlir.

Bu kəsrətin ayatını ol vəhdətə ir, görü gör,
Müşrikdir ol kim, ta əbəd bihəddü bipeyman gəlir.

Bir zərrəyi ayrı görən ol şəmsi-dindən, ey qəmər,
Bil, vəhdətin iqliminə bidinü biiman gəlir.

Hər bir ülumun gərçi kim, vardır məqalı azü çox,
Elmi-lüdənni oxuyan dərviş gedər, sultan gəlir.

Bil bu ülumi-nəş'ətin payanı yoxdur, taliba,
Çünki bu bəhrin qətrəsi dəryayi-bipayan gəlir.

Hər salikin kim, ayağı mərdanə basmaz bu yola,
İmanidən ayrı düşər, ol kafirü şeytan gəlir.

İmanın əhli daima şövkətdədir, bilməzmisən,
Şirk əhlinə gör kim, səza matəmlə hüzn, əfğan gəlir.

Zər kimi qəlbin safi et, sən gövhərin sərrafısan,
Ol adilin fəzli ilə çün ortaya mizan gəlir.

Oxu kitabi-nəfsini, dilinlə eynin sağ ikən,
Qoyma bu günü yarına, sonra sənə peşman gəlir.

Əhli-fəsada çox təəb edərsə nola fəzli-rəb,
Əhli-yəminiz, beytimiz ağ oldu, coşan xan gəlir.

Ol şəmsi-canın üzünə bax, rövşən on dört xətti gör,
Oxu ki, sən gör Müştəri həmçün məhi-taban gəlir.

Sən bu siyərdən keç dəxi, gəl, ey təfərrüc əhli kim,
Çünkim, bu rikin siyhəsin gördün ki, biimkan gəlir.

Hər nə imarət eyləsən bil, ey mühəndis kim, yəqin
Edər xərab ol dəm anı, bu dünyaya viran gəlir.

Bu lövnü rəngü buyu qo fani olub gör kim, anın
Şəmsi-rəvan hər zərrədən birəngü biəlvan gəlir.

Rəng ilə bu əlvan odur, hər cism içində can odur,
Rövşən bu kim, ol şəmsi-can hər zərrədə pünhan gəlir.

Çövkanına can zülfünün top eylə başü canını,
Çün ol şaha oynamağa iki cahan meydan gəlir.

Gah adəmü xatəm olur, gah Iseyi-Məryəm olur,
Gəh Nəmrudü Fir'on olur, gəh Musiyi-Imran gəlir.

Çün vəchi-həqdən bixəbər oldu xəvaric zümrəsi,
Der fəzrəbu fövqəl-ənuq, çün ol Şəhi-Mərdan gəlir.

Sən adəmin vəchinə dut vəchin, ana eylə sücud,
Sil bu siyəldən gözünü kim, biədəd peşman gəlir.

Ey mə'rifət zərrai, gəl saç danənin varın yerə,
Fəzli-xudadan aləmə çün rəhməti-baran gəlir.

Qıldı gədayi müğtənim fəzli-xudanın ne'məti,
Ey divü xənnasü həsud, gör kim, ana eyşxan gəlir.

Tövhidi iki görənə, gözsüz qulaqsız əhvələ,
Bilsin ki, cümlə kainat bir məzhəri-yəzdan gəlir.

Bundan da ayrı bir kamal olurmu kim, ol zülcəlal,
Aydır ki, mən sənsən, həmin şeytana ol üsyan gəlir.

Budur, səbəb qəhr etməyə şeytanı ol lütf issi kim,
Bu cavidani ne'mətə gör kim, necə küfran gəlir.

Vəhdət meyindən sun müdam, nuş eylə, cana, fariğ ol,
Gördün ki, ol saqiyi-can huri-nəsəb qılman gəlir.

Ə'mali-saleh, mə'rifət elmi-lüdəndir kəsb edən,
Bimə'rifət adam haman əhməq gedər, hümqan gəlir.

Gəl dürri pakü saf olub, dal vəhdətin dəryasına,
Gərçi Ədəndən bişümar dürrü gühər, mərcan gəlir.

Sən ey müvəhhid, fariğ ol, cəngü cidalın kəs anın,
Cəngü cidalı gedirər çün höccətü bürhan gəlir.

Ruhül-qüdüs kim, hər nəfəs verdikcə min bərzəx keçər,
Ol bibəsər ə'ma sanır kim, bu sözü asan gəlir.

Gəl, ey Hüseyni, same' ol, sən ruhi-qüdsidən yana,
Gördün yəqin çün hər nəfəs avazeyi-Qur'an gəlir.

Sal bürqəyi üzündən, əya surəti-rəhman,
Tərh eylə gümani,
Hər kim ki, camalın görə, ey xosrovi-xuban,
Qurban edə cani.
Fariğ degiləm şövqi-rüxündən, dünü gün mən,
Yanmaqdayam, ey dost!
Yə’qubsifət qılma məni zarü pərişan,
Ey Yusifi-sani!
Aramım ilə, əql ilə imanü dilü din,
Kimdir, sənəma, sən!
Hər kim ki, gətirməz xət ilə xalına iman,
Kafir derəm ani.
Rəhm eylə, əya sərvəri-xuban ki, fəqirəm,
Sən şahi-qənisən,
Ol xalü xətin aşiqə həm qiblə, həm iman,
Ey bəhri-məani.
Hər kim ki, səni həq deyibən səcdəyə enməz,
Inkara düşübdür.
Qıl həzrətinizdən anı mərdud çü şeytan,
Ol üzü qərani.
Pərvanəsifət şəm’i-rüxün narına yandı,
Ey dust, Nəsimi.
Rəhm eylə ana, lütf elə, ey sərvəri-xuban,
Yandırmagil ani.

Saldı xəbəri-hüsnünüz, ey sərvəri-xuban,
Qovğaya cahani,
Rövşən qılır ənvari-rüxün, ey məhi-taban,
Kövn ilə məkani.
Şayəsteyi-dərgahi-həq olmaq dilər isən,
Cuyayi-həq ol kim,
Hər kim ki, həqi tanımadı, olmaya insan,
Heyvan degil ani.
Insanı görün kim, necə bu tinəti qıldı
Həq öz kərəmindən.
Ziba yaradıbdır, sənəma, xaliqi-sübhan,
Bu cism ilə cani.
Hər kim ki, deməz surətinə məzhəri-həqdir,
Vaqif degil andan,
Ol bixəbərə söylə ki, ta qalmaya nadan,
Bilsin bu bəyani.
Fani olisərdir bu cahan aqibətül-əmr,
Rəhm eylə mənə sən,
Bilgil ki, vəfa eyləməyə kimsəyə, ey can,
Bu dünyəyi-fani.
Hər kim ki, sənin gözlərinə müştəri olmaz,
Cana, çü Nəsimi,
Qılmaz dilü can qaşın ilə gözünə qurban,
Aşiq demə ani.

Kirpikləri çün iki cahanın əsəridir,
Bu dövri-Zühəldə,
Ol günəşi gör sən kim, anın kimi pəridir,
Gün bürci-Həməldə.
Katib ki, üzü hərfini yazdı otuz iki,
Yigirmi səkizdən,
Ol adəmi-xaki budur, adəm, xəbəridir,
Qıl nəqşi-əzəldən.
Gəl surətinin sirrini həcc eylə ədədcə,
Ol məhrəmi-əsrar.
Kim, aləmi-surət qılasan, həcc səfəridir,
Fikr eylə əməldə.
Musasifət olgil ki, münacat həmişə,
Göstər yədi-beyza,
Didar çün anın gecəvü-gündüz nəzəridir,
Bu Turi-zələldə.
Üqbayə duruş, aləmi-zata bula gör yol,
Anla bu sifati,
Dünya dedigin fitnə çü gördün bəşəridir,
Nəqdi anın əldə.

Gəl qaməti-sərvin keçib ol cənnətə daxil,
Didar görəsən,
Arif olanın rövzeyi-rizvan çü yeridir,
Qalır o məhəldə.
Mişkin saçın əldən qoma zinhar, Nəsimi,
Namusu yelə ver,
Müşkillərini keyfiyyətin şəm'in əridir,
Ol saf bu həldə.

Ta qıldı təcəlli bu mənim könlümə Allah,
Lütf eylə eyvüllah,
Firqətdə yanan könlümə vəsl irdi bədilxah
Əlminnətülillah.
Nigah irişdi mənə ilham ze həzrət,
Qəflətdən oyandım,
Vəhdət günəşi doğduvü şam oldu səhərgah,
Qəm qalmadı billah.
Əz qeybi-hüviyyət mana nitqi-əhədiyyət
Ayıtdı, fəqir ol,
Tərk eylədim uş mülk ilə malü vətənü cah
Yüz dutdum iləllah.
Fani oxuram dünyanı əz ruyi-həqiqət,
Didara dəyişdim.
Təcrid olub ayıtdım ki, təvəkkəltü əlallah,
Qül külli minallah.
Hər nəsnə irişdi mana əz ruyi-məhəbbət,
Əz-həzrəti-ali,
Rədiyyət ilə nəsnəyə mən qılmadım ikrah,
Ta olmaya birah.

Mə’şuqi-həqiqi zi kərəm çünki buraxdı,
Bürqə zi rüxi-xud,
Məhv oldu fələklərdə kəvakib, günəşü mah
Qıl səcdə bedərgah.
Gəl arif isən qoyma Nəsimi, dəmin əldən,
Sən adəmi tanı,
Ürfan ilə qıl dünyada bazar məallah,
Ta qıla nəzər şah.

Əlif – Allah, sidrə boyun münəhadır müntəha,
Çün cəmalındadır ərrəhman ələl-ərş istiva.

Bey – Bilindi qəddinin həddi nə miqdar olduğu
Bildilər kim, tuləhu sittun zə’rən fissəma.

Tey – Türabilər əlində Zülfiqar şəmşirü tiğ,
Fəzrəbu buyruldu həqdən, həm buyurdu Mustafa.

Sey – Səvab ola anınçün həq yolunda verdi can,
Dərdinə həqdən dəvadır, rəncinə yüz min şəfa.

Cim – Camalın nurudur kim, doğdu məşriqdən tamam,
Şö’lə verdi hər dərəcdən şöylə kim, nuri-ziya.

Hey – Həyat irdi ləbindən Xızrü Isa oldu hey,
Dərdmənd aşiqlərin dərdinə oldu çün dəva.

Xey – Xəbərdar olmayanın təxtini div aldı div,
Bixəbər oldu özündən şöylə qaldı ömrha.

Dal – Dəlil oldu dəhanın rəmzini qıldı əyan
Bildi bildirdi rəsulu həm Əliyyəl-Mürtəza.

Zal – Zakir sufilər çox zikrə məşğul oldular,
Geydilər şal, işləri al, taəti zərqü riya.

Rey – Rəhmanirrəhim oldu camalın aşiqə,
Niçün Adəm dedi, bismillahi-zülfəzlül əla.

Zey – Zahid zöhd ilə bəzətdi tacü xirqəsin,
Batini oldu müləvvəs, zikrini qıldı həba.

Sin – Səadət darını verdi, Süleyman təxtini,
Onlara kim, sidq ilə bu yolda çəkdilər cəfa.

Şin – Şəhid oldu olar kim, həq yolunda öldülər,
Qəm yeməz onlar ki, bildi həqdir ona qanbəha.

Sad – Sadiqdir olar kim, səbri qıldı ixtiyar,
Dilbərin yolunda gör kim, lütfə irdi daima.

Zad – Zəlalətdən xilas etdi bizi Fəzli-ilah,
Cism anındır, nitq anındır, ruh anındır cümləha.

Tey – Tahirdir vücudu onların kim, batini,
İçdilər cami-müsəffa, buldular sidqü səfa.

Zey – Zahir gördülər həqqi olar kim, gördülər,
Görmiyənlər gözləri kur oldu, şöylə kim, ə’ma.

Eyn – Əyan eynəl-yəqin oldu liqayi-hüsni-dust,
Hər kimin həqq gözün açdı gördü didari-xuda.

Ğeyn – Ğeyrətli kişilər qafil olmaz kəndudan,
Şərm edər həqdən utanur, nəfsinə verməz riza.

Fi – Fəna darında hər kim bulmaz olursa nəcat,
Fikri fasiddir onun kim, ömrünü qıldı həba.

Qaf – Qövseyn oldu qaşın aşiqə mehrablar,
Səcdəgah oldu anınçün şahi-cümlə ənbiya.

Kaf – Kəlamüllah ilən səb’ülməsanidir üzün,
Zülfü qaşun kirpigindir yeddi ayat xəttiha.

Lam – Ləbin oldu Məsiha çün üzün sübhü nəhar,
Zülfünün sirri qəmərdir, üzünün şəmsi züha.

Mim – Mələk surətli dilbərsən, əya bədri-münir,
Hüsni-Yusifsən, təcəlli eylədi nuri-xuda.

Nun – Nihan oldu ləbindən çeşmeyi-abi-həyat,
Hər kim içdi, vacib oldu cənnətül-mə'va ona.

Vav – Vəchin Kə'bəsinə kim ki, qılmadı sücud,
Adı div oldu, anınçün qaldı şöylə mübtəla.

Hey – Hidayət eylədi Mehdiyü Qur'ani-mübin,
Ol ki, əşya xilqətində bizə oldu rəhnüma.

Yey – Yuvəsvisdən xilas olmaq dilərsən adəmi,
Oxu ismi-ə'zəmi kəndözinə urğıl dua.

Lam Əlif – Si hərf olubdur bəlkə simurği-cahan,
Bilmədi əslin hürufun kim, dedi bu hərfə la.

Pey – Pənahımdır mənim həq, pərdədarımdır bu dəm,
Padşahım, xanım oldur, mənə verdi dəstü pa.

Çim – Çahar ünsür kim, məbdəidürür hər şeyin,
Bunda buldu həqqi külli-ənbiyavü övliya.

Jey – vü jalə, çeşmü əbru, zülfü rüx, bu xəttü xal,
Müshəfü-həqdir müəyyən gər oxursan taliba.

Gaf – Gönlüdür Nəsiminin məhəbbətdən sərir,
Şol şaha kim, kölgəsidir zilli-simurğü hüma.

Əlif – Ol qəddinə ögündigiçün sərvü çinar,
Olmadı onlara göftarü nə rəftarü nə bar.

Bey – Bu gün badi-səba zülfünə tuş oldu məgər
Ki, dilü can elinə mişkü əbir etdi nisar.

Tey – Təmənna edən ancaq tapuna mən deyiləm,
Bu həva ilə keçər şeyxü fəta, mirü kübar.

Sey – Səradan çəkərəm ah sürəyyaya irər,
İllər ilə sana bir gün nə əcəb etmədi kar.

Cim – Can gözü görər nuri-camalında sənin,
Lövhi-dildə yədi-qüdrət yazalı nəqşü nigar.

Hey – Həyati-əbədi buldu vüsalında irəm,
Firqətin zəhrin içər, ey neçələr leylü nəhar.

Xey – Xətindən utanır nəsx ilə reyhanü sülüs,
Ta mühəqqəq ana manənd olalı xəttü qübar.

Dal – Dərd ilə düşən könlümə məh mehridir ol,
Üz urub qürbətə bir gün eləyim tərki-diyar.

Zal – Zikr etdigi bu kim ləbinin şəkkərini,
Tutiyi-canü könül bir dəm ola xoşgöftar.

Rey – Rəqibin üzünə baxma, eşitmə sözünü,
Dilbəra, çünki anın qövlidürür cümlə fişar.

Zey – Zamanın nəsinə şad olayım, bir ləhzə,
Dili-qəmginimə heç vermədi aramü qərar.

Sin – Sahir gözünün məkrini dil şərh edəməz
Ki, nə cadu bilir ol fitnələri, nə əyyar.

Şin – Şol zülf ilə xal oldu mana danəvü dam
Ki, bu dil mürğü dü aləmdir ana seydü şikar.

Sad – Səbr et dedi dildar bu gün mana, dedim:
Aşiqə səbr mahal oldu dəxi qeyrətü ar.

Zad – Zərb uralıdan canıma məstanə gözün,
Getmədi başda dəxi xəmr iləvü gözdə xumar.

Tey – Tolu könlüm evi nuri-təcəllayi-camal
Ki, görükməz gözümə zərrəcə əğyar, nə yar.

Zey – Zalım gözünə hey de ki, cövr eyləməyə,
Etməsin şəmsü qəmər kimi məni zarü nizar.

Eyn – Aşiqlərə aləmdə çe duzəx, çe behişt,
Bir olur tirəvü mehri üzü məstani-bahar.

Ğeyn – Ğeyrət budur, ey şah ki, kuyində müdam,
Ta ki, ömrüm ola ləbbeyk edəlim çakərvar.

Fey – Fərda səni təftiş edə aşiq, göricək
Nə rica ana behişt ola, nə heysiyyəti-yar.

Qaf – Qaşınla gözün, zülfü dəhanın həvəsi
Bizə nə izzətü hörmət qodu, nə elmü vüqar.

Kaf – Ki urdu yədi-qüdrət, dedi bir huri-lətif:
Gəlmədi sənciləyin, gəlməyə ta ruzi-şümar.

Lam – Layiq ləbinə lə’l degil, gül rüxünə
Kim, anın mə’dəni səng oldu, munun mişki-tatar.

Mim – Mürği-dilü can istəməyə baği-behişt,
Kaşiyan zülfi-həbib ola, xətü xalı mədar.

Nun – Novruz olucaq yar ilə xoşdur gülü mül,
Çalına çəngü rübab, oxuna üşşaqi-nigar.

Vav – Var, uymagilən sən bu yavuz nəfsə bu gün,
Adəmin hur mələk həmdəmi niçün ola mar.

Hey – Həvəs etmə Nəsimi, büti-hərcayiyə kim,
Ola əğyar ilə yar, edə vəfadarını zar.

Lam əlif – La deməzəm gər məni qətl edə gözün,
Dili Mənsursifət eyləyəsən zülfünə dar.

Yey – Yeri eylə tənə'üm yemədən səni bu yer,
Kim əcəl çənginə düşsə, sənəma, sanma çıxar.

Əlif – Ə'la qamətin hər kim görər bican olur,
Bey – Bəşarət buldu hər kim dilbəri sultan olur.

Tey – Təmənna vəslini etdim, niyazım uşbudur,
Sey – Səna etməklik içün uş canım qurban olur.

Cim – Cümlə xubların sultanı sənsən, ey pəri,
Hey – Hüsn içrə nigarım Yusifi-Kən'an olur.

Xey – Xəyalın könlümü yaxdıvü yandırdı məni,
Dal – Divanə olub əz qəm ki, bağrım qan olur.

Zal – Zövqüm var ola ki, ta sənin eşqində mən,
Rey – Rəvayət qıldı mana kirpiyi peykan olur.

Zey – Zavalın olmasın, canım fəda olsun sana,
Sin – Səadət görsə dermən bağrım uş büryan olur.

Şin – Şərabi-ləblərini içənə yoxdur zaval,
Sad – Sün'ünlə yenə kövnü məkan bustan olur.

Zad – Zəll ayı üzündür cümlə hərfi-kafi-nun,
Ayn – Aləm xəlqi mana sənsizin düşman olur.

Ğayn – Ğarət qıldı barca ləşkəri can şəhrini,
Fey – Fəraqın yaxdı oda, uş könül giryan olur.

Qaf – Qüvvət qalmadı artıq tənimdə taqətim,
Kaf – Kafir gözlərin kim Rüstəmi-dəstan olur.

Lam – La yoxdur könüldə doğdu eşqimdən əzəl,
Mim – Müsəlsəl kirpiyindir oxları pərran olur.

Nun – Necə baxdım mən əndər rövşənayi boyuna,
Vav – Vallah sənsizin cənnət mana zindan olur.

Hey – Həvəslənib dilərmən şol qəmərtək üzünü,
Lam əlif – La dolğunub baxsam cahan viran olur.

Ey Nəsimi, eşq ilə ayıtdın qəzəlni yar üçün
Yey – Yanağın güllərinə cümlə can heyran olur.

Yey – Yüzün mahiyyətidir aləmə nuri-nəcat,
Lam əlif – Lareybə illa vəchəhü ana cəhat.

Hey – Hilalın qabü qövseyn, qaşların mehrabdır,
Vav – Vəhdət nuru üzün, saçların vəl-mürsəlat.

Nun – Nə mə'nidən qiyamət qamətindən kəşf olar,
Mim – Müvəhhidlər dedilər üzünə vən-naziat.

Lam – Lə'lin cür'əsindən aləmi məst eylədin,
Kaf – Kafidir ləbindən içənə abi-həyat.

Qaf – Qur'andır camalın, bu kəlamı həq dedi,
Fi – Fələk dövründə buldu Kə'bənin içində lat.

Ğeyn – Ğeyrə sümmə vəchüllah yox, ey müddəi,
Eyn – Elmi-fəzli-həqdir kəşf edər hər müşkilat.

Zey – Zühur oldu çü Isa Mehdiyi-sahibzəman,
Tey – Tanıqdır, nitqi xatəm qandasa getdi məmat.

Zad – Zəlalət mülkünü nitqilə mə'mur eylədi,
Sad – Səfa kəsb etdi andan əhli-həq buldu səbat.

Şin – Şəmsi-aftabam, cavidanam ləm-yəzəl,
Sin – Səadət vacib oldu Fəzli-həqdən mümkünat.

Zey – Zülalın şərh edərkən aləmə şirin təbin,
Rey – Rəvan oldu bu nəzmin mə'nisi həmçü Fərat.

Zal – Zikrimdür camalın ayəti hər sübhü şam,
Dal – Də'visi yalançı sufilərin oldu mat.

Xey – Xəyalım dolaşalı zülfünün sevdasına,
Hey – Həyatım qapdu şövqün ləşkəri vəl-adiyat.

Cim – Camalilə cəlalın mə'nisi bir nurdur,
Si – Sürəyyayı səmadan göstərər ənvari-zat.

Tey – Təalillah ki, mislin görməmiş dövri-fələk,
Bey – Bəqa mülkü sənindir, ey Nəsimi, şeş cəhat.

Əlif – Allahdur ki, olmaz nitqi-zatından cüda,
Uş kitabü həyyi-mütləq, uş Məsihi-mö'cüzat.

Yey – Yenə sığındım ol sübhana mən,
La Əlif – La demədim ol xana mən.

Vav – Veylindən iraq olmaq üçün,
Hey – Həmişə aşiqəm Fürqana mən.

Nun – Nə kim qıldım günah tutdum ümid,
Mim – Məhəmməd Mustafa sultana mən.

Lam – Ləbbeyk çağıranlar həqq çün,
Gaf – Göstər girəyim cinana mən.

Qaf – Qadirsən bizi irgürməyə,
Fey – Fələkdən keçirib seyrana mən.

Ğayn – Ğeyrət issi aşiqlər ilə,
Ayn – Işrət irgürəm Keyvana mən.

Zay – Zülm qılmağa olmadım şərik,
Tay – Tanıqdır həq bilir, insana mən.

Zad – Zərbindən dedin kim, qurtulam,
Sad – Səbr edərisəm böhtana mən.

Şin – Şey'lillahüm oldur Tanrıdan,
Sin – Səadət babın açam cana mən.

Zey – Zaval irmiyə bu din mülkünə,
Rey – Rəfiq olmayacaq şeytana mən.

Zal – Zakirlərdən olayım derəm,
Dal – Dəlalət eylərəm rəhmana mən.

Xey – Xeyrəndişə mö'minlər ilə,
Hey – Hərifəm anda ki, ürfana mən.

Cim – Cəhənnəmdə sanıram girəcək,
Sey – Səqil kişi ilə bustana mən.

Tey – Təmənnam həqdən oldur satmıyam,
Bey – Bəqa mülkünü bu virana mən.

Əlif – Allah yarı qılırsa mana,
Dərdimi irişdirəm dərmana mən

Der Nəsimi sana, əqlin yar isə,
Kəndözümnü yazaram fərmana mən.

Üz üzrə bu rəsm xal olurmu?
Sevdası kimi xəyal olurmu?

Cadu gözün alına alındım,
Şəhla ilə nərgis al olurmu?

Zülfün götür, ey qəmər, üzündən,
Bədrin gecəsi hilal olurmu?

Xavər günəşisən, ey pərirüx,
Kamil günəşə zaval olurmu?

Eşqin adı vahid oldu bimisl,
Zati-əhədə misal olurmu?

Əksi dişinin gözünə düşdü,
Əmvac kimi bu lal olurmu?

Ağzı yarı qəndü abi-heyvan,
Hər çeşmə suyu zülal olurmu?

Lə'lin ənəbi əzəl meyidir,
İçməyənə xəmrü bal olurmu?

Bilsəm bu meyi haram edən kim,
Fitva bulacaq halal olurmu?

Qoparalı qamətin qiyamət,
Tubada gör e'tidal olurmu?

Hüsni-cəm ilə oxurdu təhsin,
Bir sənciləyin camal olurmu?

Neçin qoyayım ətəgin əldən,
Divanəyə qiylü qal olurmu?

Çün doldu vücudum evi sənlik,
Məhv oldu, ey dost, məndə mənlik.

Hüsnün vərəqi lisana gəldi,
Yetmiş iki tərcümana gəldi.

Zülfündəki kafü nun nə sözdür
Kim, ayəti-kün-fəkana gəldi?

Ey cövhəri-biərəz, nə cansan;
Cismin şərəfi bu kana gəldi?

Mişkin saçın arasına düşdüm,
Kim dedi siyah miyana gəldi?

Sorsam səni Xızrımısan, ey can,
Ağzın yarı cavidana gəldi.

Bir sənciləyin gözəl yeganə,
Eşitməmişəm cahana gəldi.

Rüxsarın əzəl günündə doğru,
Eşqin əsəri bu cana gəldi.

Nəşf etdi cigər qanın bu çeşmə,
Qəmzən oxu çün nişana gəldi.

Əsrari-rümuzdur sifatın,
Bu məntiq ilə bəyana gəldi.

Kim dedi sana ki, qafü – Qur'an,
Simurğ sana aşiyana gəldi.

Bu də'viyi-münkir oldu kafir,
Qarardı üzü çü yana gəldi.

Mən sana bahasız olmuşam qul,
Bu dəklü qula baha, nə gəldi?

Çün doldu vücudum evi sənlik,
Məhv oldu, ey dost, məndə mənlik.

Qoyma üzünü niqab içində,
Həşr oldu ədəm hicab içində.

Dağıtma yanağın üzrə zülfün,
Neylər bu günəş səhab içində?

Gördüm səni həm fələkdə yıldız,
Buldum səni həm kitab içində.

Vəslin bu fəsildə ələ girdi,
Mislinmi var uşbu bab içində?

Mişkin saçına sücud qıldım,
Musa kimi uş tənab içində.

Cadu gözün uyxudan oyandı,
Fitnə qalur idi xab içində.

Bir busə mənə kərəmdən ən’am
Et kim, qalasan savab içində.

Əşrati-qiyamət oldu qəddin,
Var surilə bu hesab içində.

Mən çəng kimi ikiqat oldum,
Növhə qılıram rübab içində.

Gəh eşqin ilə gözüm dolar cam,
Tərqiq edərəm şərab içində.

Gəh dəm kimi dəm olur yanaram,
Bişər cigərim kabab içində.

Tə’rif edərəm ki, sənsən ə’raf,
Ürfün tanıdım hicab içində.

Hər kim sana münkir oldu, ey can,
Nəfsini qodı əzab içində.

Çün doldu vücudum evi sənlik,
Məhv oldu, ey dost, məndə mənlik.

Sən Mərvə ilə mana Səfasan,
Ucdan-uca könlümə səfasan.

Aşiqlərə sidrə qamətindir,
Xubluqda zəhi, nə müntəhasan.

İsa nəfəsindən uş dirildim,
Bu mö’cüz ilə ki, canfəzasan.

Çün qaşların oldu qabü qövseyn,
Şəqqülqəmər ilə istivasan.

Tutdun bu zəminü asimani,
Xavər günəşivü məhliqasan.

Qaf oldu büləndiyi-vücudun.
Simurğa kim aydı kimiyasan?

Səninlədürür hümay-təl’ət,
Kim dedi sana ki, sən hümasan?

Həm zəxmimə səndən oldu mərhəm,
Həm dərdimə axırı dəvasan.

Çün qəhr ilə lütf məzhərindir,
Surətdə səfavü həm vəfasan.

Bu ikidə birligin səbatı,
Xızr oldunü daxi Iliyasan.

Yasin oxuyalı, ey münadi,
Qıldın bu cahanı oquya sən

Məndən mana mə’nidə müqərrəb,
Bu surət ilə yəqin xudasan.

Getmə nəzərimdən, ey pərirüx,
Gözlərimə nurü ruşinasan.

Çün doldu vücudum evi sənlik,
Məhv oldu, ey dost, məndə mənlik.

Zülfün çü səvadi-ə'zəm oldu,
Mö'min olan ana məhrəm oldu.

Günəş üzün eylədi məni məhv,
Gözüm yaşı çünki şəbnəm oldu.

Hər kim ki, vüsalinə irişdi,
Cam içdivü kəndusu Cəm oldu.

Əmvaci-xəyalına düşəndən,
Sözüm dürü xatirəm yəm oldu.

Mehrab qaşın və Kə'bə üzün
Fitnəsi cahana Zəmzəm oldu.

Sevdası başımda saçlarının
Uzandı, xəyalına xəm oldu.

Lə'li-ləbinə bəyani-mö'cüz
Dedi ki, Məsihü Məryəm oldu.

Qarğu boyunu görəli tuti
Şəkkər sözü ilə həmdəm oldu.

Hər kim səni bildi, buldu həqqi,
Hər kim həqi bildi, Adəm oldu.

Cuyəndə qılan məhəbbətindən,
Kərxi ilə Şibli, Ədhəm oldu.
Ey şivəfüruş, xuni-qəmzən
Oxuna sipər bu sinəm oldu.

Həm dərdimə vəslin oldu daru,
Həm zəxmimə daxi mərhəm oldu.

Çün doldu vücudum evi sənlik,
Məhv oldu, ey dost, məndə mənlik.

Gahi məni xarü zar edərsən,
Gah rəmz ilə dilfigar edərsən.

Gah lalə kimi xərabü sərməst,
Nərgis kimi gəh xümar edərsən.

Leylimi üzün ilə gecələr,
Şol şəm' kimi nahar edərsən.

Yarəb, bu səfa yanağın ilə
Batinləri aşikar edərsən.

Bir baxış ilə, ey ahugözlü,
Şir olur isə şikar edərsən.

Bu hüsn ilə, bu lətafət ilə,
Ayı, günü biqərar edərsən.

Fərhadıvü Xosrovu söz ilə,
Şirin kimi şərmsar edərsən.

Çün doğdun, ey axirət günü sən,
Xoş saəti-ruzigar edərsən.

Ey huri, bu gün vüsalın ilə
Mövsümləri növbahar edərsən.

Çün şərhinə vermişəm şəhadət,
Aşiqləri şəhriyar edərsən.

Çün zəxmimə səndən oldu mərhəm,
Həm dərdimə sən timar edərsən.

Əvvəl sənə səcdə qılmışam mən,
Axır məni ixtiyar edərsən.

Çün doldu vücudum evi sənlik,
Məhv oldu, ey dost, məndə mənlik.

Ey otuz iki həqin sifatı,
Nurilə bəzədin uş bu zatı.

Cümlə züləmatı rövşən etdin,
Rövşən doğalı üzün cəhatı.

Saçlarının istivasıdır kim,
Ərz etdi Xəlil içün nəcatı.

Me'raca məni yetirdi zülfün,
Qədrə irənin budur bəratı.

Ey hüsn iyəsi, çıxar dəmidir,
Aşiqlərə üşr ilə zəkatı.

Ənhar kimi gətirdi cüşə,
Ağzın yarı çeşmeyi-həyatı.

Həq fatihə oxudu camalın,
Ansız qəbul etmədi səlatı.

Misri oda yaxdı eşqin odu,
Kasid ləbin eylədi nabatı.

Şahım rüxün utdı ol fələkdən,
Qıldın bu cahana şah matı.

Vəslin hərəm oldu, ey büti-çin,
Çin eylədi Kə'bə ilə Latı.

Olmadı, bilürəm olmiyəsər,
Sənsiz qamu aləmin səbatı.

Lövlakə lima xələqtül əflak,
Eşqinlə yaratdı kainatı.

Innəlhəsənat eşq içində,
Hüsn oldu Nəsimi səyyiatı.

Çün doldu vücudum evi sənlik,
Məhv oldu, ey dost, məndə mənlik.

Müshəfi-natiqəm, kəlam oldum,
Bəndeyi-favü zadü lam oldum.

Sübh əzəldə çü üzünü gördüm,
Əbədi zülfün ilə şam oldum.

Padşahi-cahan mənəm, çünkim
Məhv edib mənliyi, qulam oldum.

Ərş təxtimdürür, Süleymanam,
Hüdhüdəm, Bülqisə pəyam oldum.

Zati-mütləq vücudum oldu yəqin,
Seydi-Simurğa danə, dam oldum.

Nərgisin çeşmini xumar edəli,
Məsti-gülrəngü qönçəfam oldum.

Ləblərindən həyati-ləmyəzəli
Içəli səlsəbilü cam oldum.

Sübhdəmdə nəsimi-sübhi-nigar,
Iribəm aşiqə salam oldum.

Nəfəsimdən müəttər afaqı
Qılıb ənfüsdə xoşməşam oldum.

Çərxin ağazın anladır bu sözüm,
Saz, ədvar ilə məqam oldum.

Binişan sirrini əyan edirəm,
Kəndözilə çü sübhü şam oldum:

Çün göründü gözümə ol dildar,
K'andan özgə cahanda yox dəyyar.

Fəzli-həqqin irişdi dövranı,
Zahir etdi rümuzi-Qur'anı.

Kirpigi, qaşı ilə zülfündən,
Kəşf edər sirri-razi-sübhani.

Həqqi qıldı müşahidə təhqiq,
Kim ki, bildi bəvəchi-insani,

Xızr olub içdi abi-ləmyəzəli,
Buldu xəttində abi-heyvani.

Ağzı bir nöqtədir, rümuzu anın
Göstərir xatəmi-Süleymanı.

Neçə xət əhlini qubar edənin,
Nəsx olundu xətində reyhanı.

Bu səadət topunu ol çaldı
Ki, şəhadətlə buldu meydanı.

Vüslətə ulaşıb bəqa bulasan,
Gər qılırsan bu tərkibi fani.

Ruhi-qüds oldu nitqim əşyada,
Tərh qıldım arada cismani.

Vəchi-Adəm ki, ərşi-rəhmandır,
Gözlərim anda gördü subhanı.

Ləbi-lə'lin xəyalına hərdəm
Tökdü çeşmim bu lə'lü mərcani:

Çün göründü gözümə ol dildar,
K'andan özgə cahanda yox dəyyar.

Çünki mən binəvayi-qəllaşam,
Meykədə içrə rindü ovbaşam.

Məzhərəm, məzhər ilə bir zatam,
Görünən nəqş içində nəqqaşam.

Sirr ənəlhəq rümuzunu hərdəm
Söylərəm aşikara sirfaşam.

Sufi, gəlgil şərabi-saf içəlim,
Meyi tövhid içində sərxoşam.

Nitqi-həqqəm, məra çe pəndari?
Bu ənasirlə gör içü taşam.

Fələkü asimanü həft zəmin,
Həm kitab içrə, həm quru, yaşam.

Mənsiz olmaz cahanda əşya çun,
Gərçi kuhü və gərçi xaşxaşam.

Zülfü hüsnün həvasilə hərdəm,
Sübh-dəmdə nəsimi-fərraşam.

Ləbü dəndanının xəyalına,
Nəzər eylə ki, lə’lü dürpaşam.

Yekcəhət gəştəm əz rəhi-eşqət,
Gərçi dər pişi-xəlq qəllaşam.

Masəvəllahdan əl çəkib indi,
Eşqin ilə həmişə yoldaşam:

Çün göründü gözümə ol dildar,
K’andan özgə cahanda yox dəyyar.

Dağıdanda üzünə zülfünü yar,
Yeridir, aşiqin məlahəti var.

Məst olanda ləbində əşya həm,
Nərgisin gözləri olur xummar.

Bustan cənnət oldu hüsnündən,
Əndəlib gülə qarşı ağlar zar.

Vəchi-adəmdə otuz iki odu,
Musiyə söylədi ənəllah nar.

Mərkəzi-xakə qıldı cümlə sücud,
Fələkü həm mələk, bu həft səyyar.

Ta ki, şəmsi-məşariq əz məğrib,
Doğuban nurun eylədi izhar.

Endi Isa və nitqi eylədi faş,
Oldu cahil, kim eylədi inkar.

Çeşmi-məstin əzəldə görmüş idim,
Əbədi olmazam dəxi huşyar.

Buldu zülfün həvasilə şəbi-tar,
Doldu hüsnün ziyası ilə nəhar.

Kafü nun mövcü daşdı mövcündən,
Şeş cəhətdən çü gəldi xoş göftar.

Həmə çun məsti-vacibül-mövcud,
Görünür dürlü-dürlü ol əsrar:

Çün göründü gözümə ol dildar,
K'andan özgə cahanda yox dəyyar.

Eşqi-həq irdi mütrib ilə çü saz,
Nəğmeyi-Davud ilə gəldim baz.

Kənzi-məxfi tilismin eylədi çak,
Görəli mürği-dil qılır pərvaz.

Sirri-həqqin rümuzu oldu bəyan,
Dari-Mənsur gəldi aşiqə baz.

Vəchi-adəm sifati-həqdir çün,
Nitqi həq gəldi, həm qılır ağaz.

Hər kim istər məqami-Mahmudi,
Fəzl eşigində olsun ol Ayaz.

Əvvəlü axırü zahirü batin,
Cümlə oldur şəriki-biənbaz.

Xəttü xalın bəyanı həqdəndir,
Göstərər dəmbədəm bu eşqi-məcaz.

Geydi insan donunu əşya çün,
Yerdə, göydə bu cümlə şibü fəraz.

Gün üzün pərtövündən oldu zühur,
Gecə zülfündən ötrü oldu diraz.

Həqq imiş nitqi-həq çü irdi bü gün,
Canü dildən qulağıma avaz:

Çün göründü gözümə ol dildar,
K'andan özgə cahanda yox dəyyar.

Getdi firqət, irişdi eyni-vüsal,
Qalmadı zərrəcə könüldə xəyal.

Zülmət içrə həyatı çün buldum,
Zülfü hüsnün ləbində abi-zülal.

Abi-heyvana lə'lini təşbeh
Eyləyənlər zəhi xəyali-məhal.

Cənnətü səlsəbilü hurü qüsur
Vəchini həq bilənə oldu həlal.

Həqqə ulaş, arif ol, arif,
Mən-ərəf sirrini bilən bu kamal.

Sə ’y kon dər cahan kamil baş
Kim, irişməz kamalə zərrə zaval.

Əhli-tövhid irişdi vəhdətə çün,
Qaldı şirkətdə div şeylə məlal.

Divə hüsnündən olmadı həsənat,
Səyyiat oldu qıldığı ə’mal.

Laməkan oldu adın əşyada,
Binişan rəngü lövnü biəmsal.

Vəchi-adəm sifati-eynüllah,
Otuz iki ülayikəl-əbdal.

Liməallah məqami-vəhdətdir,
Əhli-kəsrət nə bilsin anı nə hal:

Çün göründü gözümə ol dildar,
K’andan özgə cahanda yox dəyyar.

Aşiqə vəchi-zati-paki-xuda
Oldu mə’şuq üzündə ol peyda.

Lövhi-məhfuz imiş üzün, dü cahan,
Görünür misli-cami-giy tinüma.

Qabü qövseyn üzrə çün zülfün,
Şəqq edər vəchini çü bədr dü ca.

Sünbülün bürqəyini badi-səhər
Salalı günəş oldu sanki Süha.

Xətü xalın kitabını məstur,
Yazdılar rəqq Turi-Musiliqa.

Gəldi Mehdi, hidayət etdi Məsih,
Nitqə gəldi fəsih zəminü səra.

Vəchi-adəmdən özgəyə cümlə
Limənil-mülk vəhdətinə fəna.

Xızr olub, iç bu abi-heyvani,
Lamü beydən irişdi cami-xuda.

Zülfünün zülmətində qalmış ikən,
Doğdu hüsnü, göründü şəmsi-züha.

Fani et mənliyi, Nəsimi, bu gün
Ki, bulasan vüsali-eynə bəqa:

Çün göründü gözümə ol dildar,
K'andan özgə cahanda yox dəyyar.

Pərdə içində çalınır bir saz
Ki, edər eşq nəvasın ağaz.

Kim nəvayi qılır çü bu üşşaq
Büzürgün nəğməsin dutar şahnaz.

Arif anlar bu nəğmənin rəmzin,
Aşina olmayana vermədi raz.

Gər bilirsən bu rəmzi, ey talib,
Mən bu pünhanı qılmazam ibraz.

Bəzm qurmuş, şərab içər Mahmud,
Məclis əsbabını düzər Ayaz.

Söhbət arayışı düzər mə'şuq,
Şivə birlə qılır itab ilə naz.

Leyk ol nalənin misalı budur,
Zərrələrdən eşidirəm avaz;

Ki, nişan içrə binişan mənəm uş,
On səkiz min cahana can mənəm uş.

Çünki dəryaya irişə bu Fərat,
Lacərəm derlər ana bəhr ilə zat.

Mövcüdür kainat bu dəryanın,
Bəs anınla dutar qərar səbat.

Vüslətidir anın bu hurü qüsur,
Hüsnünün gülşənindədir cənnat.

Həm şərabi-təhuri-Isadəm,
Həm şəbistan içində abi-həyat.

Kəsrətin illəti nüquş oldu,
Nəqşi qoydu bir ola zatü sifat.

Aləm anın sifati-məzhəridir,
Adəm oldu camalına mir'at.

Eyni oldu sifat çün zatın,
Qeyrini nəf'y qıl, həqi isbat:

Ki, nişan içrə binişan mənəm uş,
On səkiz min cahana can mənəm uş.

Çün nişan ana binişan oldu,
Hər məkan ana laməkan oldu.

Ismini çün təcəlli qıldı həq,
Lacərəm bu sifət əyan oldu.

Əmr qıldı, cahanı yaratdı,
Ol sifət bu cahana can oldu.

Adəmin şəkli idi ki, gəldi,
Tən cahanında mihman oldu.

Sədhəzaran qəfəsdə bu bülbül,
Tən cahanında nəğməxan oldu.

Gərçi zahirdə bu qəfəs çoxdur,
Leyk mə'nidə bir haman oldu.

Bildin isə bu rəmzi, ey talib,
Sənə bu mə'ni xoş bəyan oldu:

Ki, nişan içrə binişan mənəm uş,
On səkiz min cahana can mənəm uş.

Nəqş arasında mən ki, pünhanam,
Hüsnünün aləmində tabanam.

Dəftərimdən əlifdürür Qur'an,
Nöqtə şəklində gör nə divanam.

Mə'ni yaqutun istə, ey qəvvas,
Qətrə bəhrində gör nə ümmanam.

Həbs olanda cəhalətin divi,
Mə'rifət mülkünə Süleymanam.

Surətin-nasi surətül-həqqə,
Bu xəbər höccətinə bürhanam.

Zahida, sən məni bəşər sanma,
Adəmi surətində rəhmanam.

Tarümar eylədim qəmin çərisin,
Bu sözün mə'nisilə xəndanam:

Ki, nişan içrə binişan mənəm uş,
On səkiz min cahana can mənəm uş.

Dilbərin hüsnünə niqab nədir?
Zatına pərdeyi-hicab nədir?

Rəf' edər bu hicabı kim ki, bilir
Könlümün Kə'bəsinə bab nədir.

Çünki aləm misali-adəmdir,
Gör vücudunda afitab nədir?

Mustafa həqqi bu sifətdə görüb,
Şabü əmrəd dediyi şab nədir?

Su gülab oldu gül qoxusuyla,
Su nədir, gül nədir, gülab nədir?

Aləmin çün vücudu həqq oldu,
Bəs çəməndə dinən qürab nədir?

Bildin isə bu incə əsrarı,
Bu sual ilə bu cavab nədir:

Ki, nişan içrə binişan mənəm uş,
On səkiz min cahana can mənəm uş.

Eşqini dərdimə dəva gördüm,
Vəslini canıma şəfa gördüm.

Könül əflakına nəzər qıldım,
Vəssəmavati-ma-fiha gördüm.

Leyli-firqətdə taleyin bürcü,
Sureyi-şəmsi-vəzzüha gördüm.

Hər məkan məscid oldu, həm Kə'bə,
Mərvə haqqında çün Səfa gördüm.

Eşq divanında hər yana baxdım,
Zahidin taətin həba gördüm.

Turi-Musidə bir vərəq buldum,
Yazılı xətti-ləntəra gördüm.

Dust şəhrindədir, Nəsimi, məlik,
Bu söz əhlini aşina gördüm:

Ki, nişan içrə binişan mənəm uş,
On səkiz min cahana can mənəm uş.

Ey həq əhli, yəqin imiş bu xəbər
Kim, bilən nəfsinidir əhli-nəzər.

Nəfsini kim ki, bildi buldu həqi,
Nəfsini bilməyənlər oldu şəqi.

Ey həqi istəyən, gəl insan ol,
Qara daş olma, lə'lü mərcan ol.

Gər dilərsən səadəti-əbədi,
Damuyu bil ki, niçün oldu yedi.

Səkkiz oldu qapusu uçmağın,
Niyə dörd oldu suyu irmağın?

Tuba ağacının nədir yemişi?
Həqq onu ər yaratdı, yoxsa dişi?

Hurü qılman nədən ibarətdir?
Hüvə mənhu nəyə işarətdir?

Kövsərü Səlsəbilü mai-məin,
Məqsədi-sidq ilə məqami-əmin.

Nə deməkdir, mana bəyan eylə?
Bu nihan sirri gəl əyan eylə!

Nə əsəldir, nə ma'ü xəmrü ləbən,
Ol ki, Qur'anda həq dedi rövşən.

Bunların əslini nədəndir bil,
Gər nə şeytansan, olma əgridil!

Bunları bilməyən nə bilmiş ola,
Adı anın evi yıxılmış ola.

Kim ki, bildi bu incə əsrarı,
Qoydu əldən cahani-qəddarı.

Fani oldu özündən, oldu həq,
Bildi kim, cümlə həqqimiş mütləq.

Eşqü mə’şuqü aşiq oldu yar,
Leysə fiddar qeyr əna dəyyar.

Kim ki, bildi buları, insandır,
Bilməyən anı bil ki, şeytandır.

Ey Nəsimi, sözündür abi-həyat,
İçməyən anı qaldı fizzülmat.

Nə bilir dəgmə canəvər canı,
Xızra sor, Xızra abi-heyvanı.

Dəryayi-mühit cuşə gəldi,
Kövn ilə məkan xüruşə gəldi.

Sirri-əzəl oldu aşikara,
Arif necə eyləsin müdara?

Hər zərrədə günəş oldu zahir,
Torpağa sücud qıldı tahir.

Nəqqaş bilindi nəqş içində,
Lə’l oldu əyan Bədəxş içində.

Acı su şərabi-kövsər oldu,
Hər zəhr nəbatü şəkkər oldu.

Tiryak mizacı tutdu ağu,
Lö’löi-müdəvvər oldu daru.

Külli yerü gög həq oldu mütləq,
Söylər dəfü çəngü ney ənəlhəq.

Məscud ilə sacid oldu vahid,
Məscudi-həqiqi oldu sacid.

Hər qətrə mühiti-ə’zəm oldu,
Hər zərrə Məsihü Məryəm oldu.

Daşü kəsək oldu vərdi-nəsrin,
Fərhad ilə Xosrov oldu Şirin.

Mə’şuq ilə aşiq oldu bir zat,
Məhv oldu vücudi-nəfyü isbat.

İman ilə küfr bir şey oldu,
Dadlu ilə acı bir mey oldu.

Şirkət aradan götürdü vəhdət,
Vəhdətdən açıldı babi-rəhmət.

Can ilə tən oldu bir həqiqət,
Birikdi şəriətü təriqət.

Əşya ikilkdən oldu xali,
Baqi əhəd oldu layəzali.

Ey talib, əgər deyilsən ə'ma,
Gör və'deyi-külli mən əleyha!

Rəf oldu hicab masivəllah,
Əlqüdrəti-vəl bəqa'i-lillah.

Qeyr odlu həlakü vəch qaldı,
Bəhr oldu şu kim, bu bəhrə daldı.

Gər açuq isə bəsirətin bax,
Gör səndə həqi vü getmə irax.

Gör sən səni kim, nə cismü cansan,
Məqsudi-vücudi-kün-fəkansan.

Çün mö'minə mö'min oldu mir'at,
Mir'atına baxü anda gör zat.

Hər kimsə ki, əsridi bu meydən,
Həyyi-əbəd oldu zati-heydən.

Nəfsini tanıdı, bildi rəbbi,
Tövhid yolunda əkdi hübbi.

Ey həqdən irağ olan əzazil,
Gər div degilsən, adəmi bil!

Adəmdə təcəlli qıldı Allah,
Qıl adəmə səcdə, olma gümrah!

Şeytani-ləinə uyma zinhar,
Anın sözünə inanma, ey yar!

Həqdən sana latətə’ə gəldi,
Həm vəscüdü əqtərib denildi.

Çalındı qiyamətin nəfiri,
Ey sağır, eşitmədin səfiri.

Həşrin günü gəldi, uyxudan dur,
İnanmaz isən gözünü aç gör.

Uyxudan oyan ki, məhşər oldu,
Gör necə zəmanə pürşər oldu,

Sur ünün eşitmədi qulağın,
Dayındı bu köprüdən ayağın.

Nəşr oldu, oyan, quruldu mizan,
Həşr oldu, inan, bilindi yəzdan.

Çün məhrəmi – qul-kəfa degilsən,
Biganəsən, aşina degilsən.

Hər kimsə ki, tanıdı bu canı,
Bir zərrəyə saymadı cahanı.

Yerdən çıxa gəldi dabətül-ərz,
Uş sirrini eylərəm sana ərz.

Həm xatəm ola əlində fərman,
Yə’ni ki, mənəm bu gün Süleyman.

Musa mənəm, uş əsa əlimdə,
Həqdən əzəli qılınc belimdə.

Müşrikdən edər müvəhhidi fərq,
Eyvah ana kim, işi ola zərq.

Xəlqin alına basar əsayı,
Yə'ni ki, bilin bu istivayı.

Neçün ki, bu istivadadır həq,
Ol maliki-mülkü həyyi-mütləq.

Həqdən bu sirati-müstəqimi
Bilgil ki, budur həqin nəimi.

Çün sən keçəsən bu istivadan.
Azad olasan qamu bəladan.

Həm cənnətü hurü həm liqadır,
Rəhman ilə ərşi-istivadır.

Üzün bu cəhətdən ola beyza,
Min fəzli-ilahəna təala.

Adəm degil, həqq oldu bilgil,
Məscudi-həqiqə səcdə qılgil.

Fəzl istər isən həqiqətə var,
Sə'y ilə dürüş və qılma zinhar.

Əlfazi-Nəsimi gör nə candır,
Dəryayi-mühitü kövnü kandır.

Eyyühər-rağıbunə fil övqat,
Üzküruha fəma məza qəd fat.

Foti fersət məkon ki, vəqti səfast
Ki, bəsi həst dər cəhan afat.[1]

İrdi bir dəm ki, bəhcətindən anın
Səkkiz uçmağa döndü altı cəhat.

İş kəma aşə aşiqü mə'şuq
Tarətin-nəfsü tabətil-ovqat.

Səbzeyi Xızrvəş cəvani yaft,
Çeşmeyi abira rəsid həyat.[2]

Nəzər et ölü yer dirildiyinə,
Rəhmət asar göstərir ayat.

Darətin-nayibatu bil əqdah,
Ğünnətit tayiratu bil əsvat.

Cilvəgər şod həme ərayisi bağ
Çün bərəfruxt rüx benini nəbat.[3]

---

Tərcüməsi
[1] Ey həyatı sevənlər,
Onu bilin ki, keçən geri qayıtmaz.

Səfa vaxtıdır fürsəti fovt etməyin.
Dünyanın çoxlu bəlaları vardır
[2] Aşiq və məşuq kimi yaşa,
Nəfs yeniləşdi, fəsil isə gözəlləşdi.

Yaşıllıq Xızr kimi cavanlaşdı,
Bulaqlar dirilik suyuna döndü.

[3] Saqilər qədəhləri dolandırdılar,
Quşlar səs-səsə verib oxudular.

Bitki oğulları üzlərini göstərəndə
Bağın bütün gəlinləri cilvəyə başladılar.

Meyü mə'şuq, səbzə, abi-rəvan
Bəndi-qəmdən bu dördü verdi nəcat.

İnnəmərrahü rahətül-ərvah
Əntə əşrib rəvayihəl kasat.

Xassə dər e'tidali novruzi
K'ab kövsər şodi, cahan cənnat.[1]

Bərəkət istəmə ol adəmdən
Ki, bu mövsümdə etməyə hərəkat.

Lakinnəd dəhrü qəd yünadina,
Əksəriz-zikrə və xadimil-ləzzat.

Hasili nist ömri fanira
Coz mülaqati xaki paki sifat.[2]

Qəlbilə gər diri olasan hey
Həqq özün eyləyə sənə isbat.

Əlləzi fahimayətin qəd aşə
Mən yəfutu visaluhu qədfat

An ki, tiğəş bemülk dad qərar,
V'anki hökməş zəkat bordo səbat.[3]

---

Tərcüməsi

[1] Şərab ruhların rahətliyidir,
Sən ən ətirli badələrdən iç.

Xüsusən novruzun xoş günlərində ki
Sular kövsərə, dünya isə cənnətə dönübdür.

[2] Lakin zaman bizi çağırır,
Zikri çox elə, ləzzətlərdən istifadə et.

Fani ömrün pak zatının sifatına
Yetişməkdən başqa hasili yoxdur.

[3] Himayə olan demək yaşayır,
Vüsaldan məhrum olan məhv olmuşdur.

Onun qılıncı sayəsində ölkə qərar tutub
Onun hökmilə zəkat alınır.

Qüdrətin rif'ətin mehrü fələk
Sədrisinə dedi və verdi bərat.

Nəzəri küllü fe'lihi həsənün
Fəyəkününəhü əbül-həsənat.

Ey be Xızrü Isgəndəri məşhur
Nuri gəştə be ədli to zülmat.[1]

Rümü Şam mülki başına sədəqə,
Çinü maçin eli təninə zəkat.

Ünzilət fil kəlami vəl Incil
Kütübət fiz Zəburu vət Tovrat.

Ayəti ədlü bəzlü elm əməl,
Çar sifatha ki, dər to şod yek zat.[2]

Gözümün Şətti həsrətində müdam
Niligun eyləmiş donunu Fərat.

Bəxt şəm'ini gör üzündə anın,
Ki, misaldır ricacəvü müşkat.

Rüx tutarsan piyadəyi həm şah,
Filü fərzin nola çü sürsən at.

Nüsrətin Rum elində tiksə ələm,
Küfrü məhv eyləyə Həbəşdə qəzat.
Suda yoxdur lətafətin canı
Odda varmı məhabətin, heyhat…

---

Tərcüməsi

[1] Mənim nəzərimdə onun bütün işləri gözəldir,
Onlar gözəlliklərin əsasıdır.

Ey Xızr və Isgəndərliklə məşhur olan,
Sənin ədalətin zülmatı işıqlandırmışdır.

[2] Quran və Incildə nazil olmuşdur,
Zəbur, Tövratda yazılmışdır.

Ədl, səxavət, elm və əməl ayələri
Tək səndə cəmlənmiş dörd sifətdir.

Aləmül-qeyb xatirin misli,
Nəqşi-divar, surəti-mir’at.

Tur oldur, şəha ki, Musavar
Qəlb Turunda eylədin miqat.

Baş urub səcdə qılır əyağına,
Sən əyaq içəcək bəninü nəbat.

Yenə əhli firiştələr göydən
Çağırır nuş bad abi-həyat.

Cam ilə olduğundan ləb-bər-ləb,
Ləbi şərbət olur, piyalə nəbat.

Bulmadı bu qəsidənin mislin
Həddi-Sivas, xütteyi-Toqat.

Şükr əmlak içində kim, vardır,
Mədhinizdə bunun kimi əbyat.

Çün Nəsimi sənindürür, rəhm et
Kim, olubdur o, müstəhəqqi-zəkat.

Necə edə təsəlli edibəni
Səllətil qəlbi, üzlətil xəlvat.[1]

Cığanın nəğmən ilə hər biri dil,
Mən çalaram deyə verə nəğəmat.

Vəqtidir kim, dua yerinə yetə,
Müstəcab edə qaziyül-hacat.

Rövzəsinə rəsuli-yəzdanın
İrdiyincə təhiyyətü səlavat.

Həzrətində budur yəqin diləyim,
Dövlətindən iraq ola nəkəbat.

Vəznin əksilməsin bu dünyadan,
Failatün, məfailün, failat.

---

[1]Qəlb xəlvətdə guşənişin olub, vüsala nail olaydı.

Gəl ki, müştaq olmuşam didarına,
Vermişəm can zülfi-ənbərbarına,
Məhrəm etdin çün məni əsrarına,
Ey pəri, gəl çək məni bir darına.

Ey saçın vəlleyl, üzün vəzzüha,
Surətin şə'nində gəldi qül kəfa.
Ey saçından çün əyan oldu mana,
Sirri-ərrəhman ələl-ərş-istiva.

Ey üzündən zahir əsmayi-xuda,
Şöylə ki, Qur'anda dedi külləha.
Adəmi bil, andadır əsrarha,
Can ilə başın yolunda qıl fəda.

Eşq ilə gəldi cəmiyi-ənbiya,
Eşqdir seyrü süluki-övliya.
Eşq ilə yola girərlər biriya,
Eşq ilə vasil olurlar Tanrıya.

Ey üzün min-indəhü elmül-kitab,
Qül kəfa gəldi camalından xitab.
Surətin həqdir, götür həqdən niqab,
Həq budur, vəllahu-ə'ləm-bissəvab.

Ey camalından münəvvər afitab,
Düşdü hüsnün pərtövündən aya tab.
Kirpiyin, zülfün, qaşın ümmül-kitab,
Oldu üzündən əyan yövmül-hesab.

Ey saçın dövründə məstur afitab,
Vey üzün aləmdə məşhur afitab,
Utanır hüsnündən, ey hur, afitab,
Səndən oldu məstü məxmur afitab.

Ey qəmər üzlü, götür həqdən niqab
Kim, üzündə rövşən oldu afitab.
Arada munca nədəndir bu hicab?
Şərh edər min indəhü ümmül-kitab.

Ey məlik, mülkündə vəchin afitab,
Ey boyu sidrə, rüxün ümmül-kitab.
Düşdü cana atəşi-hicrində tab,
Şövqi-eşqin bağrımı qıldı kabab.

Ey özündən bixəbər, qafil qərib,
Bilməmişsən sirri-əsrari-əcib.
Olmasın bu sirrə məhrəm hər rəqib,
Həmçinin pünhan gərək razi-həbib.

Canımın cananəsi sənsən, həbib,
Xubların fərzanəsi sənsən, həbib,
Küntə-kənzin xanəsi sənsən, həbib,
Vəhdətin dürdanəsi sənsən, həbib.

Bir-iki-üç gün cahandır cayigəşt,
Faida qılmaz, keçər çün dər güzəşt.
Dərd ilə sən özünü qılma məlul,
Şadiman ol, ta gəlincə həftü həşt.

Ey rüxün eşqində əqlim şahmat,
Səlsəbil oldu ləbin abi-həyat.
Ünsürün dörd oldu, həddin şeş cəhat,
Qəflətin müstəhliki bulmaz nəcat.

Ey üzün ayatı ənvari-sifat,
Zülfü xalın sureyi-vəlmürsəlat.
Ayağın tozuna dəyməz kainat,
Failatün, failatün, failat.

Ey xətin Xızrü ləbin abi-həyat,
Ənbərin zülfün şəbi-qədrü bərat.
Mehrü mah istər camalından zəkat,
Failatün, failatün, failat.

Al əlindən atını yabana at,
Həqpərəst ol, həqqi tanı, olma at.
Dünyanın dövründə yoxdur çün səbat,
Atını qaçırma rüxdən, olma mat.

Kafü nun əmrində oldu kainat,
Həm sifatdır kafü nun, həm eyni-zat.
Kafü nundan vacib oldu mümkünat,
Bil ki, sənsən aləmi-zatü sifat.

Gəldi bəydən muştucu bir gündə dört,
Bəy sizə yazdırdı bir köklük yoğurt.
Ol dəxi yarısı su, yarısı dürt,
Bəxşişə türkmanmı yeydir, yoxsa kürt!

Gəlmişəm qalü bəlidən meypərəst,
Aşiqəm, məstəm, vəli məsti-ələst.
Ey gözün sevdalarından fitnə məst,
Sünbülün hər tarəsi mə’nidə şəst.

Bir büsati-eşq imiş şətrənci-zat,
Otuz ikidən gəlibdir kainat.
Uyxudan oyan, anı tanıvü gör,
Olmayasan bu büsata şahi-mat.

Ey münəvvər çöhrənizdən kainat,
Qismət iltər xanınızdan cümlə zat.
Məxfi ikən, zahir oldu dərdimiz,
Otuz iki laməmat, illa həyat.

Ey təbibi-haziqü nazikmizac,
Sən bilirsən xəstə könlümə əlac.
Mən könül ilə sənə qul olmuşam,
Şivə ilə nazına nə ehtiyac?

Doğdu Məğribdən günəş, endi Məsih,
Burğu çalındıvü həşr oldu səhih.
Keç kinayətdən ki, rəmz oldu sərih,
Gör ki, müstəhsənmisən, yoxsa qəbih?

Saqiyi-gülrüx əlindən bir qədəh
İç, pərişan xatirin olsun fərəh.
Mey haram isə, həqin nitqi halal,
Qamu məzhəbdə budur qövli-əsəh.

Dalmışam şol bəhrə kim, payanı yox,
Düşmüşəm şol rəncə kim, xüsranı yox,
Görmüşəm şol bədri kim, nöqsanı yox,
Bulmuşam şol gənci kim, viranı yox.

Dərdinə aşiqlərin dərmanı yox,
Zərqi çox zahidlərin, imanı yox,
Canına hey der və leykən canı yox,
Əhdinə sabit deyil, peymanı yox.

Könlümü yəğmaladı şol alı çox,
Şol qızılgül, rəngi gülgun, alı çox,
Zülfünün sirri uzundur, halı çox,
Şol şəkər sözlü dodağın balı çox.

Ey boyun tuba, üzün darül-xülud,
Hüsnünə xurşidü mah eylər sücud.
Taleyin mülkündə cəm oldu səud,
Sivü dü nuri-xuda, yek nur bud.

Ey camalın qülhüvəllahi-əhəd,
Surətin yazusu Allahü-səməd,
Bir ucu zülfün əzəl, biri əbəd,
Hüsnünə şeytan imiş mən-la-səcəd.

Kim ki, oldu taleyi həqdən səid,
Olmadı şeytan kimi adı mərid,
Kim ki, nəfsin görmədi həqdən bəid,
Gecəsi qədr olduvü əyyamı id.

Ey saçın məhşər, üzün darül-xülud,
Kə’bə üzünə qılır aləm sücud.
Ey saçın buyu əbirü mişkü ud,
Çıxdı eşqin atəşindən çərxə dud.

Ey əzəl nuri-camalın ta əbəd,
Məndə nəqş oldu xəyalın ta əbəd.
Biqürub oldu halalın ta əbəd,
Ey günəş, yoxdur zavalın ta əbəd.

Ey camalın kafü hey, yey, eynü sad,
Mə'niyi-ya sin saçında müstəfad.
Qəddi min-Tuba, əya hurinəjad,
Səcdeyi-vəchində me'racil-ibad.

Gəl, mühiti-eşqə bir gəz dala gör,
Vəhdətin dürrün içindən ala gör.
Adəmə qıl səcdə, kibri sala gör,
Olma şeytan, düşmə məkrü ala gör.

Qaşların yayı məni qurban edər.
Surətin nəqşi könül heyran edər,
Gör bu qüdrət mö'cüzü yəzdan edər,
Cümlə əşya səndə uş seyran edər.

Abü xakı eylədi çün həq xəmir,
Ərşini xəlq eylədi yə'ni sərir,
Hüsnünü şah eylədi, eşqi əmir,
Aşiqü mə'şuq ilə eşq oldu bir.

Yar əlindən çün meyi-dilkəş gəlir,
İçəlim, həqdən nə gəlsə xoş gəlir.
On səkiz min aləmin sirrin bilən
Kə'bəteyni atacaq se şeş gəlir.

Çün həqi hər yerdə aydırsan ki, var,
Səndə bəs həq var imiş, həq səndə var.
Ənbiyanın sirrini bilməz davar,
Qismət olmaz divə rahi-xoşgüvar.

Çox zaman keçdivü çox gəzdi mədar,
Səndən özgə görmədi bir doğru yar.
Hər kimin mənzuru sənsən, ey nigar,
Cənnəti-ə'ladadır leylü nəhar.

Həq təalanın kəlamı səndədir,
Fa vü zad ol bil ki, lamı səndədir.
Rövzənin darüssəlamı səndədir.
Gör kəlamı həm səlamı səndədir.

Gəl ki, sənsən, ərşü kürsi səndədir,
Bistü həştü sivü düsi səndədir,
Ey Məsiha, ruhi-qüdsi səndədir.
Həqmisən, yoxsa ki, əksi səndədir?

Ey könül, həq səndədir, həq səndədir,
Söylə həqqi kim, ənəlhəq səndədir,
Nuri-mütləq, zati-mütləq səndədir.
Müshəfin hərfi mühəqqəq səndədir.

Həq təala varlığı adəmdədir,
Ev onundur, ol bu evdə dəmdədir.
Bilmədi şeytan bu sirri, qəmdədir,
Ol səbəbdən ta əbəd matəmdədir.

Gər həq oldun, həq sifatın qandadır?
Həqsifat ol, gör ki, zatın qandadır?
Gər mühit oldun, cəhatın qandadır?
Ey Kəmax, axar Fəratın qandadır?

Cövhəri-fərd adəmin kanındadır,
Küntə kənzən adəmin şanındadır.
Gərçi şeytan adəmin qanındadır,
Sirri-əsma adəmin canındadır.

Aşiqin seyranı ol aləmdədir,
Bilməyən ol aləmi matəmdədir,
Küntə kənzin cövhəri adəmdədir,
Adəm ol meydir ki, cami-Cəmdədir.

İsanın əsli bilən Məryəmdədir,
Həq Süleyman hakimi xatəmdədir.
On səkiz min aləmin sirrin bilən,
Ol ləqəd kərrəm bəni adəmdədir.

Xeyli müddətdir ki, dərdin məndədir,
Dil sənə bir boynu bağlı bəndədir.
Saldı hicranın ayağımdan məni,
Sən bilirsən, indi mürvət səndədir.

Həq təalanın kəlamı nurdur,
Görməyən ol nuru həqdən durdur.
Çün ənəlhəq söyləyən Mənsurdur,
Gəldi İsrafil, əlində surdur.

Həq sözün gör ki, necə dürdanədir,
Həq sözünü bilməyənlər da nədir?
Cahilü nadan nə bilsin danə dür,
Danəyi dana bilir kim, danədir.

Dutdu üzündən cahanı cümlə nur,
Həq hidayət etdi Mehdidən zühur.
Endi Isa, gəldi Musa, doldu nur,
Zahir oldu mö'minə cənnatü hur.

Hər nə kim təqdiri-yəzdani qılır,
Eyni hikmətdir, həq ərzani qılır,
Şah iki aləmdə sultanı qılır,
Hər nə kim könlü dilər, anı qılır.

Surətin nəqşində qıldı həq zühur,
Üştə müshəf, gəl oxu Allahu nur,
Zülfü rüxsarındadır həşri nüşur,
Ey boyu tuba, üzü cənnati-hur.

Mahımın üzündən oldu pərdə dur,
Gəldi həqdən ayəti-Allahu nur,
Ey xətü xalın təcəlli, üzün Tur,
Surətin mə'nisidir cənnati-hur.

Bil vücudun kim, Süleyman təxtidir,
Həm imarət qıl ki, sultan təxtidir.
Cismini yoğurdu çün can təxtidir,
Həq qatında həşrü mizan təxtidir.

Ləbinə lə’li-canfəza dedilər,
Sormuşam, dərdimə dəva dedilər.
Qamətin balası bəla dedilər,
Bizləri ona mübtəla dedilər.

Ey günəş surətli, yari-dilpəzir,
Təl’ətindən utanır bədri-münir.
Neyləyim ki, mən fəqirəm, sən əmir,
Həsrətindən ürəyim hər dəm ərir.

Surətin müshəfdir, ey bədri-münir,
Xilqətin sər ta qədəmdir dilpəzir,
Əhli-ürfan ol, nə əshabi-sərir
Bil ki, həqdir həm səmi’ü həm bəsir.

Ay ilə günəş üzün heyranıdır,
Mişk ilə ənbər saçın tərxanıdır,
Çün Nəsimi aləmin sultanıdır,
Dövr anın, dövran anın dövranıdır.

Ey iki aləmdə hüsnün binəzir,
Fitnəli qaşın kamandır, qəmzə tir.
Ənbərin zülfün tozundandır əbir,
Məhşər oldu, qopdu hüsnündən nəfir.

Həqqə yar ol, ey könül, yar ol, yetər,
Həqqi çün yar eylədin, var ol, yetər,
Nura nur ol, nara ol nar ol, yetər,
Adəmə oldur səzavar, ol yetər.

Ey hərami gözlərin yəğmaçılar,
Kə’bə üzündür, məlaik hacılar.
Eşqinə ümmət olandır nacilər,
Vey dodağından xəcil halvaçılar.

Usta var əyrivü həm yalançıdır,
Kim dedi yalançıyı, kim nacidir.
Fitnənin başmağı onun tacıdır,
Məkrü al əsrasıvü me’racıdır.

Allahın fəzli bizə oldu bəşir,
Bəşrəna biməğfirən əcrən kəbir.
Yerü göyün mənzərisən, ey əmir,
Yələm-əs-sirr əl-xifa mafil-zəmir.

Ey camalın hüsnünə heyran qəmər,
Sünbülün dövründədir pünhan qəmər,
Ləmyəzəl günəşsən, ey taban qəmər,
Gəl ki, verdi hüsnünə dövran qəmər.

Gəldim uş həqdən, gətirdim xoş xəbər,
Eynü şinü qaf ilə qıldım nəzər.
On səkiz min aləm içrə sərbəsər,
Həqqi gördüm, dopdoludur bəhrü bər.

Qamətin hər dəm qiyamət göstərir,
Gör bu qəddi kim, nə qamət göstərir.
Kə'bə üzündən əlamət göstərir,
Qanlı eynin bax, imamət göstərir.

Qabü-qövseyn iki qaşın yayıdır,
Vəzzühanın şəmsi üzün ayıdır.
Dünvəyü üqba saçın bir tarıdır,
Dür bulur hər kim ki, ol dəryayidir.

Ol nədir kim, hayü huyu altıdür?
Kim görübdür bir sədəfdə altı dür?
Bistü həştdən dışxarı heç nəsnə yox,
Fövq başın, təht ayağın altıdür.

Ey günəş üzlü, camalın fitnədir.
Nunü mimin, eynü dalın fitnədir.
Ey büti-gülçöhrə, alın fitnədir,
Qəmzə cadu, zülfü xalın fitnədir.

Hər ki, sən şirinləb üçün ad oxur,
Xosrovi-xuban şəhi, Fərhad oxur.
Qamətini sərv ilə şümşad oxur,
Gözlərini zalımü bidad oxur.

Çün vücudundur, nigara, şəhriyar,
Surətü mə'nidə sənsən şəhriyar.
Mə'niyi-şəqqül-qəmər çün səndədir,
İstiva eylə camalın, şəhri yar.

Könlümüz bir yar əlindən xəstədir,
Gözü qara, qaşları peyvəstədir.
Naz edərsə nazını çəkmək gərək,
Can fəda qılmaq gərək, növrəstədir.

Şəm'i-rüxünə günəş pərvanədir,
Tən sədəfdir, surətin dürdanədir.
Nüğlü-mey lə'lin, gözün peymanədir,
Məsti-eşqin məscidi meyxanədir.

Fitnənin başı gözün sevdasıdır,
Şurü şər hüsni-rüxün qovğasıdır.
Kövsərin xəmri ləbin səhbasıdır,
İnci dişin lö'löi-lalasıdır.

Saçların qədrü bəratın leylidir,
Aşiqin Məcnunü hüsnün Leylidir.
Həmdəmim daim xəyalın xeylidir,
Surətin sövmü səlatın keylidir.

Əqrəb oldu aləmin xəlqivü mar,
Fitnə yayıldı əla qövmüş-şərar.
Qandadır bir ari batin, doğru yar?
Qanı insafü mürüvvət, kimdə var?

Saqiya, mən sərxoşam, yarım gətir,
Bir qədəh çün dərkəşəm, yarım gətir.
Neylərəm mən sənsizin canü cahan,
Həsbətən lillah sana narım gətir.

Fitnədir eynin, üzün şəmsü qəmər,
Fitneyi-dövri-qəmərsən bəs məgər?
Surətin həqdir, budur həqdən xəbər,
Söyləyən həqdir, vəli adı bəşər.

Şol qaşı çaçı büti-məhvəş gəlir,
Kirpik oxundan dolu tərkəş gəlir.
Həq meyindən gözləri sərxoş gəlir,
Kirpiyi, qaşı hesabı şeş gəlir.

Ey saçın hər tarına min can əsir,
Surətin yektavü adın binəzir.
Surətin yazusu reyhan, həq dəbir,
Həm səm'i-bibədəlsən, həm bəsir.

Yeddidir, dörd yeddidən bir yeddidir,
Yüz igirmi dörd yenə üç yeddidir.
Evi bir, bacası yeddi, babı üç,
Əhli-beyt ilə özü on yeddidir.

Kafü nun mə'nidə külli-mə'nidür,
Yə'ni kafü nun sədəfdir, mə'ni dür.
Məhşərin suru çalındı, yatma, dur,
Gör ki, nə sövdadasan, halın nədür?

Gəl mənə bir söylə kim, iman nədir?
Bu namazü rövzəvü fərman nədir?
Bir kişi kim, qəbləl-mövtü bilmədi,
Ol nə bilsin can ilə canan nədir?

Cənnətin vərdi üzün gülzarıdır,
Şəm'i-vəhdətdir üzün, gül narıdır.
Ay ilə günəş üzün ənvarıdır,
Leylətül-əsra saçın əsrarıdır.

Hər nə yerdə, göydə var, adəmdə var,
Hər nə ildə, ayda var, adəmdə var.
Hər nə əldə, üzdə var, qəddəmdə var.
Həq sözün fəhm etməyən adəm də var.

Həq təala adəm oğlu özüdür,
Otuz iki həq kəlamı sözüdür.
Cümlə aləm bil ki, Allah özüdür,
Adəm ol candır ki, günəş üzüdür.

Arizi yarın cinan bostanıdır,
Ol qədi tuba, saçı reyhanıdır.
Kuyi cənnət, əhli-dil rizvanıdır,
Bəs rəqib bu ortanın şeytanıdır.

Adəm oldur ki, cahanın canıdır,
Adəmə yol bulmayanlar fanidir.
Adəmin vəchində sirri-kainat,
Oxugil ki, qibleyi-rəhmanıdır.

Saf içən hər dəm səfa hasil qılır,
Dürd içən dərdə dəva hasil qılır.
Kim ki, yari-bivəfa hasil qılır,
Canına yüz min bəla hasil qılır.

Məzhəri-sidqü səfa sinəndədir,
Məxzəni-mehrü vəfa sinəndədir.
Xəstə könlümə şəfa sinəndədir,
Hər nə dərd olsa, dəva sinəndədir.

Ey sənəm, eynin xumarı fitnədir,
Kirpiyin qaşınla varı fitnədir.
Zülfi-ənbər, mişkbarı fitnədir,
Cə’di zülfündə şümarı fitnədir.

Sureyi-nuri-düxandır zülfi-yar,
Yə’ni küfr ilə imandır zülfi-yar.
Nə əcəb gənci-nihandır zülfi-yar,
Aşiqə elmi-bəyandır zülfi-yar.

Dilbərin xətti güli-xəndanıdır,
Şol mütərra sünbüli-reyhanıdır.
Can əgər təndən rəvan ola nə qəm,
Əhli-eşqin canı çün cananıdır.

Dust Leylivü könül Məcnundur,
Fitnəli qaşına can məftundur.
Yar vəslin almayan can nəqdinə,
Eşq bazarında key məğbundur.

Çün camalın məhşərin gülzarıdır,
Hovzi-kövsər bəs dodağın yarıdır.
Hər kim olsa vəsli-hüsnündən cüda,
Ona firqət bəs cəhənnəm narıdır.

Pərdə çəkmiş ara yerdə pərdədar,
Pərdə içindən bəri bax gör nə var.
Adəmi gör, adəmi bil, adəmi,
Adəmin əsrarını bilməz davar.

Sivü dü dəndan çü dürri-abidar,
Ləblərin abında heyvan suyu var.
Xızrını zində qılıbdır bu nigar,
Könlümüz çün susadı, ləbdən suvar.

Fəzli-həqdir vaqifi-əsrarımız,
Fəzli həqdəndir qamu ənvarımız.
Fəzli-həq göstərmiş idi karımız,
Fəzli-həqdir, Fəzli-həq me’marımız.

Favü zadü lama düşdü könlümüz,
Kə’bəvü ehrama düşdü könlümüz.
Eşqi-biəncama düşdü könlümüz,
“Cavidani-nama” düşdü könlümüz.

Favü zadü lama düşdü könlümüz,
Nərgisi tək cama düşdü könlümüz,
Sünbülündən şama düşdü könlümüz,
Danə gördü, dama düşdü könlümüz.

Bir əcaib şaha düşdü könlümüz,
Üzü bədrü maha düşdü könlümüz,
Qul kəfa billaha düşdü könlümüz,
Məzhəri-Allaha düşdü könlümüz.

Nagəhan bir şaha düşdü könlümüz,
Üzü bədrü maha düşdü könlümüz,
Ta ki, Fəzlullaha düşdü könlümüz,
Uş həqiqi raha düşdü könlümüz.

Pərdə üzündən götürdü mahımız,
Həqdən oldu, həqqə doğru rahımız,
Surətü mə'nidə həqdir şahımız,
Dinlə lailahə-iləlahımız.

Ey camalın surəti-rəhmanımız,
Ey dodağın çeşmeyi-heyvanımız,
Qaşlarındır razi-sübhanəlləzi
Ey vüsalın şərbəti imanımız.

Məğribü məşriqdən oldu yəslimiz,
Yeddi ulduz, on iki bürc əslimiz,
Bistü həştü sivü düdür nəslimiz,
Fəzli-həqdən oldu babü fəslimiz.

Sənsiz, ey can, könlüm aram eyləməz,
Can yanar, səbr, ey dilaram, eyləməz.
Lə'lini dövlət mana ram eyləməz,
Neyçün, ey sərvi-güləndam, eyləməz.

Üç yüz altmış gündürür dövranımız,
Altı gəz altmış olur ey canımız,
Şeş cəhətdən baxıcaq hər vəch ilə,
Görünür bu məfsəli-insanımız.

Yeddi gəz yeddi olur hər yeddimiz,
İstiva keçdik səkizdir yeddimiz,
Gər kəlamüllaha eylərsən nəzər,
Əlli olur hərfü nüktə yeddimiz.

Gəl rizasın istə həqqin hər nəfəs,
Çünki, həqdir yar iki aləmdə bəs.
Dünya məhmildir, anın dövrü cərəs,
Uçacaq can quşu, boş qalır qəfəs.

İndəhü elmül-kitab ol mah imiş,
Qul kəfa billah Fəzlullah imiş.
Qibləsi aşiqlərin ol şah imiş,
Səcdədən başın çəkən gümrah imiş.

Qaşların kim, qayət ə'la tağ imiş,
Ruh anın me'racına müştaq imiş,
Surətin kim, məzhəri-xəllaq imiş,
Kə'beyi-can qibleyi-üşşaq imiş.

Aşiqin adı nədən abdal imiş,
Anda kim, hərfi həmişə dal imiş,
Hərfi dal olmuş, vücudun tanımış,
Kim ki, bildi nəfsini, abdal imiş.

Surətin tahavü həm yasin imiş,
İki qaşın sureyi-ta sin imiş.
Tur imiş üzün, dişin vəs-sin imiş,
Həq dedi arif səni, ol çin imiş.

Arizin, zülfün sabahü şam imiş,
Xoş ləyalü qutlu bir əyyam imiş.
Bil hüvəl-Qur'anı üzün nam imiş,
Həqqi tanı, favü zadü lam imiş.

Həq təalanın kitabı Tur imiş,
Cümlə əşyada gözün mənzur imiş,
Həqqi bilən aləmə məşhur imiş,
Həqq ilə beyti anın mə'mur imiş.

Adəmin vəchi kəlamüllah imiş,
Surətin lövhü sifatüllah imiş,
Ləblərin camı məsihüllah imiş,
Xilqətin tə'vili Fəzlüllah imiş.

Çünki, Salman oğlu usta var imiş,
Hasili güldən cahanda xar imiş,
Həqqə yaram der, vəli əğyar imiş,
O yalançıdan xuda bizar imiş.

Çün üzündən cümlə əşya oldu faş,
Bəşrəna tüccar qəd cahəl məaş.
Axirət bazarıdır, yoxdur savaş,
Həq kərimdir, alana verir bəlaş.

Əhli-irfanın məqamı Qaf imiş,
Arifi-rəbb, arifi-ə'raf imiş,
Bilməyən ol qafı sözü laf imiş,
Özünü bilən kişi sərraf imiş.

Ey üzün ol lövh kim, məhfuz imiş,
Hər zaman bu növ' ilə məlfuz imiş,
Ənbiya bir nöqtədən məhşuz imiş,
Bu xəbər iblisdən məhfuz imiş.

Cümlə həqdir hər nə kim, mövcud imiş,
Həqqə sacid, həqqü həq məscud imiş,
Çün iki aləmdə bir mə'bud imiş,
Səcdədən başın çəkən mərdud imiş.

Çünki həm əvvəl, həm axır yar imiş,
Küfrü din mə'nidə bir bazar imiş,
Eşqə sufinin işi inkar imiş,
Xirqəsi büt, səbhəsi zünnar imiş.

Dilbərin lə'lində əşya əsrimiş,
Sünbülün leylində əsra əsrimiş.
Nərgisin dövründə sevda əsrimiş,
Gözlərin ayıqmıdır, ya əsrimiş?

Sən üzü mahi-tamamı buldum uş,
Cənnəti-darüssəlamı buldum uş,
Çəkmədən yolda bəriyyə zəhmətin,
Kə'beyi-beytülhəramı buldum uş.

Aləmi üzün gülüstan eyləmiş,
Bülbülü sərməstü heyran eyləmiş,
Ənbəri zülfün pərişan eyləmiş.
Mahını əbrində pünhanı eyləmiş.

Eşq ilə mə'şuqü aşiq bir imiş,
Həm əmən, həm əmzirən, həm şir imiş,
Surətin müshəf, sözün təfsir imiş,
Bil, əcəb qüdrət, əcəb təqdir imiş.

Kün-fəkanın çünki əsli zat imiş,
Cümlə əşya vəhdətə ayat imiş,
Kim ki, heyvan oldu, adı at imiş,
Oynadı atı, vəli şahmat imiş.

Gər həqi görmək dilərsən biqələt,
Üştə gör, fi-surəti-şabi qətət.
Həqdən oldu ümməti-Əhməd vəsət,
Vəchinin lövhündədir sivü dü xət.

Çün əzəldən qüdrət əli biqələt,
Üzünə nəqş eylədi sivü dü xət.
İsmi-ə’zəm cameyi-zati-sifət,
Bəllidir fi surəti-şabi-qətət.

Eşq imiş simurğü aşiq kuhi-Qaf,
Eşqə sığmaz lafü eşq olmaz gəzaf.
Hər kim istər Kə’bəyi qılmaq təvaf,
Həm içi safi gərək, həm daşı saf.

Həq təalanın kəlamı bixilaf,
Üştə vəchində göründü şinü qaf.
Qafü mimü reydən anı qıl şikaf,
Anı çü buldun sana olur kifaf.

Arif olan cahilə eylər məaf,
Əhli-razın səm’inə qılmaz gəzaf.
Hər kim olmaz buteyi-eşqində saf,
Qəlbi ğəşdir, qəlbi ğəşdir bixilaf.

Cənnətin xəmri ləbin eynində saf,
Vəchinə əhli-sücud eylər təvaf,
Zərqü təzvir oldu mə’nidə xilaf,
Mö’minə həqdən irişdi latəxaf.

Ey həqə müştaq olan, uş səndə həq,
Əbcədi unutma, yanılma səbəq,
Ey kitabından üzün gül bir vərəq
Pərdə rəf’ olduvü açıldı təbəq.

Fəzli-həqdən çün hidayət buldu həq,
Surətin təfsirini verdi səbəq,
Latəhərrük ayətindən bir vərəq
Oxuyanlar istivasın qıldı şəq.

Gəl ki, qəmdən canımı yaxdı fəraq,
Razımı naməhrəmə çaxdı fəraq,
Boynuma həsrət ipin taxdı fəraq,
Canımı gör kim, nə xoş yaxdı fəraq.

Çün zümürrüd qıldı eynimi əqiq,
Mubəmu eylər könül fikri-dəqiq.
Dil şinavər oldu dər bəhri-əmiq,
Dür gətirdi, gəl, xəridar ol, rəfiq.

Ey rüxün eşqində sərgərdan fələk,
Üzünə qarşu sücud eylər mələk.
Hüsn içində fərdi-yektasan, nə şək,
Hər kişinin nəqdini çaxar məhək.

Ey günəş, nuri-təcəlladır üzün,
Surətin filcümlə, mə’nadır üzün,
Surəti-biçuni-mövladır üzün,
Əbcəd ilə mim, əlif, badır üzün.

Ey xətin Xızr, abi-heyvandır sözün,
Söylə, ey can, söylə kim, candır sözün!
Surətin ərş ilə rəhmandır sözün,
Ey sözü həq, cümlə Qur’andır sözün.

Həşrü nəşrin afitabıdır üzün,
Saətin yovmül-hesabıdır üzün,
Cənnətin şəm’ü şərabıdır üzün,
Rövzənin hüsnül-məabıdır üzün.

Həqq əyan oldu, gəlin, həqqi görün!
Həqqi batildən seçin, fərqi görün!
Bədrimin üzündəki şəqqi görün!
Aləmə sığmaz ənəlhəqqi görün!

Həqq əyan olduvü getdi şirkü şək,
Vahidin yoxdur şəriki, müştərək.
Çox zaman keçdiyü çox gəzdi fələk,
Səndə gördü mə’dəni-hüsni-nəmək.

Şəm’i-tövhidi-hidayətdir üzün,
Surəti-həqdən kinayətdir üzün,
Bibidayət, binəhayətdir üzün,
Həm nəhayət, həm bidayətdir üzün.

Surəti-həqdən işarətdir üzün,
Əhli-tövhidə bəşarətdir üzün,
Həccü ehramü ziyarətdir üzün,
Cümlə əşyadan ibarətdir üzün.

Aşiqə iman ilə dindir üzün,
Bir adı bütxaneyi-Çindir üzün,
Əbcədü tahavü yasindir üzün,
Ərşü kürsi, Turi-sinindir üzün.

Aşiqin beytülhəramıdır üzün,
Arifin Darüssəlamıdır üzün,
Əhli-imanın imamıdır üzün,
Dünyəvü üqba tamamıdır üzün.

Eşqin əhli bisərü saman gərək,
Dostu üçün zarü sərgərdan gərək,
Hər kimə kim, mülki-cavidan gərək,
Fitnə qaşın yayına qurban gərək.

Fəzli-həqqin “Cavidanıdır” üzün,
Aləmin doğru nişanıdır üzün,
Əhli-ə’rafə məanidir üzün,
Bütpərəstin şəm’i-xanıdır üzün,

Qibleyi-ərbabi-taətdir üzün,
Nüsxeyi-işrət, səadətdir üzün,
Sanei-sün’i-sənaətdir üzün,
Gör necə yövmi-şəfaətdir üzün.

Məhşərin xurşidü mahıdır üzün,
Hər nə kim, vardır kəmahıdır üzün,
Surəti-həqqin güvahıdır üzün,
Sivü dü nitqi-ilahidir üzün.

Məzhəri-əsmai-küll oldu üzün,
Həqqə varmaq doğru yol oldu üzün.
Hadiyi-cümlə rəsul oldu üzün,
Sağərü saqiyü mül oldu üzün.

Dörd gərək, dörd dörd gərək, bir dörd gərək,
Yeddisi xətt istiva, üç dörd gərək,
Seyyidi çoxlar söyər dəhri deyib,
Kəndözün bilənlərə beş dörd gərək.

Ayəti-səb'ülməsanidir üzün,
Otuz ikinin nişanidir üzün,
Bağü cənnət ərğəvanidir üzün,
Mehrü mahın ərməğanidir üzün.

Ayəti-səb'ülməsanidir üzün,
Dörd kitabi-asimanidir üzün,
Müshəfi-həqqin bəyanidir üzün,
Rövzeyi-xüldün nişanidir üzün

Gövhəri-bəhri-hədayiqdir üzün,
Badeyi-nüqli-sədayiqdir üzün,
Gör necə incə dəqayiqdir üzün,
Qibleyi-külli-xəlayiqdir üzün.

Yeddi yerdə otuz ikidir üzün,
İgirmi səkkiz göstərər iki gözün.
Qamətin səksən səkkiz edər bəyan,
Yetmiş iki bildirər nitqü sözün.

Söylə, ey ziba ki, zibadır sözün,
Ərşü ərrəhmanü tahadır sözün,
Gəl ki, əsmavü müsəmmadır sözün,
Nəfxeyi-nitqi-Məsihadır sözün.

Tutiyi-cana şəkərdir sözlərin,
Söylə, ey bülbül ki, tərdir sözlərin.
Gəl, nisar eylə ki, dürdür sözlərin,
Lə'lü yaqutü göhərdir sözlərin.

Ey büti-şirin ki, şəkkərdir ləbin.
Şəhdilə qəndi-mükərrədir ləbin,
Abi-Xızrü, cuyi-kövsərdir ləbin,
Lə'l ilə yaqutü əhmərdir ləbin.

Bənzəmiş mahi-hilala qaşların,
Başladı məkr ilə ala qaşların,
Aşiqə oldu həvalə qaşların,
Qəsd edər ki, canı ala qaşların.

Sehr ilə qurub kamanı qaşların,
Canımı qıldı nişanı qaşların,
Tökdü nahaq yerə qanı qaşların,
Yoxmudur insafı, qanı qaşların?

Seyd edər, səyyadi-candır gözlərin,
Fitneyi-axırzamandır gözlərin,
Bildilər kim, biamandır gözlərin,
Dilə gəlməz dilsitandır gözlərin.

Mənə ol dəm naz ilə baxdı gözün,
Hicr oduna canımı yaxdı gözün,
Adımı məlamətə taxdı gözün,
Razımı aləmlərə çaxdı gözün.

Tiz edər canıma xəncər kirpiyin,
Qıldı dil mülkün müsəxxər kirpiyin,
Hökm ilə xunrizü kafər kirpiyin,
Aləmi dutdu sərasər kirpiyin.

Bir xədəng atdıqda yara, kirpiyin,
Min cigər dilər ki, yara kirpiyin,
Bağrıma çox vurdu yara kirpiyin,
Yaxındır kim, yara, yara, kirpiyin.

Aşiqin canına batar kirpiyin,
Sehr oxunu daim atar kirpiyin,
Ləşkəri-yəğmaçı tatar kirpiyin.
Aləmi bir heçə satar kirpiyin.

Can kimi sirri nihandır ağzının,
Varlığı dəxi gümandır ağzının,
Abi-kövsər, Xızrı candır ağzının,
Nitqi dür kimi əyandır ağzının.

Canıdır çün abi-heyvan ağzının,
Zindəsidir cism ilə can ağzının.
Nitqidir dərdimə dərman ağzının,
Yeri var canımda pünhan ağzının.

Nafeyi-Çinü Xətadır bənlərin,
Daneyi-dami-bəladır bənlərin,
Məcməri-şəm'i-səfadır bənlərin,
Mülki-Ruma padişadır bənlərin.

Mişki-tərdən danələr can bənlərin,
Rövşən etdi ənbərəfşan bənlərin,
Qıldı Hindustanı nalan bənlərin,
Oldu Rum elinə sultan bənlərin.

Oldu çün abi-müəlləq qəbqəbin,
Kuyi-simindürür əlhəq qəbqəbin,
Sibi-cənnətdir mühəqqəq qəbqəbin,
Badeyi-paki-mürəvvəq qəbqəbin.

Sərvəra, sərvi-rəvandır qamətin,
Aşiqə ruhi-rəvandır qamətin,
Ər'əri-baği cinandır qamətin,
Şaxi-tubadan nişandır qamətin.

Tə'n edər qənd ilə bala ləblərin,
Rəng verir yaqutü lə'lə ləblərin,
İrməsin hərgiz zavala ləblərin,
Mərhəm oldu xəttü xala ləblərin.

Gövhərü dürri-məani dişlərin,
Seyr edər ol laməkani dişlərin,
Gördü çün kim, binişani dişlərin,
Otuz iki gizli kani dişlərin.

Riştəyə gövhərdir, ey can, dişlərin,
Dürri-yetimdir firavan dişlərin,
Lə'l ilə mərcandır, ey can, dişlərin,
Qılsa mən dərvişə ehsan dişlərin.

Mürdəyə canlar nisar eylər dilin,
Kafü nundan yoxu var eylər dilin,
Bülbülü aşiqi-zar eylər dilin
Kim, ənəlhəqdə qərar eylər dilin.

Pərdə götrüldü üzündən dilbərin,
Üzü göründü üzündən dilbərin,
Gənc zahir oldu, ey gənc istəyən,
Adəmü Həvva üzündən dilbərin.

Taliba, əvvəl qədəm üç dörd gərək,
Dördü dörddür, dördünə üç dörd gərək,
Əqrə-əl-Qur'an əla hərfi ki var,
Yar üzündə dəxi səksən dörd gərək.

Dideyi-ürfanı aç bidar isən,
Eşq camın nuş qıl huşyar isən,
Olma qafil talibi-didar isən,
Sərdən əl yu sərvəri-sərdar isən.

Usandım mülkü malından cahanın,
Mana zövqü gərəkməz bu cahanın,
Necə nuş eyləyim dövran əlindən,
Həlahil zəhri axır bu zamanın.

Vəzzühanın afitabıdır üzün,
Dilbərin vəchi-kitabıdır üzün,
Xeymeyi-miadi-canın eylə bil,
İşbu mə'nidən tənabıdır üzün.

İsmi-ə'zəm bilməyən insan degil,
Əhsəni-təqvim ilə ehsan degil,
Sanma kim arif olubdur həqq ilə,
Həqqi bilməz, bəs nədən heyvan degil?

Ol bilir həqqi ki, yalançı degil,
Hər ki, yalan söylər, ol naci degil,
Həccə doğru varmayan hacı degil,
Doğru söz doğrulara acı degil.

Ey camalın bibədəl, hüsnün cəmil,
Cümlənin məqsudu sənsən eylə bil.
Ey boyun Tuba, dodağın səlsəbil,
Hüsnünə canlar fəda, aləm səbil.

Ey üzündən hurü qılman münfəil,
Ey qaşından mahi-taban münfəil,
Ey ləbindən abi-heyvan münfəil,
Ey xətindən vərdü reyhan münfəil.

Ey behiştdən tazə gəlmiş tazə gül,
Hövzi-kövsər rövşən ilə tazə gül,
Hüsnünə ey şahi-aləm, cümlə qul,
Kimdürür deyən səni kim, həq degül?

Pərdəsiz mə'budunu gör, abid ol,
Olma şeytan, gəl turaba sacid ol!
Cənnət bağı, nəimi-xalid ol,
Keç ikilikdən, əliftək vahid ol!

Mən otuz iki hürufam ləmyəzəl,
Yoxdur ortağım, nə mislim, nə bədəl,
Çün əbəddir axırım əvvəl, əzəl,
Əvvəlü axır mənəm izzə və cəl.

Çünki sənsən hər nə kim var, ey könül,
Kimdən umarsan əta, var, ey könül.
Çün yetərsən sən sənə yar, ey könül,
Yarını bil, olma əğyar, ey könül.

Höccətüllah oldu nitqin, natiq ol!
Həqqə ixlas eylə, həqqə sadiq ol!
Gər liqa həqdən umarsan, aşiq ol,
Xaliqin ləfzin gör, andan xaliq ol!

Həq sevər xubuvü həqdən həqqi bil,
Sureyi-vətturu tanı, rəqqi bil!
Gör bu bədrin istivasın, şəqqi bil,
Nara salma sən anı, uçmağı bil.

Raziqi-ərzaqımız mər'əş degil,
Rizqi mər'əşdən umarsan, xoş degil.
Kim ki, arıtmaz için biğəş degil,
İki üçü, kim dedi kim, şeş degil?

Eşqimiz baqivü hüsnün layəzal,
Eşqə sığmaz çunü çəndü qeylü qal,
Ləmyəlid hüsnün, vələmyuləd camal,
Hüsnünə sübhanəhü cəllə-cəlal.

Qamətindən sərvü ər'ər münfəil,
Gül üzündən vərdi-əhmər münfəil.
Kakilindən mişkü ənbər münfəil,
Ləblərindən şəhdü şəkkər münfəil.

Keç ikilikdən, əliftək vahid ol,
Həqqi gör adəmdə, həqqə saçid ol!
Gəl vəfanın bəhrinə dal, xalid ol,
Kə'bəyi tanıvü lata abid ol!

Gəl ki, sənsiz biqərar oldu könül,
Düşdü qəmdən sayru, zar oldu könül,
Dərdimə həmdəm nə yar oldu könül,
Gör nə zaye ruzigar oldu könül!

Gözlərin sevdasına düşdü könül,
Fitnənin qovğasına düşdü könül,
Altı dördün tasına düşdü könül,
Vəhdətin dəryasına düşdü könül.

Bir əcaib dilbərə düşdü könül,
Bir əliyetməz yerə düşdü könül,
Bir məhi-nikəxtərə düşdü könül,
Bir büti-siminbərə düşdü könül.

Həqqə doğru baxü həqqi doğru bil,
Doğru qövl ol, doğrufe'l ol, doğrudil.
Çün buyurdu əscidu rəbbül-cəlil,
Əscidu etməzmi insana dəlil?

Ol camalın afitabi-layəzal,
Ey dodağın çeşmeyi-abi-zülal,
Barəkəllah, ey həbibi-xoşxisal,
Yoluna canım fəda, qanım halal.

Bil ki, kəl-ən'am ola bəlhüm əzəl,
Hüsnünə hər kim ki, mən layəstədəl,
Çün üzündə cümlə əşya mö'tədəl,
Əvvəlü axırda sənsən ləmyəzəl.

Kim ki, bildi adəmi, insandır ol,
Bilməyən anı yəqin şeytandır ol,
Səcdədən çəkdi başın divi-rəcim,
Eylə sandı qeyri-ərrəhmandır ol.

Üzünü həqdən çevirmə, həqqi bil,
Sureyi-vətturi tanı, rəqqi bil,
Mustafanın barmağında şəqqi bil,
Səlsəbil oldu dodağın, zövqi bil.

Bivəfa dünyadan usandı könül,
Yox dedi, dünyayı yox sandı könül,
Düşdü eşqin oduna yandı könül,
Vəhdətin qəndabına qandı könül.

Adımı həqdən Nəsimi yazərəm
Bil bu mə'nidən nə siməm, ya zərəm.
Həm büti-uşadıcı, həm Azərəm,
Həm hidayət eylərəm, həm azərəm.

Oldum Israfilü həm sur olmuşam,
Gör ənəlhəqdən nə Mənsur olmuşam.
Səlsəbiləm, cənnətü hur olmuşam,
Gəncə viran, eşqə mə’mur olmuşam.

Ey cahan eşq əhlinə sənsiz haram,
Hər dəm olsun üzünə yüz min salam!
Surətin müshəfdir, ey tubixuram,
Kirpigin, qaşınla zülfündür kəlam.

Ey camalın məzhəri-zati-qədim,
Surətin Allahu rəhmanür-rəhim,
Hüsnünə cümlə məlaik, insü cin
Səcdə qıldı, qeyri şeytanir-rəcim.

Pərdə üzündən götürdü həq tamam,
Gəl həqin didarını gör, vəssalam.
Çıxdı ərşüllah, xətm oldu kəlam,
Gəncini faş eylədi beytülharam.

Mən əzəldən məstü sərxoş gəlmişəm,
Xızra su, Musaya atəş gəlmişəm,
Lövhi-məhfuzam, münəqqəş gəlmişəm,
Çarü pəncü həft ilə şeş gəlmişəm.

Mən vücudi-mütləqəm, mütləq derəm,
Həq tanıqdır, həq bilir kim, həq derəm,
Küntə-kənzin sirrini müğləq derəm,
Eylədi barmağilə ay şəq derəm.

Mən əzəldən eşq ilə pir olmuşam,
Gah iki anınla, gəh bir olmuşam,
Əhsəni-surətdə təxmir olmuşam,
Qadirəm hər əmrə, təqdir olmuşam.

Bulmuşam həqqi, ənəlhəq söylərəm,
Həq mənəm, həq məndədir, həq söylərəm.
Gör bu əsrarı nə müğləq söylərəm,
Sadiqəm qövlümdə, səddəq söylərəm.

Çün əzəldən ta əbəd baqi mənəm,
Kün-fəkanın xəlqü xəllaqi mənəm,
Vəhdətin bəzmində çün saqi mənəm,
Ənfusun ayatü afaqi mənəm.

Rövzeyi-rizvan üzündür, vəssalam,
Surəti-rəhman üzündür, vəssalam,
Ərşi-həq, ey can, üzündür, vəssalam,
Lövh ilə Qur'an üzündür, vəssalam!

Səcdə əmrin tutmayan şeytani-şum,
Həq yaratmış anı min narəssəmum.
Gəlmədi şeytana çün həqdən ülum,
Ol cəhulun adıdır həqdən zülum.

Surətin nəqşində heyran olmuşam,
Vəslinə ulaşalı can olmuşam.
Əqləsığmaz gənci-pünhan olmuşam,
Laməkan təxtində sultan olmuşam.

Fəzli-həqdən mən hidayət bulmuşam,
Surətin nəqşini ayət bulmuşam,
Mərtəbə aləmdə qayət bulmuşam,
Ol səbəbdən mən vilayət bulmuşam.

Lövh ilə Qur'an üzündür, vəssalam,
Həq təaladan gələn sənsən kəlam.
Surətin dövründə hüsn oldu tamam,
Ey saçın taha, üzün beytülharam.

Gördüm ol ayıvü bayram eylədim,
Ol ləbi mey, gözləri cam eylədim.
Həccə vardım, əzmi-ehram eylədim,
Favü zadü lamı həq nam eylədim.

Laməkanın təxtinə sultan mənəm,
Küntə-kənzin sirrinə bürhan mənəm,
Həmdəmi-Isavü həm Imran mənəm,
Cənnətü baqivü həm rizvan mənəm.

Məstəm ol meydən ki, məxmur olmazam,
Həqdən ayruq ta əbəd dur olmazam.
Çün mən ol sağam ki, rəncur olmazam,
Qəm degil gər divə məşhur olmazam.

Müshəfin hərfivü övraqı mənəm,
Küllə şey'in halikə, baqi mənəm.
Mey mənəm, sağər mənəm, saqi mənəm,
Aləmin səmmivü tiryaki mənəm.

Vəchimi Allaha təslim etmişəm,
Surəti-rəhmana tə'zim etmişəm,
Nitqimi əşyada təqsim etmişəm,
Gör bu əsrarı nə təfhim etmişəm.

Vəhdətin şəhrində seyran eylərəm,
Mən səni cismində heyran eylərəm,
Gəncimi adəmdə pünhan eylərəm,
Adəmi həm həq, həm insan eylərəm.

Hər nəyə kim baxıram, həq baxıram,
Baxışım həqdir, ənəlhəq baxıram,
Mütləq oldu, həqqi-mütləq baxıram,
Bigüman həqqəm, mühəqqəq baxıram.

Elm içində bəhri-payan olmuşam,
Laməkan gəncinə viran olmuşam,
Eşq içində gör nə heyran olmuşam,
Cism içində sərbəsər can olmuşam.

Dilbərin yolunda canı tərk edəm,
Can nədir, iki cahanı tərk edəm.
Can kimi şirinsən, ey şirindəhan,
Mən necə şirin dəhanı tərk edəm?

Nagəhan bustana girdim sübhdəm,
Lalənin əlində gördüm cami-Cəm.
Susən eşitdim ki, aydır dəmbədəm:
Dəm bu dəmdir, dəm bu dəmdir, dəm bu dəm.

Nari-eşqin şö’ləsindən yanmışam,
Cigərim qanı ilə boyanmışam,
Xandasan, ey Fəzli-zülərşi-əzim,
Mən fəraqından zi-can usanmışam.

Həqqə səndən qoyma kim, dad eyləyəm,
Ta əbəd səndən həqi yad eyləyəm,
Sə’yini heç, umunu bad eyləyəm,
Qəmdə yanan düşməni şad eyləyəm.

Üzünə cabbari-aləmdən salam,
Olmasan, ey bədrsima, layənam,
Çün camalın nəssidir, eyni-kəlam,
Məzhəri-Allahü əkbərsən tamam.

Mənzili-Məhmud imiş ali məqam,
Ol məqamı istə həqdən, vəssalam,
Gərçi adıdır qəmər ayın müdam,
Dolmayınca olmadı bədri-tamam.

Çün yazıldı vəchin üzrə bavü lam,
Adəmi-xaki durar kövneynə cam.
Sivü dü nitqi-ilahidir kəlam,
Kim ki, bildi nitq, həqq oldu tamam.

Fəzli-bismillahir-rəhmanir-rəhim,
Surətin lövhündə yazmışdır qədim.
Həqqi-mütləq sənsən, ey Fəzli-əzim,
Ey üzü cənnatü firdövsi-nəim.

Var üzündə bistü yek hərfi-qədim,
Çün üzün oldu siratül-müstəqim,
Əbcədü taha üzün ərşi-əzim,
Surətin lövhündə həq oldu müqim.

Gözlərin əsrarını faş eylərəm,
Gör nə meydən içərəm, aş eylərəm,
Görməyən həqqi adın daş eylərəm,
Arifə təhsinü şabaş eylərəm.

Yara hər saət salam olsun, salam,
İşrətü eyşi müdam olsun, müdam,
Yarsız söhbət haram olsun, haram,
Yara bu mə'na tamam olsun, tamam.

Olmadı çün həqqə iqrarın bütün,
Oldu anlardan məgər layövqünün,
Bilmədin çün həqdə vavü mimü nun,
Tənciyə varsa gərəksə tünbətün.

Ey özündən bixəbər qafil, oyan!
Həqdən olma yadü həm batil, oyan!
Olma fani aləmə mail, oyan!
Mə'rifətdən nəsnə qıl hasil, oyan!

Ey dolu səndən cahan, səndə cahan,
Həm cahanın eynisən, həm cismü can,
Qaşların hərfində oldu kün-fəkan,
Səndən oldu hər nə kim, oldu əyan.

Ey üzün bağında sünbül laləçin,
Arizin güldür, saçındır mişki-Çin.
Ey özün doğru, hədisin cümlə çin,
Düşdü ənbərçin saçından mişkə çin.

Pərdədən mahi-tamam oldu əyan,
Qibləvü beytülhəram oldu əyan,
Sufiyə mey ver ki, cam oldu əyan,
Zöhd imiş sevdayi-xam, oldu əyan.

Canımı yandırdı şövqün, qandasan?
Bundasan, mə'nidə, gərçi andasan.
Ey qəmərüzlü, məhi-tabəndəsən,
Gəl ki, şəksiz baqiyü payəndəsən.

Məğribü məşriqdə həqdir söyləyən,
Qanı bir aşiq bu gün həq istəyən?
Həqq əyan olduvü həqqi görməyən
Oldu şeytan, adəmi həq bilməyən.

Həq təcəlli eylədi Musa üçün,
Həm Əristalisü Busina üçün.
Ey könül, sən huri-məhsima üçün,
Səcdə qıl, şol qaməti bala üçün.

Həq-təala pərdəsiz oldu əyan,
Sur uruldu suri-İsrafil oyan.
Ey üzün həqdən otuz iki nişan,
Müshəfin əsrarını qıldı əyan.

Gər səni sən tanımışsan bigüman,
Səndədir həq, sən də gör həqqi əyan,
Ruhi-qüdsün nəfxəsindən yə'ni can,
Cavidan ol, heyyü heyyi-cavidan.

Gər sən istərsən həqi bilmək yəqin,
Gəl Nəsimidən apargil rəh bədin,
Tə'vil eylə ayəti-Turü sinin,
Gər olam dersən min əshabül-yəqin.

Müddəti-hicrində oldum pir mən,
Bulmadım heç növ ilə tədbir mən,
Ey gözüm nuru, sən olsan bir mən,
Eyləsəm əhvalımı təqrir mən.

Həmdülillah, yarımın gördüm üzün,
Dilruba dildarımın gördüm üzün,
Türrəsi tərrarımın gördüm üzün,
Gözləri məkkarımın gördüm üzün.

Həşri-məqsudi-xəlayiq ya əmin,
Fəzli-həqdir rəhmətən-lilaləmin,
Fəzləhü vəlqüvvəti-həblülmətin,
Yutiyə min yəşa ələl-yovmədin.

Çünki həqqi görmüşəm eynül-yəqin,
Olmuşam elm ilə həm elmül-yəqin.
Həqq ilə çün vasil oldum mən yəqin,
Tanıdım, bildim səni həqqül-yəqin.

Əlləməl-əsma ibarətdir nədən?
Sureyi-taha işarətdir nədən?
Adəmi-xaki kinayətdir nədən?
Lövhi-məhfuzi bəşarətdir nədən?

Ey günəş, mən bundayam, sən andasan,
Taqətim sənsiz kəsildi, qandasan?
Şol günəş rüxsara, ey məh, bəndəsən,
Sən ana ta bəndəsən, tabəndəsən.

Həqdən agah ol ki, həqdir cavidan,
Həq buyurdu min əleyha küllə fan.
Qoy cahanı, gəl ki, fanidir cahan,
Gör necə hər gün keçər bu karivan.

Çox xəlayiq gəldivü keçdi zaman,
Dedilər ki, bir söz vardır nihan.
Gəldi Fəzlullah imami-qeybdan
Küntə kənzin sirrini qıldı əyan.

Həq götürdü pərdəyi, oldu əyan,
Suruna urdu dəm Israfil, oyan.
Ey boyun həqdən otuz iki nişan,
Müshəfin əsrarını qıldım bəyan.

Gər dilərsən xaliqi etmək əyan,
Hərfi sözsüz necə eylərsən bəyan?
Hərfdən özgə xaliqə yoxdur nişan,
Gər tapıbsan, gəl, bəyan eylə rəvan.

Fəzli-həqdir cümlə əşya yaradan,
Bilmədi şeytan qaçdı aradan,
Qılmaz idi adəmə səcdə nədən,
Adəm idi leyk çün sahibbədən.

Necə kim, ögüt verirəm dilə mən
Kim, cahanı yardan özgə diləmən,
Gər dilim, yar, qeyrinə meyl eyləsə,
Öz dilim ilə dilimni diləmən.

Ey könül, hər yana pərvaz eyləmə,
Çün kəbutər tö'meyi-baz eyləmə,
Kimsənin sirrini kimsə saxlamaz,
Dəgməyi sən məhrəmi-raz eyləmə.

Həqqi batil sanma, həq yoxdur demə,
Rəbb mənəm, rəbbül-fələq yoxdur demə.
Yazıçı, yazu, vərəq yoxdur demə,
Şəm'i yandırma, qəsəq yoxdur demə.

Qandadır yar, ey könül, yar istəmə,
Çün vəfa yoxdur, vəfadar istəmə,
Dünyada kim der vəfa var, istəmə,
Çün vəfası yox, vəfavar istəmə.

Can fəda, canlar fəda ənfasına,
Səcdə qıl çünkim, demiş balasına,
Düşdü aləm nəfsinin qovğasına,
Cahil irməz zülfünün yektasına.

Qaşü kirpik yeddi oldu saç ilə,
Həq kitabı uşbu babdan açıla.
Çünki bu sirr kəşf oluban saçıla,
Məğbun ola ol bu təhlu xaç ilə.

Oldu çün dövlət müyəssər başına,
Yaraşır zərrin küləhlər başına.
Dövləti-həq endi əfsər başına.
Həm fəda min taci-qeysər başına.

Mə'rifət kəsb etmədin sən fanisən,
Bir-iki gün dünyanın mehmanisən,
Həqqi bilsən aləmin sultanisən,
Bilməsən xud div ilə şeytanisən.

Munca huvü hayümunca hayü hu
Üç arıq oğlaq imiş içi quru.
Gərçi oldu bəxşişin adı ulu,
Bağrımı qıldı bu bəxşiş yaralu.

Aşiqindir yerü göy, şəms ilə mah,
Həq desəm gər hüsnünə, olmaz günah.
Sirrini səndə nihan etdi ilah,
Kəndözün bil kim, olasan padişah.

Gər irəsən surətin mə’nisinə,
Biləsən surət nədir, mə’nisi nə.
Əhli-mə’ni şişəsinə atma daş,
Heyf ola kim, şişeyi-mə’ni sınə.

Əslini qoydum yapışdım fər’inə,
Fikr qıldım mən Cəlilin sün’inə.
Bu vücudi-pakdan qıldım sual,
Bu sualın əsli sənsən, fər’i nə?

Üç əlif bir eyn ilə yazdım belə,
Üç əlif bir eyn ilə gəlməz dilə.
Üç əlif bir eyn ilə gəlsə belə,
Müstəid arif gərək anı bilə.

Mən kəbutər görmədim kim, baz ola,
Hüsn içində dər-cahan şahbaz ola,
Sən təki kimdir cahanda bir dəxi,
Gəh kəbutər dər-cahan, gəh baz ola.

Rəşk edər mahi-münəvvər alnına,
Müştəri can ilə çakər alnına.
Şərh edib olmaz bərabər alnına,
Gər enə xurşidi-xavər alnına.

Bir xəyal etdim gümandır belinə,
Dedi kim, muyi-miyandır belinə.
Aşiqəm munca zamandır belinə,
Can dilərsən dərmiyandır belinə.

Ey qəmər zülfün şəbində rusiyah,
Mehri-rüxsarın qatında tirə mah.
Keçməyən eşqində ömr oldu təbah,
Taətindən özgə taətlər günah.

Ey üzün ümmül-kitabü fatihə,
Qaşların vəhyü xitabü fatihə,
Saxlamış mahı niqabü fatihə,
Canfəza lə'lin şərabü fatihə.

Canımın lə'lin meyidir cam ilə,
Zülfü xalın danəsidir dam ilə.
Mən zamanı bulməzam əyyam ilə,
Vahidəm şol zati-biəncam ilə.

Düşmüşəm məstanə eynin alinə,
Canfəza gülgün yanağın ali nə?
Ey çəkən barmağı ayın alinə,
Oldu hüsnün fitnə yasin alinə.

Səcdə eylər üzünə mehr ilə mah,
Mişki-Çin saçından oldu rusiyah.
Ərşi-rəhmandır üzün, həqdir güvah,
Xubluğun Misrində sənsən padişah.

Fəzl rəbbi-zülcəlal oldu bizə,
Möhsünü hüsnü camal oldu bizə.
Atamız sahibkamal oldu bizə,
Anamız südü halal oldu bizə.

Məscidü meyxanə bir oldu bizə,
Div ilə şeytan əsir oldu bizə,
Qəm fərəh, tikən hərir oldu bizə,
Dilbərin eşqi əmir oldu bizə.

Verməmək dil dilbərin geysusuna,
Sığmaya aşiqlərin namusuna.
Sər fədadır fitneyi-cadusuna,
Can dəxi qurban kaman əbrusuna.

Yarını heç vəqfi-əğyar eyləmə,
Div ilə ulaşma, bazar eyləmə!
Həqdən özgə sən sana yar eyləmə,
Əhsəni-təqvimə inkar eyləmə!

Ey saçın buyu Məsihanın dəmi,
Fitnəyə hüsnün buraxdı aləmi.
Küntə kənzin sirridir, eşqin qəmi,
Olmadı şeytan bu sirrin məhrəmi.

Ey qəmər təl'ətli şəmsi-xavəri,
Rövzə üzündür, dodağın kövsəri.
Gər səni görsəydi duşunda pəri,
Oda salaydı otuz iki pəri.

Ey qaşınla kirpigin, zülfün yedi,
Ol yedi kim, şeytan anı bilmədi.
Həq bu sirri Əhmədə kəşf eylədi,
Anın üçün adını ümmi dedi.

Həq siyam ayın bizə id eylədi,
Hər nə kim, həq eylədi, cid eylədi.
Kim ki, həqqi didü vadid eylədi,
Adını həq əhli-tövhid eylədi.

Həq dedi kim, yer yedivü göy yedi,
Laməkan təxtində gizlidir yedi.
Gizlü adəmdə əyan oldu yedi,
Dörd yedi bir gəz nədən oldu yedi?

Zülfi-ənbərsaya verdim könlümü,
Lə'li-ruhəfzaya verdim könlümü,
Qaşıtək sevdaya verdim könlümü,
Gör nə möhkəm yaya verdim könlümü?

Şol boyu rə'naya verdim könlümü,
Şol gözü şəhlaya verdim könlümü,
Şol günəşsimaya verdim könlümü,
Şol üzü çün aya verdim könlümü.

Nagəhan bir aya verdim könlümü,
Can ilə yəğmaya verdim könlümü,
Hüsnü bihəmtaya verdim könlümü,
Müntəha balaya verdim könlümü.

Surətin müshəfdir, ey can parəsi,
Cana kar etdi fəraqın yarəsi,
Lütfü hüsn ol müshəfin separəsi,
Qandadır vəslin dəvası, çarəsi?

Gəl bu gün işrət günüdür, al meyi,
Daima nüql eylə, görgil almayi,
Qamusunun xisləti birdir, vəli,
Müstəidlər fərq edərlər al meyi.

Adəmə gəl, adəmi bil, adəmi,
Adəmi olanların budur dəmi,
Bu dəmin damındadır damın dəmi,
Həq rüxün ruhu dedi, nə adəmi.

Cümlə mövcudata illətdir üzü,
Əslü fər'ü dinü millətdir üzü,
Uş sifatü zati-izzətdir üzü,
Kainata nuri-rəhmətdir üzü.

Sureyi-əsrada gördüm üzünü,
Müntəha balada gördüm üzünü,
Sureyi-tahada gördüm üzünü,
Əlləməl-əsmada gördüm üzünü.

Həq mana bir xirqə biçdi kəndözü,
Oldu pünhan xirqə içrə kəndözü,
Həqqə mən bir ayətəm həqkən düzü,
Həqqi həq həq zahir etdi kəndözü.

Ey mənim könlümnü alan gözləri,
Ey mənim bağrımnı dələn sözləri,
Mən şikayət kimdən edim, ey həbib,
Özləridir, özləridir, özləri.

Surətinə kim ki, baxdı sərsəri,
Şah əlindən qaçan içər kövsəri?
Ey pəri siminbəri, bir bax bəri,
Çəkmə aşiq üstünə qəmdən çəri.

Bir əcaib şaha verdim könlümü,
Bədr üzlü maha verdim könlümü,
Ta ki, Fəzlullaha verdim könlümü,
Bigüman Allaha verdim könlümü.

Gözləri pürxaba verdim könlümü,
Ləbləri qüllaba verdim könlümü,
Ol üzü məhtaba verdim könlümü,
Öz-özüm qərqaba verdim könlümü.

Ey könül, Mənsur ənəlhəq söylədi,
Həqq idi, həqqi dedi, həq söylədi,
Mə'rifət sirrini mütləq söylədi,
Arif amənna vəsəddəq söylədi.

Dilbərim rindanə geymiş çəkməni,
Tut əlimdən otağına çək məni.
Həsrətindən olmuşam öylə zəif,
Firqətindən çaha düşdüm, çək məni.

Kim ki, bilməz öz vücudi-zatını,
Sormagil andan anın isbatını.
Oynamaz şətrənci-eşqin atını
Bilməyən bu zövqi-eşq şahmatını.

Mə'rifət əhlinə həq bina dedi,
Vəlləzinə cahüdü finna dedi,
Sən səni, kəndi vücudün görmə xar,
Həq sənin şə'nində kərrəmna dedi.

Ey ləbin vəsli həyati-sərmədi,
Xəttü xalındır camalın əbcədi,
Kirpik ilə zülfü qaşındır yedi,
Ol yedi kim, Əhmədi məst eylədi.

Surətin lovhündə xətt oldu yedi,
Fəzli-həqdən bizə kəşf oldu yedi,
Qaimü daim üzündür sərmədi,
Həq kitabıdır camalın əbcədi.

Ta ki, yarın söhbəti şirin idi,
Lacərəm könlüm ona şirin idi,
Aşiqü mə'şuqəm ol məhbub idi,
Eylə kim, Fərhad ilə Şirin idi.

Bir bölük fəxr əhli gördüm, yar idi,
Yar idi, məqsudları didar idi,
Yarəli xatırlarında yar idi,
Yar idi, hicranda ağlarlar idi.

Ey üzün ol lövh kim, məhfuz idi,
Hər zaman bir növ ilə məlfuz idi.
Ənbiya bu nöqtədən məlfuz idi,
Bu xəbər Iblisdən məhfuz idi.

Kim ki, həqdən tutmadı pənd, ey kişi,
Önmədi həqdən onun hərgiz işi,
Adı nə erkəkdir anın, nə dişi,
Çeynəsin barmağını anın dişi.

Adəmi fəzli-xuda bil, adəmi,
Kainata kəndxuda bil adəmi,
Sən dirəxti-müntəha bil adəmi,
Sahibi-ərzü səma bil adəmi.

Gözlərilə yıxdı şol gözlər məni,
Kirpik oxun gizlərü gözlər məni.
Gözünə netdim mən, ey arami-can,
Durmadan qaşına yavuzlar məni.

Qamətin qəddi qiyamət eylədi,
Gör bu qəddi ki, nə qamət eylədi.
Kə'bədə hər dəm iqamət eylədi,
Gözlərin ana imamət eylədi.

Kim əliftək vahidü fərd olmadı,
Bəlkə namərd olduvü mərd olmadı,.
Həq yolunda hər ki, ol gərd olmadı,
Döydüyü cüz ahəni-sərd olmadı.

Görmüşəm hər yerdə həqqi-mütləqi,
Gər deyilsən laşə itirmə həqi.
Kim ki, həqqi bilmədi, oldu şəqi,
Gör ki, tufan oldu istə zövrəqi.

Firqətin dərdi mana kar eylədi,
Canımı yandırdı, əfkar eylədi.
Gəl ki, şövqün halımı zar eylədi,
Aləmi sənsiz mana dar eylədi.

Qaf vəl-Qur'an ol mahın üzü,
Görməsin yavuz göz ol şahın üzü,
Fani olmaz hərgiz Allahın üzü,
Halik olsun divi-gümrahın üzü.

Kaf ilə nundan yaratdı aləmi,
Ərbəin gündə yoğurmuş Adəmi.
Dəm bu dəmdir, dəm bu dəm, bil bu dəmi,
Adəmə vurdu bu dəmdən həq dəmi.

Qandasan, ey yürəgimi yarıcı,
Qanda olsan Tanrı sana yarıcı.
Mən qulam, hər dəm tapuna varıcı,
Üz urub, qılıb dua yalvarıcı.

Könlüm oldu eşqinin avarəsi,
Qəmzənin getməz cigərdən yarəsi.
Dərdimə çox istədim dərman, vəli
Yox imiş lə'lindən özgə çarəsi.

Kirpiyin qaşınla zülfündür yedi,
Yer yedivü göy yedi, sən də yedi.
Nə səbəbdən həftənin adı yedi,
Bunda hikmət vardır, müshəf yedi.

Kim ki, əsrari-Nəsimi bilmədi,
İzzəti-fəzli-Nə'imi bilmədi,
Divi-dun oldu, əzimi bilmədi,
Məzhəri-zati-qədimi bilmədi.

Hər səhər vaxtında kim, bülbül fəğanın başlar,
Ahım artar şöylə kim, axar gözümdən yaşlar.

Gör necə fəryad edər biçarə bülbül dərd ilən
Kim, anın fəryadına əfğana gəldi daşlar.

Hər firiştəsurətin yanında yüz min div olur,
Xanda kim, qəllaş olursa, çox olur qulmaşlar.

Barəkəllah, dəsti-qüdrət töhfə yazmış nəqşini,
Afərin şol nəqşə kim, aciz qalır nəqqaşlar.

Bilməzəm zülfünmüdür hər tarəsini dam edən,
Yoxsa cana qəsd edən gözünmüdür, ya qaşlar.

Könlümün şişəsinə pərri məgəs dəgsə sınar,
Ey həbibim, bəs nədəndir sən atarsan daşlar?

Xanda kim, Leyli olursa anda bir Məcnun olur,
Xanda kim, bir gənc açılsa, anda itər başlar.

Tərki-can qıldı Nəsimi, keçdi bu başdan dəxi,
Xanda qaldı ata-ana, qövm ilə qardaşlar?

Cana sən candan nə kim, gəlsə, cigərlər ağrımaz
Həq bilir, bir zərrə nəştərdən damarlar ağrımaz.

Şaha, mehrindənmidir, ya aşinalıqdanmıdır,
Cismimi sər ta qədəm min gəz yararlar, ağrımaz.

Fitvasından zahidin nahəq məni gər soyalar,
Qəm degil səndən şəha görcək damarlar ağrımaz.

Zahidin əfsanəsindən soydular nahaq məni,
Həq bilir səndən, şəha, sahib nəzərlər ağrımaz.

Şişəmi çün daşa çaldım, həqqi izhar eylədim,
Çeşmi-əhvəl ağrıdan arif bəsərlər ağrımaz.

Zahidin bir barmağın kəssən dönər həqdən qaçar,
Gör bu gerçək aşiqi sər-pa soyarlar ağrımaz.

Cəhli-namərdin qaçan meydan günündə yeri var,
Ər bilir meydan qədrin kim, qədərlər ağrımaz.

Soyun, ey murdar sallaxlar, Nəsiminin tənin,
Bunca namərdi görün bir ər qıyarlar, ağrımaz.
308

Əhli-iman usları ol dəmdə inkar etdilər,
Çün Hüseyniyi Hələb şəhrində bər-dar etdilər.

Qazilər fitva verib həq sözə batil dedilər,
Küfrü tərk edib imana gəlməyə ar etdilər.

Seyyidə zülm eyləyib cövr ilə həqqi basdılar,
Əhsəni-təqvimi gör kim, necə inkar etdilər.

Biliyib bıçaqların çünki tənimə qoydular,
Sağ ikən mən aşiqi gör necə bimar etdilər.

Həq mənə söylə dedi, əmr etdi, mən də söylədim,
Sözümü dastan edib aləmdə təkrar etdilər.

Üzdülər, çıxardılar çün bu Hüseyninin tənin,
Yas qurub göydə mələklər cümləsi zar etdilər.

Ey Nəsimi, vasil oldun xaliqın rəhmətinə,
Cənnəti-ə'layı buldun, yerni gülzar etdilər.

Şaha, səndən hər nə gəlsə cana xoşdur, yaxşıdır,
Cavidani-eşq üçün canana xoşdur, yaxşıdır.

Hər nə cövr etsən mana səndən könül xoşnud olar,
Həq bilir kim, inciməz fərmana xoşdur, yaxşıdır.

Soydular çıxardılar, başdan ayağa pustumu,
Aşiqəm, ah eyləmən qurbana xoşdur, yaxşıdır.

Həm soyan, həm soyduran zahid mənəm, səndən deyil,
Cümlədə ayinəyəm pünhana xoşdur, yaxşıdır.

Mənsur oldum çün bu gün aləmdə faş oldum sizə,
Mən ənəlhəq söylərəm ürfana xoşdur, yaxşıdır.

Şah yolunda eşq ilən baş verməyən mərdud olur,
Lacərəm, meydan əri mərdana xoşdur, yaxşıdır.

Tə’nə qılma ey fəqih, zira Nəsimi fəzlinə,
Netəkim, aşiqlərə nişana xoşdur, yaxşıdır.

Könül, xəstə vü mən zaram səninçün
Rəvan məcruhü bimaram səninçün.

Əlac eylə, əlindən vardım, ey dust,
Qəmim yegil ki, qəmxaram səninçün.

Nə oldu əzmi-mehmanxanə qılsan,
Ürək yağını yaxaram səninçün.

Əridi iliyim, sındı sümüyüm
Tənimdən can gedər, yarım, səninçün.

Əzəldən bu mənə qismət qalıbdır
Ki, hicr oduna yanaram səninçün.

Çü bülbül düşübəm gülşəndən ayrı,
Yenə həmsöhbəti-xaram səninçün.

Sənin eşqin məni məndən alıbdır,
Tənimdən külli-bizaram səninçün.

Nəsimini soyarlar Şam içində,
Fəğan eylər, giriftaram səninçün.

Qiblədir üzün, nigara, qaşların mehrablar,
Surətin müshəf, vəli mişkin xətin e'rablar.

Çöhrənin əksi əzəldən dışra çıxdı pərdədən,
Düşdü anın şö'ləsindən ayü günə tablar.

Aşiqin əhvalını aşiqlərə sor kim, bilir,
Bilməz illa eşq oduna yanmayan bixablar.

Eşq odu uğraşdı şəm'in canına, gör kim necə
Həm yanar, həm gözlərindən axıdar seylablar.

Şərh əgər qılsam camalın dəftərindən bir vərəq,
Hər sözüm min fəsl olur, hər fəsl yüz min bablar.

Aşiqin cigər qanından şərbəti var, ey həkim,
Qatma anın şəkkərinə qənd ilə innablar.

Çün Nəsimi cavidani yar ilə buldu vüsal,
Qoy necə dönərsə dönsün bu yaşıl dolablar.

Gözlərindən çağrışırlar, dadlar, bidadlar,
Tiğə dutdu kirpigin puladlar cəlladlar.

Dilbərin bilişlərindən sorgil eşqim xarını,
Aşina bilməz bu halı, xanda bilsin yadlar?

Kim ki, eşqin vəsfini ögrənməgə şagird ola?
Qoydular adın anın ustadlar, ustadlar.

Dabanımdan yardılar başdan ayağa soydular,[1]
Almadılar dadımı bidadlar, Şəddadlar.

Çün bıçaq ürəgə yetdi cigərim dərd eylədi,
Ağladı canım qamu fəryadlar, fəryadlar.

Həqqə vasilsən, Nəsimi, bigümanü şübhəsiz,
Binəhayət dini açdın gör qamu əfradlar.

---

1 Aşağıdakı beyt əlavədir:
Çün dilərdi vasil olmaq yar ilən könlüm, vəli,
Qoy necə soyursa soysunlar pəlid qəssablar.

İbtidadır, ibtidadır, ibtida,
İbtidadan hasil oldu intəha.

İbtida gəldi kəlami-layənam,
Favü zadü lam həqdən, vəssalam.

Nitqi-əşya natiqi-həqdir özü,
Söyləyən kənduyə kəndudur sözü.

Söz olubdur kəndu söz söylər əyan,
Kəndu kəndu zatını eylər bəyan.

Hər sifətdən xali etmiş kəndözün,
Kəndu kəndu üzünə tutmuş üzün.

Hər nəyə qılsan nəzər ol bigüman,
Kəndu kəndözün verir sana nişan.

Uş bu bərrü bəhr içində kəndidür,
Yə’ni əsdaf oldu hər şey, kəndi dürr.

Aləmü əşya anın hökmündədir,
Oxu bilgil anı kim nitqindədir.

Bu sifətlər intəhası kəndidür,
Yə’ni bu şəhrin əsası kəndidür.

Uşbu şəhr içində olmuşdur müqim,
Yoludur anın siratəl-müstəqim.

Bu səbilüllaha hər kim buldu yol,
Anların hacətləri oldu qəbul.

Bu sirat üzrə übur etmək gərək,
Bu siratı tutuban getmək gərək.

Bu sirat üzrə qədim imiş qədim,
Girəməz bu şəhrə şeytanir-rəcim.

Neyləsin, bilməz o şəhrin yolunu,
Anlamaz ol əhli-cənnət dilini.

Dili var sanır və leykin, dili yox,
Bir məgəsdir zəhri vardır, balı yox.

Acizü miskinü sərgərdan durar,
Özü heyvan, surəti insan durar.

Hər kimin kim, zərqi var, iqrarı yox,
Bir ağacdır kim, dikilmiş, barı yox.

Mö'münün könlün yıxar xənnas ilə,
Yə'ni salusluq satar vəsvas ilə.

Cümlənin sirrini ol xaliq bilir,
Din yolunu aşiqi-sadiq bilir.

Zahidi-zərraq olanlar xam olur,
Aqibət salus olan bədnam olur.

Kim ki, sənə daş atarsa, gül ona,
Şad oluban sevinib gülgül ona.

Fe'lü əf'alı qamu zərqü riya,
Zərq ilə qul olmaq istər tanrıya.

Zərq ilə qulam deyənlər qul deyil,
Əhli-zərqin taəti məqbul deyil.

Çünki zərqin ola ismü fe'li zərq,
Aləmi bilqüvvədən algil səbəq.

Qüvvəti-can ol, dilərsən qüvvətin,
Vəslə vasil ol, yetirgil firqətin.

Gər dilərsən kim, olasan mö'təbər,
Kəndu mülkün sirlərindən al xəbər.

Gəl vücudun şəhrinə etgil nəzər,
Vaqif ol, özündən olma bixəbər.

Ey kəlami-zati-biçundan nişan
Bulayın deyən kişi, eşit bəyan:

Gəl bu şəhr içində gör didarını,
Gəl bu şəhr içində istə yarını.

Cismə can ol, cismə can ol, cismə can,
Necə uyarsan bəri gəl, bir oyan.

Həqqi istərsən səgirdib dörd yana,
Kimə gedərsən, sana gəl, sən sana.

Sən sana gəl, sən, sana həq yar ola,
İstədigin cümlə səndə var ola.

Axirətdə mənzili darüssəlam,
Bulayım dersən sana gəl, vəssəlam.

Səndədir şol gənci-pünhan, səndə var,
Qətrəsən ki, bəhri-ümman səndə var.

Aç bu ibrət gözünü kim, görəsən,
Kəndu şəhrin içrə yarın bulasan.

Biləsən bu varlığın ərkanını,
Biləsən canlar içində canını.

Biləsən hər şeydəki var varını,
Can gözilə görəsən didarını.

Hər ki, kəndu zatının sultanına
İrmədi, girməz bu şəhrin kanına.

Kəndu mülkündən iraq avarədir,
Qeyrəti yox, neyləsin biçarədir.

Bilmədi çün kəndu kəndu zatını,
Anın üçün oxumaz ayatını.

Fəth edən bu şəhriyarın şəhrini,
İşlədi, bildi gümansız dəhrini.

Çün bu şəhrin yarına yar oldu ol,
Hər nə məqsudisə andan buldu yol.

Çünki yar oldu bu şəhrin yarına,
Hökmün etdi mülkü malü varına.

Bilmək istərsən bu şəhrin varını,
Gəl eşit gör necə söylər yarını.

Anla uşbu sirri kim, söylər sana,
Yol bulasan kəndu kəndundan yana.

Hər yaradılmışın əsli sən özün,
Anlar isən rəmzini uşbu sözün…

Əlləməl əsmai-küll budur tamam,
Adəmə öyrətdi həq, bil, vəssalam.

Ey bəradər, bil bu nitqin qayətin,
Lamü bey görgil, yetərgil firqətin.

Məqsədi-sidqim lisani-sadiqin
Aşiqiyəm mə’şuqü hər aşiqin.

Mənə irişən kişilər can olur,
Küfrü qalmaz, kəndusu iman olur.

Nuri-əşya çün mənəm eynül-yəqin,
Mənə irən oldu əshabül-yəmin.

Gənciyəm, gənc issinin mən gənciyəm,
Dərdi bidərmanların birənciyəm.

Sadiqülvə’di-mübindir sözlərim,
Görünür əşya üzündə gözlərim.

Eyniyəm, hər əhli-eynin eyniyəm,
Münkirin könlü içində beyniyəm.

Nitqü zatımdan əyan oldu cahan,
Sözlərimdən kafü nundur laməkan.

Şəhri-qan içində canlar canıyam,
Kainatın təxtinin sultanıyam.

Yeddi iqlimə məkanam laməkan,
Olmuşam çün cümlə şeydə bigüman.

Məzhərəm, yoxdur şərikim, laşərik,
Vahidəm, mülkümdə yoxdur müştərik.

Nuri-dəryayi-vücudi-mütləqəm,
Gah məllahi-cahan gah zövrəqəm.

Heyyü qəyyumü dəvamü dövlətəm,
Aləmi-kəsrət içində vəhdətəm.

Gər dilərsən kim, bulasan sən səni,
Mənliyindən keçü tərk eylə məni.

Mənliyindən keçməyən şeytan olur,
Divi-mə’lundur, qaçan insan olur?

Zöhdlə şeytan qaçan ola mələk,
Əsli oddur, çün oda vasil gərək.

Mənliyindən keçməyən xudbin olur,
Müstəhəqqi-lə'nətü bidin olur.

Dedi əsfəllər məqamıdır dərək,
Hirsü lə'nətdən düşüb ola hələk.

Nəfsini tanıya gör, ey müttəqi,
Kimsəyə tə'n etmə, əbsəm, ey fəqi.

Tabeyi-əfsanə olmuş tə'n edər,
Bixəbərdir, bixəbərdir, bixəbər.

Tabeyi-nəfs həvayi-şum edər,
Bu səbəbdən özünü məsmum edər.

Bilmədi məscudu kimdir sacidin,
Görmədi nurun vücudi-vahidin.

Nurikən nar oldu çünkim, ol ləin,
Oxu lə'nət canına, ey əhli-din.

Ey deyən ki, qandadır yari-bəqa,
Eşq ilə gəl, bax vücudi-mütləqa.

Gəl, bu ibrət mülkünə gir, abid ol,
Yollarında can ilə sən sacid ol.

Gər dilərsən k'əhli-irfan olasan
Kim, vücudün şəhrinə yol bulasan.

Gəl, xəbərdar ol bu şəhrin varına,
Zülmətin tanıvü gir ənvarına.

Yollarından al xəbər, sən ey xəbir,
Olasan mülki-vücud içrə əmir.

Gəl bəri, fəth et bu şəhri, gəl bəri,
Necə gəzərsən cahanda sərsəri.

Vəsfini eşit bu şəhrin şəhrinə,
Qərq olasan mütləq anın bəhrinə.

Gəl bu şəhrin sözlərinə dut qulaq,
Ta biləsən kim, nədir bu qara-ağ.

Dörd dirəklə qaim olmuşdur bu şəhr
Kim, anın içindədir afağü dəhr.

Kim ki, bildi mən-ərəfdə zatını,
Baxdı, gördü, oxudu ayatını.

Hər nə istərsən bulasan bunda gəl,
İstədigin anda degil, bunda gəl.

Otuz iki mənzili var ilinin,
Yetmiş üç dürlü məqamı yolunun.

Bu məqamı həq bilən hacı bilir,
Bu kəlamı firqeyi-naci bilir.

Üç yüz altmış mənzili var surunun,
Bu təcəlli şəhri Musa Turunun.

Dedigüm şəhrin şu dənlü bürcü var
Ki, sığar hər bürcünə yüz min süvar.

Pasibanı bürcünün, ey pasiban,
Oldu yigirmi səkiz kişi haman.

Bunların avazına, avazələr,
Dopdoludur şəhr içi dərvazələr.

Oldu yetmiş yeddi şəhrin ləşkəri,
Padşahın əmridir, bil bunları.

Həq-təalanın sifatıdır bular,
Kəndunun nitqində zatıdır bular.

Yə'ni bu otuz iki kişidən,
Oyanır bunların ünün eşidən.

Qəflət uyğusundan bidar olar,
Həqqi tanır, həq anınla yar olar.

Həq kəlamıdır buların dilləri,
Hər nəyə sunsa irişir əlləri.

Nitqi-heyyi-zati-yəzdandır bular,
Nuri-ərşü vəchi-rəhmandır bular.

Müxtəlif olmuş buların surəti,
Aləmi-mə'nidə birdir sirəti.

Surəti kəsrətlə olmuş müxtəlif,
Cümləsinin zatı birdir çün əlif.

Bir-birindən bunları hər kim seçər,
Bunların sirrindən oldur bixəbər.

Tulü ərz olmaz bularda rəngü lövn,
Əsfəlü ə'la, əmiqü həddü kövn.

Bişəbihü laşərik olmuş bular,
Zahirü batində hər şey kəndular.

Heyyi-baqidir buların varlığı,
Yox buların sayruluğu, sağlığı.

Bunlar oldu cümlə şeydə müştərək,
Həm münəzzehdir, bularda yox dərək.

Həm sifətdə zati-qaimdir bular,
Ölməz-itməz nitqi-daimdir bular.

Qadiri-qəhhari-Mehdi möhtədi,
Fel'i-müstəqbəlü mazi, mübtədi.

Cümlə bunlardır bil, ey danayi-din,
Bunlar oldu rəhmətən-lilaləmin.

Cümlə aləm çün buların hökmünə
Oldu məhküm, gör buların hökmü nə.

Saətü vəqtü hesabü mahü sal,
Gecə-gündüz nuri-xurşidü zülal.

Çərxi-əflakü səmavatü zəmin
Bunların mülküdür, ey əhli-yəqin.

Əmri-həqdir çün bular, ey əmri-həq,
Gəl buların dəftərindən al səbəq.

Oxu bulardan, bəri gəl, quş dilin,
Həll edəsən ta ki, nəfsin müşkilin.

Bunlara derlər, şəha, ümmül-kitab,
Fe'lü əşyaya bulardır fəthi-bab.

Hər yana baxsan bulardır görülən,
Bəlkə hər şeydə bulardır əm olan.

Bunların hökmündə hər şey, bunların,
Canıdır sərcümleyi-mö'münlərin.

Müshəfi-nuri-qədimi-ləmyəzəl,
Xətti-məsturi-kitabi-bibədəl.

Lövhi-məhfuzi-hürufi-zülcəlal,
Rəqqi-mənşuri-xudayi-pürkəmal.

Dəftəri-mülki-vücudi-ənvəri,
Naziri-aləm, cahanın sərvəri.

Bunlar oldu cümlə dilin söyləyən,
Söyləyib həm söylədən, var din deyən.

Əvvəlin və axırın bunlar olur,
Bunları bilən kişi həqqi bulur.

Kafü nuna, eyni-zata ibtida,
Həmsifət olur bular biintəha.

Cümlə bunlar qəbzi bəstində haman,
Dərc olubdur, bu sözə yoxdur güman.

Gəl buları istə, sə'yə qalib ol,
Bülfüzul olma, həqə gəl talib ol.

Gəl buları istə bul, ey mərdi-rah
Kim, bular olur sana həqdən güvah.

Bunlarınla irəsən məqsuduna,
Abid ol bunlara, ir mə'buduna.

Bunları bilmək dilərsən bunları,
Əhmədi-mürsəldən istəgil yeri.

Yə'ni otuz iki min peyğəmbərin,
Dillərini anlağıl sən bunların.

Ta ki, iltələr səni ol həzrətə,
Nura qərq olub, batasan rəhmətə.

İşbu mənzildən irənlər tapuya,
Dəxi möhtac olmaz özgə qapuya.

İstəyən şəhri-vücudi-Əhmədi,
Gəl, eşit dari-diyari-sərmədi.

Yeddi olmuşdur bu şəhrin qapusu,
On səkiz olmuş təmamət yapusu.

Əhmədin şəhri, qapusu yeddidir,
Gər inanmazsan hədisi iştə gör.

Yeddidir nuri-səmavatü zəmin,
Yeddidir, hər talibə degil həmin.

Hər qapu altında ikidir mələk,
Bunlarınla yar olun, budur dilək.

Hər eşigində müqim olmuş bular,
Bunlarınla yar olan kişi gülər.

Bu rümuza irişənlər can olar,
Dərvişikən məhrəmi-sultan olar.

Bunların nitqində əşya sərbəsər,
Qərq olubdur, anlamaz hər bixəbər.

Nitqi-həqdir çün buların sözləri,
Vəhyü bürhandır təmamət özləri.

Bunların dilin bilənlər adəmi,
Adəm oldur kim, bilibdir bu dəmi.

Aşikara etdi əsma sirrini,
Söylədi can müshəfin təfsirini.

Sahibi-tə’vil həqdir bigüman,
Leylətül-əsra, rümuzi-cavidan.

Zülmət içrə qalmış idi kainat,
Dolmuş idi cümlə aləm müşkilat.

Divi-məl’un dutmuş idi aləmi,
Cümlə div idi, yox idi adəmi.

Gəldi, adəm nurunu şərh eylədi,
Odü su, torpağü yeldən söylədi.

Adəmin sirrin bilənlər, adəmin,
Bildi rəmzin on səkiz min aləmin.

Nəfxi-Isa ölü dirildir haman,
Adəmin sirridir ol sahibzaman.

Mehdiyi-nuri-hidayətdir yəqin,
Məhrəmi-nuri-inayətdir yəqin.

Sümmi-vəchüllaha edənlər nəzər,
Uşbu üzün eynidir, ey pürhünər.

Künzi-əşya mənbəi-candır özü,
Eyni eyn olur görənlər ol üzü.

Görər ol üz içrə üzlər üzünü,
Nitqü can içində gözlər özünü.

Nitqi-can olur tamam, ey nitqi-can,
Küfrü gedər, kəndu nur olur haman.

Ey Nəsimi, həq-təala səndədir,
Həm sifatı dildə, zatı candədir.

Kim ki, bildi kənduyu, bildi həqi,
Bilməyənlər nəfsini oldu şəqi.

İstədigin kənduda bular tamam,
Padişah olar, ana əşya qulam.

Əla, ey dürri-bəhri-laməkanım,
Əla, ey lə'li-kani-kün-fəkanım.

Oxuyum, dinlə sən ənfüs kitabın,
Hədisi bəs səhihdir oxuyanım.

Ki, hər nə var isə afaq içində
Var ol ənfüsdə, yoxdur imtəhanım.

Hürufi-əql imiş bu məstər əşya,
Yazılmış nüsxeyi-iki cahanım.

Buyurdu Şahi-mərdan şiri-yəzdan:
Özün biləni yarılğar uğanım.

Tanıyan nəfsini tanır xudasın,
Dəxi yarlıq edər şahi-zamanım.

Qəza ilə qədərdir fe'li-niyyət,
Xirəddir ərşi-kürsi, lövhi-canım.

On iki bürc ilə yeddi kəvakib
Olur başdan ayaq bu yeddi sanım.

Büruc içrə əyaq Hutü Həməl – baş,
Qəmər həm övkədir, bürcü zəbanım.

Ütarid təb'imiz, böyrək bu Zöhrə,
Ürəkdir şəmsü xurşidi-təbanım.

Dalaq oldu Zühəl, Mərrix həm öd,
Bağırsaq Müştəri, göbək Mizanım.

Boyum – Suvü qolum – Cövza bilirmən,
Bu sözdə yoxdurur zərrə gümanım.

Sümük – torpaq, diş yeldir, sinir – yer,
Olur od, qanü ət abi-rəvanım.

Vücudda bəlğəmü sevdavü səfra
Qılır qələbə olur, sərçeşmə canım.

Əsəd köksümdürür, əmcək Sərətan,
Bağırsağ Sünbülə, göbək Mizanım.

Solum Məğrib, sağım Məşriq, yəmin – ön,
Baş üstün, sol yasar üstdən dabanım.

Könülün qütbüdür gərdunda gərdan,
Görünər arxadakı kəhkəşanım.

Məsəldə təb'imizdir yeddi qat yer,
Ağaclar tük olur, dağ üstüxanım.

Əl-ayaqdır qamu işlərdə kamil,
Qulaq naibdürür, göz didəbanım.

Fələkdir atamız, ğübra anamız,
Qamu əşya bəradər mehribanım.

Təvarix bəyyinat, gərdiş təvəqqüf
Olur bir nöqtədir, ey nüktədanım.

Qaranqu qayğıdan, şadlıq işıqdan
Olur batin nihan, zahir əyanım.

Yenə dırnağü dişlər oldu mə'dən,
Sümüklərdə iliklər oldu kanım.

Vücudum dörd fəsil oldu ənasir,
Bulud öfgə, yaşım yağmur yağanım.

Buludun kükrəgi olsa yaşımdan,
Çaxılmış bərq urar rə'di-fəğanım.

Xəyalın nəqşidir cümləsi təzvir,
Yavuzluq, əyrilik, gümrah gümanım.

Təvəhhüm Əzrail, fəhmim Mikail
Ki, Israfildürür niqti-zəbanım.

Xirəddir Cəbrail, Mürsəl dilimiz,
Könül içrə durar razi-nihanım.

Olubdur yeddi iqlim, yeddi ə'za,
Könül təxti dəxidir eşqi-şanım.

Olur pərhiz arı taət xudaya
Bulubdur xəlvəti üzlət rəvanım.

On iki ay dolar, bir il tükənər
Olur əbcəd bu sinü şin nişanım.

Müfəssəl surət oldu zati-mücməl
Süfati-zat imiş cismimlə canım.

Qaranğu qayğıdan, uyğu ədəmdən,
Bilik uçmağımış, damu nadanım.

Müləvvəslər, cəhillər divü şeytan,
Ariflərdir mələk əhli-imanım.

Savaşməklik, dalaşməklik, irişmək
Qamu itlikdürür, adəm-nişanım.

Təvazö' adamü qaplan təkəbbür,
Qəzəblənmək dəxi edər ilanım.

Həsəd tutmaq donuz, ayı sifətdir
Qarınca hirslərim, kinə çayanım.

Sığırlıq çox yemək, şəhvət eşəklik,
Yavuz xu qurd, tilki hiylə qılanım.

Qarılıq qış, yaz oldu igidlik,
Tifillik yay imiş, kəhl cavanım.

Vücudum şəhrinin cəlladı dişdir,
Nə ki loğma sunar çeynər dəhanım.

Əzəl əvvəl əbəd payanı axır
Cəsəd əsğər, cahan əkbər rəvanım.

Xəbər bulmuş Seyid aydar ərəfnak,
Olarındır dilimdə tərcümanım.

Xuda, saxla Nəsimini sirr içrə,
Fələk fanidürür, baqi uğanım.

Gəl bu dəmi xoş görəlim, ol keçən dəm dəm degil,
Kim bu dəm qədrini bilməz eylə bil adəm degil.

Qafil olma dəm uzat vermə dəmi özgə dəmə,
Ol keçən dəmdən nə hasil, çün bizə həmdəm degil.

Adəm isən dəm bu dəmdir qoyma bu dəm fövt ola,
Hasili-ömri-cavani bil ki, cüz bir dəm degil.

Bu dəm ol dəmdir, Məhəmməd seyri-me'rac eylədi,
Gəl qənimət gör bu dəmni kim, bu dəm ol dəm degil.

Yar ilən həmdəm olanlar heç dəm urmaz özgəyə,
Talibi-yar olmayanlar dünyaya məhrəm degil.

Dünyaya arxa dutursan malü mülkü dövlətə,
Bibəqa, bünyadı yoxdur, ol qədər möhkəm degil.

Zahidü rə'na yügüşdür Şibliyi-zünnun imiş,
Adı İbrahim çoxdur, nedəyim Ədhəm degil.

Dəm keçərmi kim, Nəsimi, ol fəraqü dərd ilə
Nalişin əflaka çıxmaz, göz yaşı Zəmzəm degil.

Ey rüxün, rəngi-üzarın çün bəqəm qatında nil,
Ol camalın vəsfidir fikrim, zəhi fikri-cəmil.

Canımı vəqf eylədim şol arizin uçmağına,
Ta mənim qanım sana çün səlsəbil oldu səbil.

Arizin nurunda görmüşdür müənbər xalını,
Şol səbəbdən bitəkəllüf nara düşmüşdür Xəlil.

Şəm'i-rüxsarın mənim də'vimə tanıqdır bu gün,
Hacəti höccət deyil, hər qanda rövşəndir dəlil.

Ol kitabın kim, bu əql anın rümuzun bilmədi,
Qəmzeyi-qəmmazın öyrətdi mana biqalü qil.

Çün bərabərdir müdam zülfü üzarın şivəsi,
Bəs neçün cövrün kəsir oldu vü ehsanın qəlil?

Seyyidin şe'ri sənin vəsfində mö'cüzdür tamam,
Bilmənəm ruhülqüdüs tə'lim edər, ya Cəbrəil.

Bir əcaib söhbət oldu guşeyi-cənnətdə duş,
Qazi oldu cür'əgirü seyyid oldu cür'ənuş.

Duş ta vəxti-səhər içdik mey əz cami-səfa,
Göydəki cümlə məlaiklər çağırdı nuş, nuş!

Həm şəriət, həm təriqət, həm həqiqət, mə'rifət
Verdilər fitva bizə dər-mə'niyi-həlqəbəguş.

Arifin sormaz hesabın ol kərimi-ləmyəzəl,
Bu cəhətdən münfəildir, sufiyi-pəşminəpuş.

Bu Nəsiminin irişməz kimsə qövlü fe'linə,
Gah şeyxü abid olur, gahi piri-meyfüruş.

Ey dedigin cümlə yalan, qövlü qərarın yox imiş,
Çin xəbərin söyləmə kim, mişki-tatarın yox imiş.

Heç gündüz olmaz gecəsiz, heç fərəh olmaz nəş'əsiz,
Sən nə qış oldun ki, sənin tazə baharın yox imiş.

Ey könül, onun evi sən, səndə zühur eylədi həq,
Bəhri-mühit oldu adın, həddü kənarın yox imiş.

Səndə ara, istə səni, ta bulasan səndə səni,
Sən sana yar ol bul anı, sanma ki, yarın yox imiş.

Ey diləyin küllisi yar, istədiyin cümlə nigar,
Aşiq isən gər nə üçin əldə nigarın yox imiş?

Ey büti-maçinə tapan, Azər idin Nəmrud ilən,
Eşqə Xəliləm demə çün, gül kimi narın yox imiş.

Yüzü gözündür suyumuz, mai-məindir meyimiz,
Sən nə bilirsən bu meyi, çünki xumarın yox imiş.

Zahidü sufidir adın, gör nə acı oldu dadın,
Ey ulu ad istəməyən, qeyrətü arın yox imiş.

Buldu Nəsimi səni çün, necə ənəlhəq deməsin,
Ey bu sözə münkir olan, dövlətü darın yox imiş.

Zülfü qaşından bəyani-sirri-pünhan oldu faş,
Həq-təalanın kəlamı vəchi-insan oldu faş.

Ey fəqihi-bitəharət, sor bu gün mai təhur,
Gəl təharət qıl bu gün, kim Fəzli-yəzdan oldu faş.

Rəhmətən lilaləminsən oldu vəchin layəmut,
Ey bilən bu vəchi həq, islamü iman oldu faş.

Gər başın top istər isən gəl bu gün meydana gir,
Zülfü xalından anın gör topü çövkan oldu faş.

Kə’bədir çün vəchi-xuban, beyti-həqdir Kə’bə gör,
Küntə kənzən oldu əyan sirri canan oldu faş.

Müshəfi-həqdir imamı – cümlə əşya sərbəsər,
Gör imam oldu əyanü fəzli-sübhan oldu faş.

Qamu əşya suri-Israfildən uş natiq gərək,
Ey yəqin əhli, bu gün nitqi-Süleyman oldu faş.

Çün Nəsimidir bu gün Qur’ani-natiq Fəzl ilə
Sirri-yəzdan, nuri-sübhan, qövli-Qur’an oldu faş.

Mənəm ol tilismi-pünhan ki, bu gün cahana gəldim,
Əzəli nişansız idim, əbədi nişana gəldim.

Bu tilismi çünki açdım zülümata nur saçdım,
Bu neçə məkanı keçdim ki, bu cismü cana gəldim.

Oxudum bu ismi-ə'zəm ki, vücuda gəldi aləm;
Qoyun adımı siz adəm ki, bu gün cahana gəldim.

Görünən mənim üzümdür, gözədən mənim gözümdür,
Dil edən mənim sözümdür, mənəm uş lisana gəldim.

Qamu yerlərə bulundum, qamu sözlərə bilindim,
Qamu pərdədə çalındım, bu ulu bəyana gəldim.

Nə kişidürür Şirazi ki, bəyan edə bu razı,
Düzübən bu sözü sazı, mənəm uş zəbana gəldim.

Dedi seyyidi-Nəsimi, nə zəri sevər nə simi,
Əbədi sevdim Nəimi, hurilə cinana gəldim.

# İZAHLAR

**Abaum və ümmühatün** – "Atalar, Analar". Şərqdə ədəbi və fəlsəfi əsərlərdə aba (atalar) dedikdə yeddi səyyarə: Günəş, Ay, Merkuri, Mars, Venera, Saturn və Yupiter nəzərdə tutulur. Bu səyyarələrə ərəbcə gah "abasəb'ə" (yeddi ata), gah da "aba'i-ülvi" (yüksəkdə, göylərdə olan atalar) dedikləri kimi, "ümmühat" – (analar) ifadəsi ilə də dörd ünsürü – od, su, hava, torpağı nəzərdə tuturdular. Bunlara "ümmühatü-ərbəə" – (dörd ana), bəzən də "ümmühati-süfli" (alçaqda, yer kürəsində olan analar) adı vermişlər.

Nəsimi də yuxarıda göstərilən ərəb ifadələrindən həmin planetləri və dörd ünsürü nəzərə alaraq insanı onların nəticəsi və məhsulu hesab edir və deyir:

"Ey insan, şübhə yoxdur ki, yeddi planetin və dörd ünsürün nəticəsi sənsən. Kainatın yaradılmasında məqsəd sən olmusan".

**Abidi-əsnamü lat** – "Bütlərə ibadət edən".

**Adə kəl urcuni** – "Qurumuş xurma ağacı budağına döndü".

Nəsimi bu ifadəni Quranın 36-cı surəsinin 39-cu ayəsindən götürmüşdür.

Orada yazılır: "Ay üçün mənzillər (düşərgələr) təyin etdik; ta ki o, qurumuş xurma ağacı budağına çevrildi".

Məlum olduğu kimi, yaş və cavan budaq ağacdan qopub yerə düşdükdən və gün qabağında qalıb quruduqdan sonra əyilib yay kimi olur, ay da ayın axırı və yeni ayın əvvəllərində yay kimi görünür ki, bu zaman ona hilal deyilir.

Doğrudan da, quruyub əyilmiş budağa bənzəyir.

Nəsimi isə bu ifadənin insan qaşlarına (hilala bənzədiyinə görə) işarə olunduğunu tərənnüm edir. Həmçinin Nəsimi insanın qamətini əfsanəvi tuba ağacına, üzünü cənnətə, gözlərini (parlaq olduğuna görə) Qurandakı "Ənnəcm" (ulduz) surəsinə, sinəsini isə "Vəttur" (dağa and olsun) surəsinə oxşadaraq yazır:

"Boyu tuba, üzü cənnət, adə kəlurcün qaşı,
Gözləri vənnəcm, onun sinəsi vəttur idi".

**Aləmi-kübra və suğra** – "Böyük və kiçik aləm".

Orta əsr fəlsəfəsində kainat bütövlükdə böyük aləm, insan isə kiçik aləm adlandırılır.

**Aləmi-zat və sifat** – "Şəxsiyyət və xassələr aləmi" (Zat – şəxs, şəxsiyyət deməkdir. Sifat isə sifət sözünün cəmidir).

Nəsimi bu ifadəni aşağıdakı beytdə belə yazır:

Aləmi-zatü sifatəm, mənbəi-mövtü həyat,

Həm hisari-kün-fəkanəm, həm anun məhsuriyəm.

Yəni şəxsiyyət və sifətlər aləmi mənəm, dirilik və ölüm mənbəyi, bütün kainatın qalası, həm də bu qala içində hasarlanan mənəm.

**Alimül-qeyb** – "Qeybi bilən, gələcəkdən xəbər verən" (Allah nəzərdə tutulur).

**Aməntü billəzi xələqəl-leylə vən-nəharə** – "Gecə və gündüzü yaradana inandım".

**Amənna və səddəqna** – "Inandıq".

"Amənna" ifadəsi Quranın bir çox surələrində, o cümlədən 28-ci surənin 56-cı ayəsində və 29-cu surənin 42-ci ayəsində vardır. Quranın şərhçilərinə görə Allaha və Quranın ehkamlarına inanmaq, onu təsdiq etmək mənasında işlədilmişdir. Lakin Nəsimi insan gözəlliyini yüksəklərə qaldıraraq onu ilahi mərtəbəyə çıxarıb deyir: "Ey insan, sənin gözəlliyin misilsizdir. Sənə "amənna və səddəqna" demək daha yaxşı olar".

**Anəstunarə**n – "Odu gördüm". Ifadə Quranın 27-ci surənin 6-cı ayəsində ətraflı verilmiş və başqa surələrdə də bəzən bu əfsanəyə işarə edilir. Nəsimi bu ifadəni öz şeirlərində işlədərək, dini-əfsanəvi bir rəvayəti xatırladır.

Yəhudilərin peyğəmbəri Musa gəncliyində Misir hökmdarı Fironun sarayında yaşamış, bir nəfər qibtini öldürdüyü üçün cəzalanmaq qorxusundan Şam ölkəsinə qaçmağa məcbur olmuşdur. Orada Şüeyb adlı varlı bir qoca kişiyə

(Quranın yazdığına görə o da peyğəmbər imiş) on il çoban olur. Çoxlu sərvət toplayır və Şüeybin qızına evlənir. Sonralar qayınatasının yaşadığı Mədyən şəhərindən başqa yerə yola düşürlər. Gecənin bir vaxtı Musanın arvadını doğum sancısı tutur. Odları olmadığı üçün qaranlıqda qalırlar. Bu zaman Musa uzaqdan bir işıq gəldiyini görüb:

– Mən od gördüm, indicə sizə ya od, ya da bir xəbər gətirərəm, deyir.

Musa odun yanına çatdıqda görür ki, bir ağacdan nur parlayır. O, qorxusundan qayıdıb qaçmaq istədikdə ağacdan səs gəlir ki, "Ya Musa, qorxma.

Mən Allaham".

**Ayəti-Yöhyil Izamə** – "Sümükləri dirildər" ayəsi. Ifadəni Nəsimi Quranın 34-cü surəsi 76-cı ayədən iqtibas etmişdir. Quranda ayənin məzmunu belədir:

"Öz yaranmalarını unudan bizə misal gətirib deyir ki, "bu çürümüş sümükləri bir də kim dirildəcəkdir?" De ki, onları birinci dəfə yoxdan icad edən, yenə də dirildər. O, hər cür yaratmağı bacarır".

Bu ayədə din baxımından çox mürəkkəb və mühüm bir məsələyə toxunulmuşdur.

Məşhur orta əsr filoloqu Mahmud ibn Ömər Zəməxşəri və başqa

şərhçilərin verdiyi məlumata görə, islam dininin meydana gəlməsinin ilk dövrlərində Ubəyy ibn Xələf, Əbu Cəhl, Asi ibn Va'il və başqaları çürümüş bir sümüyü əllərinə götürüb Məhəmmədin yanına gələrək deyirlər: "Ey Məhəmməd, deyirsən ki, qiyamət günü olacaq və o gün ölülər yenidən diriləcəkdir.

Çürüyüb, torpaq olmuş bu sümüyü yenidən kim dirildə bilər?" Məhəmməd onlara cavab olaraq deyir: "Onları yox yerdən icad edən yenə diriIdər.

O, hər cür şeyi yaratmağa qabildir".

Beynə ma' və tin – "Palçıq ilə su arasında". Bu ifadəni Nəsimi dini hədisdən iqtibas etmişdir. Dini rəvayətə görə Məhəmməd demişdir:

– Adəm peyğəmbər palçıq ilə su arasında olarkən (yəni hələ yaranmazdan əvvəl) mən peyğəmbər idim.

**Beyti-mə'mur** – "Tikilmiş, abadlaşdırılmış ev". Bu ifadəni Nəsimi Quranın 52-ci surəsinin birinci sətrindən iqtibas etmişdir. Bu ifadənin dini mənası Kəbə evi deməkdir. Dini qanuna görə Kəbə əmin-amanlıq evidir, oraya daxil olan adamı döymək, öldürmək qadağandır. Ona görə də oraya "Darüssəlam" – əmin-amanlıq evi də deyilir.

**Beytül-həram** – Qoruq, qadağan olunmuş ev (Kə'bə). Dini mərasimə görə orada dünyəvi işlərlə məşğul olmaq qadağandır.

**Bəqa, darülxülud** – "Əbədiyyət evi" (o biri dünya)

Dini rəvayətlərdə o dünyaya "darülbəqa", "darülxülud" deyildiyi kimi, bu dünyaya da "darülfəna" (heçlik, fəna evi), "darülğürur", (lovğalıq evi) deyilir.

**Bəlhüm əzəllü** – "Bəlkə onlar daha da azğındırlar".

Bənəyna foqəkun səb'ən şidadən və cə'əlnaha siracən – "Sizin üzərinizdə yeddi möhkəm şey yaradaraq onları parlaq çıraq elədik".

Bu ifadə Quranın 78-ci surəsinin 10-11-ci ayələrindən götürülmüşdür.

Orada yerin, göyün, dağların, gecə-gündüzün və sairənin yaranmasından danışılır və yuxarıda göstərilən "yeddi möhkəm şey" də, ruhanilərin fikrincə, yeddi planetə (Günəş, Ay, Mars, Venera, Saturn, Merkuri, Yupiter) işarədir ki, onlar dünyanı parlaq çıraq kimi işıqlandırırlar.

Lakin Nəsiminin fikrincə yuxarıdakı ayədə göstərilən (yeddi möhkəm şey) insan üzündəki yeddi xəttə: qaşlar, kirpiklər və saça işarədir. Hürufilər insanın ana bətnindən gətirdiyi bu yeddi cərgə xəttə böyük əhəmiyyət verir və onu müqəddəs hesab edirlər.

**Bərat, qədr və əsra** – Bu isimlərin hər biri islam dinində bir əziz gecənin adıdır. Guya Bərat və Qədr gecələrində insanların hər birinin gələcək xoşbəxtlik və bədbəxtliyi təyin edilir. Əsra gecəsi isə guya Məhəmmədin

göylərə səyahət gecəsidir. Maraqlı burasıdır ki, bu gecələrdən hansı birinin hansı aya və ya hansı günə düşməsi göstərilmir.

**Cə'əlna** – "Təyin etdik, qərar verdik". Bu ifadəni Nəsimi Quranın 21-ci surəsinin 32-ci ayəsindən iqtibas etmişdir. Orada yazılır:

**"Və cə'əlna külle şey'in minəl ma'i həyyən**" – Hər şeyi sudan diriltdik.

Nəsimi həmin ayənin də insana, insan gözəlliyinə dəlalət etdiyini irəli sürüb deyir:

Cə'əlna sabit oldu kim, dodağın vəsfini söylər.
Kim oldu küllü-şey'in həyy dodağın eyni-abından.

Yəni, "ey insan, aydın olmuşdur ki, Qurandakı "cə'əlna küllə şey'in minəl ma'i həyyən" ayəsi sənin dodağının mədhini söyləyirmiş, çünki bütün əşya sənin dodağının çeşməsindən dirilmişdir".

Cəffəl qələm – "Qələm qurudu, söz bitdi, qurtardı".

İfadə ərəb atalar sözündən alınmışdır. Bir məsələ haqqında qəti qərara gəldikdən sonra bu ifadəni işlədirlər.

Düxan – "Duman, tüstü" deməkdir. Quranın 44-cü surəsində "duman" dan bəhs olunduğuna görə həmin surə bu ad ilə adlanır. Orada yazılır:

– "Müntəzir ol (gözlə, səbir elə), bir gün olacaqdır ki, göydə duman olacaq və bu duman xalqı bürüyəcək, bu ağır bir əzab-əziyyətdir". Ruhanilərin fikrincə Qurandakı bu ayə qiyamət gününə işarədir. Lakin Nəsimi qaralığına görə düxan (duman) sözünün insan saçına işarə olunduğunu iddia edir

**Əbşiru** – "Sevinin, şadlanın"

Əbşiru, dilbər götürmüşdür niqab,
Qəd nəcatum min şətatil inxirab.

Bu beytdə Nəsimi Allahın maddi cisimlərdə xəbər verməklə insanları fəlsəfi düşüncələrinə görə bir-birinə zidd olmaqdan çəkinməyə, vahid ideya, panteist fəlsəfəsi ətrafında birləşib dost olmağa çağırır.

**Əhli-yəmin** – "Sağ cərgəyə düzülənlər".

Bu ifadəni Nəsimi Quranın 56-cı surə 90-cı ayəsindən iqtibas etmişdir.

Orada deyilir:

"Sağ cərgə əhlindən olarsa, behişt əhlindən sənə salam".

Dini əfsanələrə görə guya qiyamət günü möminləri sağ cərgəyə düzüb behiştə, günahkarları isə sol cərgəyə düzərək, cəhənnəmə göndərəcəklər.

**Əhsəni-təqvim** – "Gözəl şəkilli".

Nəsimi bu ifadəni Quranın 95-ci surəsinin 2-ci ayəsindən iqtibas etmişdir.

Orada yazılır:

"Doğrudan da, biz insanı gözəl şəkilli yaratdıq".

Nəsimi bəzən "əhsəni-təqvim", bəzən də "əhsəni-surət" (gözəl şəkilli) deyərək ancaq insanı nəzərdə tutmuş və onun qarşısında diz çöküb, səcdə qılmağı tövsiyə etməklə bərabər, insanlara xor baxan, onu iradəsiz bir alət hesab edən fəqihləri, vaizləri, div, əzazil, şeytan adlandırmışdır.

Əhsəni-təqvimə çün qılmadı şeytan sücud,
Uyma ana, səcdə qıl, lə'n et anı, narə at!

Bu beytdə Nəsimi Quranın 2-ci surəsinin 34-cü ayəsindəki bir əfsanəyə işarə edir. Bütün mələklər Allahın əmri ilə Adəmə səcdə edir, ancaq İblis (şeytan) adlı mələk səcdədən boyun qaçırdığı üçün onu Allah lənətləyir.

**Əqbil, la təxəf** – "Qorxma, qabağa gəl".

İfadəni Nəsimi Quranın 28-ci surəsinin 35-ci ayəsindən iqtibas etmişdir.

Orada yazılır: Allah Musaya dedi: Əsanı yerə at! Musa əsasını yerə atdıqda gördü ki, o, canlılar kimi hərəkətə gəldi, Musa qorxusundan geri çəkildi, bu zaman Allah dedi: "Ey Musa, irəli gəl, qorxma, sən əmin-amanda olanlardansan". Burada Musa əfsanəsi haqqında danışılır. Həmin əfsanəyə və Quranın yazdığına görə Allah "Tur" dağında Musanı doqquz möcüzə ilə silahlandırıb, Misir hökmdarı Firona qarşı mübarizəyə göndərmişdi ki, o möcüzələrdən biri də bu imiş ki, onun əlindəki ağac (əsa) istədiyi vaxt əjdaha olarmış. Musa ilk dəfə əsasının əjdahaya çevrilməsini gördükdə qorxub qaçır, guya Allah ona deyir ki, ya Musa, qorxma irəli gedib əsanı götür, sən əminlərdənsən!

**Əla xulqin əzimin** – "Yüksək əxlaqa malik olmaq".

İfadəni Nəsimi Quranın 68-ci surəsinin 4-cü ayəsindən iqtibas etmişdir.

Orada yazılır: "Doğrudan da, sən yüksək əxlaqa maliksən". Quranın şərhçilərinin fikrincə, bu ayə ancaq Məhəmməd haqqında deyilmişdir və onun əxlaqı təriflənir.

Nəsiminin fikrincə, Qurandakı bu ayədə bütün insanların gözəlliyi, onun nəcib xüsusiyyətləri təriflənir.

**Əl bərdü ədüvvüd-din** – "Şaxta dinin düşmənidir".

Bu ifadəni Nəsimi ərəb xalq məsəllərindən götürmüşdür. Şair, dostdan ayrılıqda keçirdiyi günləri, qışın şaxtalı, gülsüz, çiçəksiz, tutqun havasına və dost görüşünü baharın güllü-çiçəkli, saf və səfalı havasına bənzədərək deyir:

Əgərçi firqətin qışdır ki, əl-bərdü ədüvvüd-din,
Həqqə minnət ki, vəslindən gül açıldı, bahar oldu.

Ə'ləstu birrəbbikum? Qalu bəla – "Mən sizi Yaradan deyiləmmi? Bəli, dedilər".

Nəsimi həmin ifadəni Quranın 7-ci surə 17-ci ayəsindən iqtibas etmişdir.

Burada da dini-əfsanəvi bir hadisəyə işarə olunur. Quranda bu əfsanəyə görə guya hələ insanların maddi bədənləri olmadan ruhları mövcud imiş və bu ruhları Allah bir yerə toplayaraq demişdir: “Sizin Tanrınız mən deyiləmmi?”

Həmin əfsanəyə görə orada ariflərin ruhu bu suala “bəli” deyə müsbət cavab vermişdilər. Ona görə də həmin yığıncağa birinci məclis – bəzmi-əzəl deyilir və guya bu məclisdə “bəli” deyən ariflərə ilahi məhəbbət badəsi içirdilmişdir.

Onlar maddi aləmə gəldikdə də həmin badənin təsiri nəticəsində bütün varlıqları ilahi eşq ilə doludur.

**Ələyna cəm’ühü, latühərrik** – “Onu toplamaq bizim öhdəmizdədir, sən yerindən də tərpənmə”. İfadəni Nəsimi Quranın 75-ci surəsinin, 14-cü ayəsindən iqtibas etmişdir. Orada deyilir:

“Quranı oxumağa tələsərək dilini tərpətmə! Doğrudan da, onu toplamaq və oxumaq bizim öhdəmizədir. Biz Quranı oxuduq, sən də onu oxumaq üçün bizi izlə! Sonra isə onu izah etmək bizim öhdəmizədir”. Quranın şərhçiləri yazır ki, guya ayələr göydən Məhəmmədə Cəbrail adlı mələk vasitəsilə gətirilən zaman hələ Cəbrail ayələri ona oxuyub qurtarmamış Məhəmməd yadından çıxmasın deyə o ayələri tez-tez oxumağa tələsərmiş. Ona görə də Məhəmmədə tapşırılır ki, tələsmə, onları sənin zehnində toplamaq, oxutmaq və izah etmək bizim öhdəmizədir”.

Lakin Nəsimi bu ifadəyə tamamilə başqa məna verir. O deyir: Quranın bütün ayələri – bizim üzümüzdə, insanın üzündə toplanıb və şərh olunmuşdur, başqa yerə getmə, günəşi izah etməyə ehtiyac yoxdur.

**Əlləməl-əsmaə** – “Bütün adları öyrətmək”.

İfadəni Nəsimi Quranın 2-ci surəsinin 31-ci ayəsindən iqtibas etmişdir.

Orada deyilir:

“Allah bütün adları öyrətdikdən sonra, həmin adları mələklərə göstərib dedi ki, bu adlardan mənə məlumat verin! Mələklər dedilər ki, ilahi, biz sənin öyrətdiyin şeylərdən başqasını bilmirik. Halbuki sən alimsən. Sonra Allah Adəmə dedi ki, adlar haqqında məlumat versin. Adəm isə düzgün məlumat verdikdə Allah mələklərə dedi: “Sizə dedimmi ki, mən yerin və göylərin sirrini bilirəm?”.

Nəsimi isə bir hürufi kimi həmin ayənin, eləcə də Qurandakı 20-ci

(“Taha”), 24-cü (“Nur”) və 44-cü (“Düxan”) surəsinin insan üzündə yazılmış olduğunu aşağıdakı beytdə irəli sürüb deyir:

Surətindən zahir oldu mə’nayi zati-əhəd,
Əlləməl-əsma” vü Taha’dır üzün Nurü Düxan”.

**Ələm-nəşrəh** – “Biz genişləndirmədikmi?”

İfadə Quranın 94-cü surəsinin adıdır.

**Ə'ma** – "Kor". Bu ifadəni Nəsimi Quranın 17-ci surəsinin 66-cı ayəsindən iqtibas etmişdir.

**Ənfüs** – "Ruhlar", ayat "əlamətlər", afaq "üfüqlər".

İfadələri Nəsimi Quranın 41-ci surəsinin axırıncı ayəsindən iqtibas etmişdir. Orada yazılır:

"Biz öz əlamətlərimizi dünyanın hər yerində və insanların özlərində göstərəcəyik, ta ki, onun haqq (Allah) olması sübuta yetə".

Bu ayənin axırında yazılan ənnəhül-həqq – "doğrudan da o, haqdır" ifadəsindəki "hu" (o) – üçüncü şəxs əvəzliyidir. Hürufilər ilə ruhanilər arasındakı fikir ayrılığı da buradan doğur. Ruhanilər həmin əvəzliyin Allaha aid olmasını iddia edərək deyirlər ki, o, yəni Allah haqdır və göstərdiyi əlamət isə kainatın və insanların nizam üzrə yaranmasıdır. Nəsimi isə deyir: Quran Allah kəlamıdırsa və bu cümləni Allah özü söyləmişdirsə, məntiqi qayda-qanuna görə "o, haqdır" deyil, yəni insan Allahdır deyilmişdir.

Ənharü xəmrin ləzzətən, liş-şaribin. Ifadə Quranın 47-ci surəsinin 16-cı ayəsindən iqtibas olunmuşdur. Orada deyilir:

"Möminlərə vəd olunan behiştdə heç vaxt bulanmayan su, heç vaxt tamını dəyişməyən süd və içənlərə ləzzət verən şərab arxları vardır". Nəsimi, şərab arxlarının təbii gözəlin dodaqlarından ibarət olduğu fikrini irəli sürərək ruhanilərin vədlərinin boş olduğunu, nə behiştdə, nə göylərdə təbii insane gözəli kimi bir gözəlin ola biləcəyini inkar edərək yazır:

Ey ləbin ənharü xəmrin ləzzətən liş-şaribin,
Cənnət içrə yoxdur üzün kimi fərxəndə hur.

Yəni, ey insan, Quranda vəd olunan ləzzətli şərab arxları sənin dodağındır.

Cənnətdə və göydə sən gözəllikdə huri yoxdur.

Ərrəhmanu əlal ərş istəva – "Allah taxtın üzərində yerləşmişdir".

Nəsimi Quranın 20-ci surəsinin 3-cü ayəsindən istifadə edir.

Ərfi ə'rif – "Ə'rəf ətri, qoxusu", "Məcməül-bəhreyn"in müəllifi Fəxrəddinin yazdığına görə "Ə'raf" sözünün bir mənası dini əqidələrə görə behiştlə cəhənnəm arasında bir yer adıdır. İkinci mənası isə ən yaxşı, xeyirxah adamlara deyilir.

Nəsimi də "Ə'raf" sözünün ikinci mənasını nəzərə alaraq adını yalandan sufi qoyanlara müraciət edib deyir:

Əhli-ürfanın yeri mə'nidə çün Ə'raf imiş,
Çün sən ariflərdən oldun ərfi-ə'rafın qanı?

– Yəni ürfan əhli olanların mövqeləri, gördüyü işlər xeyirxahlıqdır. Əgər doğrudan arif isən, bəs nəyə görə səndən xeyirxahlıq qoxusu gəlmir?

**Əsrari ma ovha** – “Vəhy, ilham olunan sirlər”.

Saçındır leylətül-əsra, qaşun əsrari-ma ovha,
Qanı həqdən irişmiş can bu ma ovhavü ovhaya?

Nəsimi insan gözəlliyini yüksək qiymətləndirərək deyir: – Ey insan, Quranda xəbər verilən (leylətül-əsra) merac gecəsi sənin saçın və həmin gecə Məhəmmədə ilham olunan sirlər isə sənin qaşlarındır.

**Əshabi-kəhf** – “Mağara yoldaşları, mağarada olanlar”. Nəsimi bu ifadəni Quranın 18-ci surəsində göstərilən dini-əfsanəvi bir əhvalatdan iqtibas etmişdir. Quranda yazıldığına görə guya çox qədim zamanlarda yaşayan zülmkar bir padşahın əlindən qaçan bir neçə adam bir mağarada gizlənir və orada yatıblarmış. Bu zaman mağara uçur, qapısı bağlanır və orada yatan adamları heç kəs görmür. Onlar isə özlərinin xəbəri olmadan bir neçə yüz il oradaca yuxuya gedib, sonra oyanırlar. Mağaranın da qapısı qeybdən yenə açılır və onlar mağaradan çıxıb öz həyatlarını davam etdirirlər. Quranın yazdığına görə onların kim və neçə nəfərdən ibarət olmaları və neçə yüz il yuxuda qalmaları, eləcə də bu uzun müddət ərzində qaranlıq mağarada nəyə görə çürüməmələri hələ də sirr olaraq qalmaqdadır və bu sirri Allahdan başqa bilən yoxdur.

Nəsimi həmin əfsanəni xatırladaraq deyir:

Əshabi-kəhfin sirrini görmüş liqayi-Tura sor,
Neçün ki, vəttur əhlinin kəhfindədir Qitmirimiz.

Yəni mağara yoldaşlarının sirrini məndən soruşun, çünki vücudumuz vəttur əhlinin (ariflərin) himayəsindədir.

**Fəl mulqiyati əmrə əlfar** – “Əmri, hökmü çatdıranlar”. Əlfari sözü isə əlfariqatu fəqan “bir-birindən ayıran” ifadəsinin ixtisar formasıdır.

**Hacibeyn** – Qaş mənasında olan “hacib” sözünün ikilik formasıdır, “iki qaş” deməkdir.

**Harut və Marut** – Harut və Marut dini əfsanələrdə iki mələyin adıdır.

Əfsanəyə görə guya göydəki mələklər insanların yer üzündə etdikləri cinayətləri görüb Allaha deyirlər ki, insanlar ən pis məxluqdur. Onlara verilmiş bu qədər nemətlər qarşısında sənə təşəkkür əvəzinə pis əməllərə əl atırlar.

Allah onlara deyir: “Əgər insanlarda olan imkan siz mələklərdə olsaydı, siz daha böyük cinayətlərə əl atardınız”. Mələklər Allahın bu sözlərinə etiraz etdikdə Allah onları sınamaq məqsədilə ən etibarlı sayılan iki mələyi (Harut və Marut) insan surətinə salaraq Babil ölkəsinə göndərir. Bu mələklər orada hakim sifəti ilə xalqın şikayətlərinə baxarmışlar. Bir gün Zöhrə adlı bir qadın öz ərindən şikayət etmək məqsədi ilə bu mələklərin yanına gəlir. Onlar bu

gözəl qadına vurulub ona eşq elan edirlər. Qadın isə onları aldatmaq məqsədi ilə deyir ki, “işi mənim xeyrimə kəssəniz, mən də sizin dediyinizi edərəm”.

Mələklər Zöhrənin xeyrinə qərar çıxarır. Sonra Zöhrə bunlardan İsmi-əzəmi ona öyrətmələrini və çaxır içmələrini təklif edir. Mələklər çaxırı içib məst olur. Zöhrə isə Ismi-əzəmi oxuyub göyə qalxır. İndi də güya ulduz olaraq göydə həmin ad ilə yaşayır. Harut və Marut isə Allahın acığına gəlib Babildə bir quyuda ayaqlarından asılı halda qiyamətə kimi qalmalı olurlar.

Nəsimi yuxarıdakı beytdə həmin əfsanəyə işarə edərək deyir: “Ey insan, mələklər sənin gözəlliyin qarşısında məftun olub Babil quyusundan asıldılar”.

Hazihi cənnatu ədnin fədxuluha xalidin – “Bu əbədiyyət behiştdir.

Həmişəlik olaraq oraya daxil olun”.

Ey yanağın sureyi vəşşəms üzün ayəti,
Hazihi cənnatu ədnin fədxuluha xalidin.

Nəsimi behiştin bu aləmdə təbiət gözəlliklərindən ibarət olduğunu düşünür və yuxarıdakı beytdə deyir:

Ey insan, din xadimlərinin vəd etdiyi və Quranda yazılan əbədi cənnət sənin üzündən ibarətdir. Beytin birinci misrasında vəş-şəms “and olsun günəşə” ifadəsi Quranda “Əş-şəms” surəsinin başlanğıcıdır. Nəsimi Quranda müqəddəs sayılaraq and içilən günəşin insan yanağından ibarət olduğunu deyir.

**Hablül-vərid** – “Boyunun damarı”.

Bu ifadəni Nəsimi Quranın 50-ci surəsinin 16-cı ayəsindən iqtibas etmişdir.

Orada Allah deyir: “Insanı biz yaratmışıq və onun nə haqda tərəddüd və şübhə etdiyini də bilirik, çünki ona öz boynunun damarlarından da yaxınıq”.

**Həmir (In) Ənkərəl Əsvat(i)** – “Uzunqulağın zəhlətökən səsi”.

Nəsimi bu ifadəni Quranın 31-ci surə 20-ci ayəsindən iqtibas etmişdir.

Orada Loğmanın öz oğluna nəsihətlərindən bəhs olunur. O deyir: “Ey oğul, yol gedərkən nə çox tələs, nə də həddindən artıq yavaş yeri. Danışanda ucadan danışma. Eşşəyin səsi bütün səslərdən pis və xoşagəlməzdir”. Nəsimi də zahidlərin riyakar ibadətlərini pisləyərək sadə adamları onların fırıldaqlarına aldanmamağa çağırır və deyir:

Taəti, zikri, namazı məkrü fəndir zahidin,
Arif ol, aldanma billah zahidin tamatına.
Nəfxeyi-surun sədası tutdu afaqı eşit,
Ey olan aşiq həmirin ənkərəl əsvatına.

Huval həyyu (l) ləzi la yamutu – “O, elə bir diri vücuddur ki, ona ölüm yoxdur. O ölməzdir”.

**Xəl’əti əbdiş-şəkuri** – “Şükür edən adamın mükafatı”.

Bu ifadə dini hədislərdə əfsanəvi Əyyub peyğəmbər haqqında yazılmış, Nəsimi də oradan iqtibas etmişdir. Əfsanələrə görə guya Əyyub adlı bir şəxs çox varlı adam imiş və Allahı çox sevərmiş. Məlakələr onun paxıllığını çəkərək Allaha deyir: “Əyyuba hədsiz var-dövlət verdiyinə görə səni çox sevir”. Allah Əyyubu imtahan etmək və məlakələrə nümunə göstərmək məqsədi ilə onun əmlakını, sonra övladını, daha sonra sağlamlığını da əlindən alır. Buna baxmayaraq Əyyub Allaha məhəbbətini daha da artırır və ona görə də Allah onu Əbdi-Şəkur “şükür edən bəndə” adı ilə mükafatlandırır.

Əyyub adı indiyə qədər Şərq ədəbiyyatında dözümlülük, vəfadarlıq simvolu kimi işlənməkdədir.

**İnna əzabəş-şədid** – “Doğrudan da, ən şiddətli əzab”.

**İnna fətəhna** – “Biz, sənə qələbə qazandırdıq”.

İfadə Quranın 48-ci surəsinin 1-ci ayəsindən götürülmüşdür.

Quranın şərhçiləri belə yazırlar ki, Məkkə şəhərinin alınması xəbəri bu ayə vasitəsilə qabaqcadan Məhəmmədə verilir.

Lakin Nəsiminin fikrincə bu ifadə də 10 hərfdir. 4 nöqtə də ona əlavə etdikdə 14 olur. Eləcə də üz mənasında olan ərəbcə “vəch” sözünün tərkibində olan hərflərin əbcədi-kəbir hesabı ilə miqdarı (v)6+(c)3+(h)5=14 olduğunu nəzərə alaraq, həmin ayənin insan üzünə işarə olduğunu irəli sürür.

**İnna hədeynahüs-səbilə** – “Biz ona yolu göstərdik”. Bu ifadəni Nəsimi Quranın 76-cı surəsinin 34-cü ayəsindən iqtibas edib. Orada yazılır:

“Biz nankorlara da, minnətdarlara da yolu göstərdik”.

İnna ileyha raciun – “Həqiqətən, biz onun tərəfinə qayıdacağıq”.

Bu ifadəni Nəsimi Quranın ikinci surəsinin 161-ci ayəsindən iqtibas etmişdir. Orada yazılır:

Səbirli adamlara muştuluq ver, onlara bir fəlakət üz verdikdə deyərlər: “Biz Allahınıq və onun tərəfinə qayıdacağıq”. Ona görə də müsəlmanlar bir nəfərin ölüm xəbərini eşitdikdə adətən bu ifadəni söylərlər.

Lakin panteistlər həmin ayəyə istinad edərək deyirlər ki, bütün insanlar mütləq varlığın bir hissəsidir. Onun ilə uzun müddət bir olmuş, sonra müəyyən məqsədlərə görə müvəqqəti olaraq ayrılmış, öldükdən sonra yenə qayıdaraq mütləq varlığa qovuşacaqdır.

İnnəhu şey’ün əcibün – “O, doğrudan da maraqlıdır”.

İnnəl-həsənat – “Doğrudan da xeyir işlər”.

İnnəma – “Doğrudan da, həqiqətən”.

İnşəqqəl-qəməru – "Ay parçalandı". Bu ifadə Quranın 54-cü surəsinin lap başlanğıcında yazılıb:

– "Qiyamət yaxınlaşdı və ay iki yerə parçalandı".

İstiva xətti – "Ekvator (göy sferasını iki bərabər hissəyə bölən xəyali dairə)".

Bütün hürufilər, o cümlədən də Nəsimi insan bədəninin boğazından aşağısını yer kürəsi və boğazdan yuxarını göy aləmi hesab edirdilər. İstiva xətti (ekvator) isə insanın çənəsindən başlayaraq dodaqları, burun deşiklərini, iki göz və iki qaşın arasından keçən və onları iki yerə ayıran xəttə deyilir.

İyyəkə nə'budu, min cəmalikə nəstə iynu – "Ancaq sənə pərəstiş edirik, sənin gözəlliyinə sığınırıq, kömək istəyirik". Ifadəni Nəsimi Quranın 1-ci surəsinin 4-cü ayəsindən iqtibas etmişdir.

**Kəsrənin məcruri** – Yiyəlik hal şəkilçisi ilə hallanan isim.

**Kitabun münzəlun** – "Göydən endirilən kitab, Quran".

**Köhli-bəsirət** – "Görücülük" sürməsi.

**Küfrü-əzim** – "Böyük dinsizlik".

**Küfr və şirk** – Hər iki söz "kafir" mənasındadır.

Külli şey'in halikün la reybə illa vəchühü – "Onun vəchindən başqa hər şey, şübhəsiz ki, ölüb gedəndir".

**Kün-fəkanə** – "Ol, oldu".

Nəsimi:

Çün əzəldən ta əbəd baqi mənəm,
Kün-fəkanın xəlqi xəllaqı mənəm.

Beytdə özünü həm "Kün-fəkan" ifadəsini yaradan, həm də o ifadə vasitəsilə yaranan hesab edərək deyir: "Çün əzəli və əbədi olaraq mən varam, ona görə də mən həm kainatın yaradıcısı, həm də yaranmışıyam".

Nəsimi bu ifadəni dünya mənasında da işlətmişdir.

Ey verən yarın vüsalın kün-fəkanın varına,
Gör ki, bey'ində necə külli-xəsarətdir bu gün.

Bu beytdəki "kün-fəkan" ifadəsi dünya və "bey'in" sözü isə alver, ticarət mənasındadır.

**Küntü kənzə** – "Mən bir xəzinə idim".

Bu ifadəni Nəsimi Hədisi-Qüdsidəki cümlədən iqtibas etmişdir. Orada yazılıb:

"Mən bir gizli xəzinə idim. Özümün tanınmağımı istədim və xalqı ona görə yaratdım ki, mən tanınam". İslam ilahiyyatçıları ancaq Allahın gizli xəzinə olduğunu iddia edir. Nəsimi isə bütün insan ruhunun dünya yaranmazdan əvvəl "gizli xəzinə" olduğu fikrindədir.

**Küntü qədimən** – "Mən əzəli idim, qədim idim".

**Qabü qövseyni** – "İki qövs (kaman) məsafəsi".

Nəsimi yazır:

Qabə qövseynin rümuzun sanma kim, fəhm eyləyə,
Kim ki, zahir görmədi şol mahi-bədrin qaşını.

Bu ifadəni Nəsimi Quranın "Ənnəcm" (ulduz) surəsinin 9-cu ayəsindən iqtibas etmişdir. Orada Məhəmmədin göylərə səyahəti barədə danışılır və deyilir ki, Məhəmməd ilə Allahın arasında iki qövs uzunluğundan da az məsafə var idi.

Lakin Nəsimi Quranın şərhçilərinin əksinə olaraq həmin ifadənin insan qaşlarına (qövsə – yaya oxşadığına görə) işarə olduğunu düşünür, çünki insan qaşları həm yaya oxşayır, həm də bir-birindən azacıq aralıdır.

Beləliklə, yuxarıdakı beytdə Nəsimi deyir: "O, on dörd gecəlik ayın qaşını görməyən adam "qabü qövseyn" ifadəsinin sirrini başa düşə bilməz".

Qeyd etmək lazımdır ki, Nəsimi on dörd gecəlik ay dedikdə kamil insanı nəzərdə tuturdu. "Qabü qövseyn" ifadəsini Nəsimi öz şeirlərində tez-tez işlədir.

Qadirin məqduri – Qüdrətli (Allahın) qabaqcadan hazırladığı (nə isə).

Nəsimi yazır:

Həm ənasir, həm təbaye, həm mürəkkəb, həm bəsit,
Cümlənin əslivü fər'i, qadirin məqduruyam.

Yəni həm 4 ünsür, həm bu ünsürlərdə olan xassələr, həm sadə, həm də mürəkkəb şeylər mənəm. Mən bütün mövcudatın kökü (mənşəyi) və budaqlarıyam, özüm də Allahın əvvəlcədən hazırladığı varlığam.

**Qaf vəl-Qur'ani** – "And olsun Qaf və Qurana". Bu ifadə Quranın "Qaf" surəsinin başlanğıcında yazılmışdır.

Qaf vəl Quran yanağından bilindi kim bu gün,
Yeddi xət səb'ülməsani oldu üzündən nişan.

Quranın şərhçiləri "Qaf" dağına işarə olduğunu iddia edərək deyirlər ki, güya bu dağ bütün yer kürəsini əhatə etmişdir və özü də tamamilə qiymətli daşlardan ibarətdir.

Lakin Nəsimi insana xitabən deyir:

"Bu gün Qurandakı "Qaf" surəsi yanağından bəlli oldu. Habelə üzündəki 7 xətt, 7 ayədən ibarət olan "Fatihə" surəsi sənin üzündən nişanədir".

**Qalə ixsə'u fiha** – "Itilin, çıxın gedin"

Onlar ki, nar əshabıdır çıxmaz tamudan ta əbəd;
Qalə ixsə'u fiha cavab anlar netəkim yalına.

Bu ifadəni Nəsimi Quranın “Mö’minun” surəsindəki 108-ci ayədən iqtibas etmişdir və beytin izahı belədir:

– Od əhli olan adamlar (vəhdəti-vücuda inanmayanlar, Allahı kainatdan ayrı bir varlıq hesab edənlər nəzərdə tutulur) əbədi olaraq cəhənnəmdən çıxa bilməzlər. Onlar üçün “itilib gedin” deyə cavab veriləcəkdir.

**Qalu-bəla** – “Bəli, dedilər”.

**Qasiridrak** – ağlı, şüuru çatışmayan, kütbeyin adama deyilir.

**Qasiratüt tərfi ləm yətmis** – “Həmişə gözlərini aşağı dikən və saraylarda yaşayan bakirə qızlar”.

“Ər-Rəhman” surəsindəki 58 və 72-ci ayələrdən iqtibas edilmişdir. Quranın şərhçiləri iddia edirlr ki, güya behiştdə elə gözəl qızlar vardır ki, onları ancaq mömünlər üçün saxlamışlar, qiyamətdə gələcək ərlərini gözləyirlər.

Nəsimi Qurandakı bu ifadələrin maddi aləmdəki insan gözəlliyinə işarə olunduğunu yazır.

**Qul kəfa billah** – “De ki, Allah kifayət edər” deməkdir. İfadəni Nəsimi Quranın 29-cu surəsinin 52-ci ayəsindən iqtibas etmişdir. Orada yazılır:

“De ki, sizinlə mənim aramda Allahın şahid olması bəs edər, Allah göyləri və yerdəkiləri bilir. Allahı inkar edənlər və boş şeylərə inananlar ziyana düşənlərdir”.

Nəsiminin fikrincə bu ayədəki “şəhid” sözü şahid mənasında deyil, müşahidə olunan, göz ilə görünən mənasındadır. Boş şeylərə inanan və nəticədə isə zərərə düşən fəqihlər və zahidlər özləridir. Ona görə də Nəsimi deyir:

Surətin əsrarını zahid nə bilsin, ya fəqih,
Qul Kəfa billaha məhrəm qanda hər heyvan olur?

Ey insan, sənin üzünün sirlərini zahid ilə fəqih nə bilsin? Çünki bu əsrarı bilmək, ona məhrəm olmaq hər heyvanın işi deyildir.

**Qul hüvəllahu əhəd** – “De ki, Allah birdir”.

Ey camalın qul hüvəllahu əhəd
Surətin nəqşidir Allahüs-səməd.
Bir ucu zülfün əzəl, biri əbəd,
Hüsnünə şeytan imiş mən la səcəd.

Bu rübaidə (qul hüvəllahu əhəd və Allahüs-səməd) “de ki, Allah yeganə və biehtiyacdır” ifadəsi Quranın 112-ci surəsinin başlanğıcında yazılmışdır.

Quranın şərhçilərinin fikrincə burada Allahın təbiətdən kənar yeganə bir varlıq olması göstərilir. Lakin Nəsiminin fikrincə yeganə və biehtiyac adlanan mütləq varlıq – Allah insan camalında təcəlli etmişdir. Əfsanəyə görə, Allah bütün məlaikələrə əmr etmişdi ki, Adəmə, yəni insana səcdə edələr.

İblis adlı mələk insana səcdə etmədiyinə görə adı şeytan olaraq Allah dərgahından qovulmuşdur. Ona görə də Nəsimi yuxarıdakı rübaidə deyir:

“Ey insan, sənin camalın Qurandakı qul hüvəllahu əhəd (de ki, o, yeganə Allahdır) ifadəsi, üzün isə Allahüs-səməd (Allah biehtiyacdır) ifadəsidir.

Əbədiyyət və əzəliyyət sənin saçının uclarıdır. Sənin gözəlliyin qarşısında baş əyməyən ancaq şeytan olmuşdur”.

**Qul hüvər-rəhman** – “De ki, o, Allahdır”.

Bu ifadəni Nəsimi Quranın 67-ci surəsinin 28-ci ayəsindən iqtibas etmişdir.

Orada deyilir:

“De ki, o, mehriban Allahdır, biz ona inanır və arxalanırıq. Siz biləcəksiniz ki, yolunu kim azmışdır”.

İnsan üzünə ərəbcə vəch deyilir. Bu sözün tərkibində olan üç ərəb hərfinin əbcəd hesabı ilə miqdarı (V=6)+(C=3)+(H=5)=14-dür.

Qul hüvər-rəhman ifadəsinin də tərkibində ərəbcə 11 hərf və 3 nöqtə vardır ki, 11+3= cəmi edir 14.

“Vəch” sözündəki hərflərin miqdarı “qul hüvər-rəhman” ifadəsi tərkibində olan hərf və nöqtələr ilə bərabər olduğu üçün Nəsimi həmin ifadəni insanın üzünə şamil edərək yazır:

Üzündür qul hüvər-rəhman saçındır əlləməl-Qur’an,
Əcəb, şol canların canı nə kanın göhərindəndir.

Əlləməl-Qur’an ifadəsində də (ə.l.l.m.ə.l.q.u.r.a.n.) on bir hərf və 3 nöqtə vardır ki, (11+3) onun cəmi 14 olur. “Zülf” sözü isə səyyarat hesabı ilə, yəni hərflərin əbcədi-kəbir hesabı ilə 12 olur. Ərəb hərfləri ilə yazılan “zülf” sözündə iki nöqtə vardır ki, bu da 14 olur. Ona görə də yuxarıdakı beytdə Nəsimi insan saçını əlləməl-Quran ifadəsi hesab etmişdir.

**Qul, təbarək ya müsəvvir leysə fiha min fütur** – “De ki, uğurlu ol, ey rəssam, onda heç bir nöqsan yoxdur”.

**La, ila, illa** – lailahə illa əllah – “Allahdan başqa mə’bud yoxdur”.

**Leysə kəmislihi** – “Ona bənzər şey yoxdur”.

Nəsimi bu ifadəni Quranın 42-ci surəsinin 9-cu ayəsindən iqtibas etmişdir.

Nəsiminin fikrincə, Quranda Allah haqqında söylənmiş bu ayə gözəlin qaşları, ağzı və çənəsi haqqında deyilmişdir.

**Lövhün məhfuzun** – “Qorunub saxlanılan lövhə”.

Dini əfsanələrə görə guya göydə elə bir lövhə vardır ki, dünyanın əvvəlindən axırına kimi bütün baş verəcək hadisələr orada yazılmış və bu yazıları gözəgörünməz Allahdan başqa bilən yoxdur. Lakin Nəsimi adı çəkilən lövhənin insandan ibarət olmasını irəli sürür.

**Lovlakə, ləma xələqtul əflakə** – “Sən olmasaydın göyləri yaratmazdım”.

**Ma yəsturun** – “Davat və qələmin yazdığı şeylər”. Dini əfsanələrə görə guya, ilk davat və qələm ilə Allah Quranı və ya dünyada baş verəcək bütün hadisələri yazmışdır. Ona görə də həmin davat, qələm və onların yazdıqları müqəddəs hesab edilir ki, Quranda onlara and içilmişdir. (And olsun nuna, qələmə və onların yazdıqlarına).

**Min əhlis-sürури** – “Sevinc əhlindən” olmaq. Nəsimi deyir:

On səkiz min aləmin ayinəsidir surətin,
Kim ki, ol mir’atı buldu, oldu min əhlis-sürur.

Bütün kainatın insan vücudunda göründüyünə inanan hürufilər onun surətini güzgüyə bənzədirdilər və deyirdilər ki, bu həqiqəti ancaq onlar dərk edə bilmişlər.

Ona görə də Nəsimi yuxarıdakı beytdə deyir: “Ey insan, sənin surətin 18 min aləmin güzgüsüdür. Hər bir cisim güzgüdə göründüyü kimi, səndə də görünür. Bu güzgünü bilənlər sevinc əhli oldular”.

**Min həbibin indəhu elmül-kitabi** – “Quranı (elmini) mənimsəmiş dostdan”.

**Möhtəcibun nuruhu təhtəzzülami** – “Onun işığı zülmət pərdəsi altında gizlənibdir”.

**Mö’minin mir’atu mö’mini** – Möminlər mömininin güzgüsüdür.

**Münəzzəh** – Burada maddi cisimdən azad mənasındadır.

**Münkirin eyni ə’madır** – “Münkiri inkar edənin gözü kordur”.

**Rəbbəna, ətmim ləna nurəna yuqalu filcina** – Behiştdə deyilir: “ilahi, bizim nurumuzu təkmilləşdir”. Nəsimi bu ifadəni Quranın 67-ci surəsinin 8-ci ayəsindən iqtibas etmişdir.

**Rəbbi ənzilni** – “Ilahi, məni endir (harasa)”.

**Rəbbi ərini** – “Ilahi, mənim gözümə görün”. Bu ifadəni Nəsimi Quranın
7-ci surəsinin 133-cü ayəsindən iqtibas etmişdir. Orada yazılır:

Musa peyğəmbər dedi: “Ilahi, özünü mənə göstər. Ta ki, mən sənə baxım”.

Allah ona dedi ki, məni görə bilməzsən. Qarşıdakı dağa bax. Əgər dağ mənim görüşümə taqət gətirsə, sən də məni görə bilərsən. Allah dağa təcəlli etdikdə dağ parça-parça olur və Musa da taqət gətirməyib, huşunu itirmiş halda yıxıldı. Musa ayıldıqdan sonra tövbə edib dedi: “Ilahi, sən gözə görünməzsən, mən birinci möminlərdənəm”.

Bu əfsanəyə əsasən Nəsimi deyir:

Rəbbi-ərininin cavabı ləntərani çün gəlir,

Səndə gör didarın anın, özgə didar istəmə.

Yəni "ilahi, mənim gözümə görün!" deyən adamlara "məni görə bilməzsən!" cavabı gələr. "Allah, mənə görün" deməyə ehtiyac da yoxdur. O sən özünsən, onu özündə gör, başqa yerlərdə axtarma.

**Rəəytü-rəbbi** – Tanrımı gördüm. Dini əfsanələrə görə, Məhəmməd göylərə səfər etmiş və səfərdən qayıtdıqdan sonra demişdir ki, mən Allahı gözəl bir gənc oğlan simasında gördüm.

Nəsimi öz müəllimi Fəzlullah haqqında söylədiyi şerində deyir:

Həm rəəytü-rəbbi dedi leylətül-me'racdə,

Sənsən, ol fisurətin-əhsən ki, verdi həq liqa.

Yəni, ey Fəzl, Məhəmməd merac gecəsi tanrını gözəl bir gənc surətində görməsini demişdir. Allahın təcəssüm etdiyi o gənc surət sən idin!

Lakin başqa beytlərində şair göstərir ki, Allah təkcə Fəzlullahın deyil, bütün gənclərin surətində təcəlli etmişdir. Məs:

Gər həqi görmək dilərsən biğələt

Bəllidir "fisurətin şabbin təqət.

Yəni Allahı şübhəsiz görmək istəsən, o ancaq gənclərin simasında aydındır.

**Rəhmətün lil aləmin seyyidi kövneyni** – "Hər iki dünyanın canıyananı, mərhəmətlisi və hər iki dünyanın ağası".

**Rəqq** – Qədimlərdə kağız yerinə istifadə olunan dəri növü.

**Rəqqi-mənşur** – "Yazılı dəftər". Ifadə Quranın 52-ci surəsinin 2-ci ayəsindəndir. Dini əfsanələrə görə güya dəridən hazırlanmış dəftərə dünyanın əvvəlindən axırına qədər baş verəcək bütün hadisələr yazılmışdır.

**Rətbü-yabis** – "Yaş və quru". Ifadə Quranın 6-cı surəsinin 69-cu ayəsindəndir. Orada yazılır:

Yaşdan quruya nə varsa Quranda vardır.

**Rümuzu minlədün** – "Lədünni" elminin sirləri.

"Minlədün" və ya "lədünni" elmi, dini əfsanələrə görə o elmlərə deyilir ki, onu Allahdan başqa bilən olmamış və olmayacaqdır. Buna bəzən sirriməknun da deyilir.

**Səb'ül-məsani** – "Iki dəfə təkrar yeddi". Dini rəvayətlərdə "təkrar olan yeddi" dedikdə Quranın birinci surəsi nəzərdə tutulur. Çünki bu surə yeddi cümlədən (ayədən) ibarətdir. Guya bu surə birinci dəfə Məkkə, ikinci dəfə isə Mədinə şəhərində Məhəmmədə nazil olmuşdur. Cümlələrin sayına görə yeddi (səb') və iki dəfə nazil olduğuna görə də təkrar olan (məsani) deyilir.

Lakin Nəsimi "səb'ül-məsani" – iki dəfə yeddi dedikdə, insanın ana bətnin-

dən gətirdiyi yeddi cərgə (kirpiklər, qaşlar, saç) tükü və həmin tüklərin göyərmiş olduğu yeddi yeri nəzərdə tutaraq insan üzünə Qurandakı “səb’ülməsani” surəsi deyir.

**Sə’di-əkbər** – Böyük səadət, xoşbəxtlik.

**Səqahum rəbbihüm** – “Tanrıları onlara içirtmişdir”.

İfadəni Nəsimi Quranın 76-cı surəsinin 20-ci ayəsindən iqtibas etmişdir.

Orada yazılıbdır ki, tanrıları onlara pak (təmiz) şərab içirtmişdir.

Ey səqahüm rəbbihüm xəmrindən ikrah eyləyən,
Taib ol qəflət meyindən, sındır ol peymanəyi.

Yəni, ey Quranda halal sayılan şərabdan (saf eşqdən) acığı gələn vaiz və tahidlər, siz qəflət badəsi içmişsiniz, tövbə edərək o badəni sındırın, ilahi eşqi, saf məhəbbəti inkar etməyin!

**Səqarə xalidinə fiha** – “Əbədi olaraq cəhənnəmdə”.

Bu ifadəni Nəsimi Quranın 72-ci surəsinin 23-cü ayəsindən iqtibas etmişdir.

**Səqfi mərfu’un əsası** – “Yüksəldilən tavanın bünövrəsi, (burada) göyün əsası”.

**Səllu əla cəmalihi** – Onun camalına salavat çevirin.

**Sibğətullahi və mən əhsənü** – “Allahın boyası (rəngi), burada din mənasındadır və kimin boyası yaxşıdır”.

Nəsimi bu ifadəni Quranın 2-ci surəsinin 37-ci ayəsindən iqtibas etmişdir. Orada yazılır:

“Bu, Allah boyasıdır. Kimin boyası Allahınkından yaxşı olacaqdır. Biz isə ona ibadət edirik”.

Quranın şərhçiləri “boya” mənasında olan “sibğə” sözünü məcazi mənada işlətmiş, həmin sözün “din” mənasında olduğunu irəli sürərək ayəni belə şərh edirlər: “Bu, Allahın dinidir, onun dinindən yaxşısı ola bilməz, biz ona ibadət edirik”.

Lakin Nəsiminin fikrincə Qurandakı həmin ayə insanın üzünə və gözlərinə işarədir.

**Sidreyi-ə’la** – “Ən yüksək sidrə ağacı”.

İfadə Quranın 53-cü surəsininı 13-cü ayəsindən iqtibas olunmuşdur. Dini əfsanələrə görə guya bu ağac göydədir və çox böyük ağacdır. Ancaq Quranda bu ifadə “Sidrətül-müntəha” kimi yazılmış, guya Məhəmməd maraca gedən zaman Allahı ikinci dəfə həmin ağacın yanında görmüşdür.

Nəsiminin fikrincə, Quranda göstərilən sidrə ağacı göylərdə deyil, insane üzündən ibarətdir. O deyir:

“Yazdı alnunda xuda “inna-fətəhna” surəsin,
Qaf vəl-Quran üzündür, sidreyi-ə’la imiş”.

Bu beytdəki “Inna-fətəhna”, “Qaf vəl-Quran” ifadələrinin hər biri Quranda bir surə adıdır.

**Sübhan-əlləzi əsra biəbdihi** – “Öz bəndəsini gəzdirən adam müqəddəsdir”.

İfadə Quranın 17-ci surəsinin başlanğıcından iqtibas olunmuşdur.

Orada yazılır:

“Bir gecənin ərzində öz bəndəsini Kəbədən Beytülmüqəddəsə kimi gəzdirən adam müqəddəsdir”.

Quranın bütün şərhçiləri bu ayəni Məhəmmədin meracına işarə olduğunu və həmin hadisədən xəbər verdiyini iddia edirlər. Nəsimi isə yuxarıdakı ayənin insan zülfündən ibarət olduğunu göstərir.

Yuxarıdakı ayədə 17 ərəb hərfi (s, b, h, a, n, l, z, ı, i, a, r, a, b, ə, b, d, h) var. Ərəbcə zülfi (“cə’d”) sözündə olan 3 ərəb hərflərinin də əbcədi-səğir (kiçik əbcəd) hesabı ilə (c=3)+(ayn=10)+(d=4)=17 cəmi 17-dir. Elə buna görə də Nəsimi insan saçını Qurandakı sübhanəlləzi əsra biəbdihi ayəsi hesab edir. Fuad Köprülüzadənin yazdığına görə, hürufilər ərəb hərflərini insane üzündə görünməsinə merac deyir, bu hərfləri görə bilmək isə meraca getməkdir.

Hürufilərin fikrincə, meracda məqsəd vəchi-insandakı xətləri görməkdən ibarətdir. Ona görə də Nəsimi yuxarıdakı beytdə deyir: Quranda meracı andıran ayə insan yanaqları üzərindəki zülfdür ki, orada müsəlsəl xətt ilə yazılmışdır.

**Sümmə ənşə’nahu xəlqən axərin** – “Sonra isə onu bir ayrı xalq yaratdıq”.

Bu ifadə Quranın bir neçə surəsində, o cümlədən 21-ci surəsinin 11-ci ayəsində yazılmışdır. Orada “xəlqən” sözü əvəzinə “qövmən” işlədilmişdirsə də, hər iki söz xalq mənasındadır. Orada göstərilir ki, “bir çox şəhərlər və kəndlərin əhalisi zülmkar olduqlarına görə onları məhv edərək yerlərində başqa xalq yaratdıq”.

Nəsimi bu ifadəni Fəzlullah Nəimi ilə mübahisə etdiyi bir gecənin təsvirində “dün gecə bir dilbər ilə eyşimiz məmur idi” mətləli şeirində işlətmiş və Qurandakı bu ayənin də Fəzlin üzündə yazılmış olduğunu belə tərənnüm edir.

Hürufilərin fikrincə hər bir peyğəmbər dünyaya gəlməklə köhnə dünya aradan gedir, yeni bir aləm başlanır və bu dövrün insanları da ruhən başqa, yeni insanlardır. Hürufilərə görə həmin peyğəmbərin gəlməsi ilə qiyamət olur, yeni dövr başlanır. Onların fikrincə, indiyə qədər Ibrahim, Musa, Isa, Məhəmməd peyğəmbərlər dünyaya gəlmişdir. Onların hər birinin gəlişi ilə qiyamət olmuşdur. Bu gəliş onlardan əvvəlki dövrün sonu və yeni dövrün

başlanğıcı idi. Ona görə də onların hər biri öz dövrünün adamlarının şüuruna uyğun yeni kitab və yeni din gətirirdi. Fəzlullahın gəlməsi ilə yenə qiyamət oldu, köhnə dövr qurtarıb, yeni dövr başlandı. Fəzlullahın yazdığı "Cavidannamə" bü dövrün Quranıdır.

Nəsimi bu beytində həmin Quran ayəsinin Fəzlullahın üzündə yazıldığını söyləyir, onu xubların (peyğəmbərlərin) şahı (ən mükəmməli) adlandırır.

**Tis'ə ayat** – Doqquz möcüzə. Bu ifadəni Nəsimi Quranın 17-ci surəsinin 103-cü ayəsindən iqtibas etmişdir. Orada deyilir:

Həqiqətən biz Musaya doqquz aşkar möcüzə verdik. Bəni-İsrail tayfasından soruş, Musa onların yanına gəldikdə Firon ona dedi ki, ey Musa, zənnimcə sənə sehr və cadu etmişlər. Quranın şərhçilərinin yazdığına görə Musaya verilən doqquz möcüzə bunlar idi:

1. Musanın əlindəki əsa, istədiyi zaman əjdahaya çevrilə bilərmiş.
2. Yədi-beyza – "Işıqlı əl", Musa əlini qoltuğu altına salıb çıxartdıqda göz qamaşdıran nur saçırmış.
3. Nil çayı. Bu çay da Musanın əmrinə müti imiş. Ax desə axar, dayan desə dayanarmış
4. Külək – guya Musanın əmri ilə tufan qoparmış.
5. Uçan çəyirtkələr. Guya bunlar da Musanın əmri ilə o istədiyi yerə hücuma keçər, oranın bitkisini məhv edərmiş.
6. Piyada çəyirtkələr.
7. Aclıq. Guya Musa istədiyi vaxt istədiyi adamları aclığa düçar edə bilərmiş.
8. Qurbağalar.
9. Qan.

Nəsimi bir beytində deyir:

Tis'ə ayət, atəşü Musavü lövhün sirrini,
Istər isən, gəl təvaf et məscidi-əqsamızı.

Nəsimi bu beytdə yuxarıdakı 9 möcüzə, Musanın odu və lövhün sirrinin adını çəkərək deyir: bunları bilmək istəyirsənsə, gəl bizim xanəgahımızı ziyarət et.

Turi-sina – "Sina dağı", ərəblər "Zübeyr dağı" da deyirlər. Dini əfsanələrə görə Musa peyğəmbər bu dağın üzərində Allah ilə danışırmış. Ona görə də dini ədəbiyyatda bu peyğəmbərin adına "Kəlim" və yaxud "Kəlimüllah" deyilir.

Nəsimi Qurandakı "Turi-Sina" ifadəsinin insan yanağından ibarət odluğunu aşağıdakı beytdə söyləyir:

Ey yanağın Turi-Sina, vey xətin həyyi-qədim,
Ey təcəllidən çü buldu haqqa yol Musa kəlim.

Nəsimi bu beytində insan yanağının dini nöqteyi-nəzərdən müqəddəs hesab edilən "Turi-Sina" olduğunu tərənnüm etməklə bərabər, insan üzündəki cizgiləri də "həyyi-qədim" (qədim Allah) hesab edir.

Bunu da qeyd etmək lazımdır ki, Nəsiminin şeirlərində "Tur" sözü iki şəkildə yazılmışdır.

Artiklsız Tur yazıldıqda (Tur) dağ, artikl ilə (əttur) yazılanda isə Quranın 52-ci surəsinə işarədir.

**Ülaikə** – ("Onlar").

Ifadəni Nəsimi Quranın 7-ci surəsinin 178-ci ayəsindən iqtibas etmişdir.

Orada yazılır:

"Ins və cindən bir çoxlarını cəhənnəm üçün yaratdıq ki, onların könülləri vardır, lakin onunla bir şey anlaya bilmirlər, gözləri vardırsa da görmürlər.

Qulaqları vardır, amma eşidə bilmirlər. Onlar heyvan kimi bir şeydirlər.

Bəlkə heyvandan da azğındırlar". Nəsimi riyakar və yalançı fəqihləri də həmin azğınlardan hesab edərək deyir:

Aydır mənə ki, nəqdini ver nisyəyə fəqih,
Heyvandan ol ülaikə kəmtər degilmidir?

Ümmül-kitab – "Kitabın anası". Quranın birinci surəsi olan "Fatihə" surəsinə deyilir. Dini ehkamlara görə hər gün icrası vacib olan beş vaxt namazın hər birində iki dəfə bu surə oxunmalıdır və bunsuz namaz qəbul olmaz.

Nəsimi nəzərdə tutduğu "Ümmül-kitab" Quranın başlanğıcında yazılan və 7 cümlədən ibarət olan surə deyil, insanın üzündə olan (iki qaş, dörd kirpik, bir saç) 7 xətdir.

Kirpiyin, qaşınla zülfündür mənə ümmül-kitab,
Kim, qəbul ansız səlat olmaz, buyurdu Mustafa.

**Ünzüruna bisurəti-rəhman** – "Bizi Allah surətində görün!" Hürufilər insan üzündə Quranın bütün ayələrinin yazıldığını iddia edirdilər. Ona görə də Nəsimi deyir:

Həq-kitabı üzün bəyanidir, ünzüruni bisurəti-rəhman.
Ey insan, Quran sənin üzünün şərhidir. Bizə Allah kimi baxın.

**Ürvətül-vüsqa** – "Etibarlı, möhkəm əlaqə teli".

Bu ifadəni Nəsimi Quranın 2-ci surəsinin 157-ci ayəsindən iqtibas etmişdir. orada yazılır:

"Şeytanın sözünə baxmayıb Allaha inananlar elə bir möhkəm əlaqəyə (ipə) əl atmışlar ki, o, qırılmazdır".

Nəsimi Quranda göstərilən qırlımaz və möhkəm teli (əlaqəni) insan saçına işarə hesab edir.

**Vacibün və mümkinun** – "Zəruri və mümkün; zərurət və imkan" deməkdir.

**İslam ilahiyyatçıları Allahın varlığını zəruri hesab edərək ona vacibül-**vücud (zəruri varlıq), qalan varlıqları isə mümkünül-vücud (zəruri olmayan varlıq) adlandırırlar.

**Vadiyi-müqəddəs** – "Müqəddəs çöl", "Müqəddəs vadi".

Dini kitablarda müqəddəs vadi Musanın Allah ilə söhbət etdiyi yerə deyilir.

Nəsimidə:

Həm mənəm Vadiyi-müqəddəs, həm mənəm narü şəcər,
Həm mənəm nurü təcəlli, həm Kəlimin Turiyəm.

Yəni müqəddəs vadi, oradakı ağac, bu ağacda Musanın gözünə görünən od, həm Musanın Tur dağı və bu dağda təcəlli edən nur bunların hamısı mənəm.

**Vahibi**-surət. "Surəti, şəkli bəxş edən (Allah)" deməkdir.

Və'budu iyyahu, vəscud, vəqtərib – "Ona ibadət et, səcdə qıl və yaxınlaş".

Nəsimi bu cümlədəki "vəscud, vəqtərib" ifadələrini Quranın 96-cı surəsinin sonuncu ayəsindən, "və'budu iyyahu" ifadəsini isə Quranın başqa surələrindən iqtibas etmişdir. Bu cümlədəki "iyyahu" sözü ərəbcə üçüncü şəxs əvəzliyidir. Ruhanilər həmin şəxs əvəzliyiynin Allaha aid olduğunu hesab edirlər.

Nəsimi, ayənin yuxarıda dediyimiz qrammatik qruluşundan istfadə edərək ibadət və səcdənin insalara aid olduğunu tərənnüm edərək yazır:

Ey Nəsimi, səcdə qıl ol-Maha kim, həqdən sənə
Və'budu iyyahu, vəscud, vəqtərib gəldi-xitab.

Yəni, ey Nəsimi, o gözələ (insana) səcdə et ki, onun haqqında Quranda "ona səcdə və ibadət edin, ona yaxınlaşın" əmri gəlmişdir.

**Vəchu hu fiha kabədrin fil ğəmami** – "Onun üzü bulud altında olan on dörd gecəlik ay kimidir".

**Və'deyi-küllü mən əleyhi fanin** – "Torpaq üzərində (və ya dünyada) olanların hamısı öləcək" vədəsi. Bu ifadəni Nəsimi Quranın "Ərrəhman" surəsinin 22-ci ayəsindən götürmüşdür. Orada deyilir ki, Allahdan başqa dünyada olanların hamısı aradan gedəcəkdir.

**Və'deyi-mən-fil-qübur** – "Qəbirdəkilərə verilən vədə" (Qiyamət gününə işarədir).

**Vədud –** "Dost, dost olan" deməkdir.

**Vəhdəhü laşərikə ləh** – "O təkdir, şəriki yoxdur".

Nəsimi Qur'andan götürülmüş bu ifadələrin hər ikisinin insan gözəlliyinə aid olduğunu tərənnüm edərək deyir: "Quranda tək və şəriksizliyi xəbər verilən şey gözəlin camalı və misilsiz hesab edilən şey isə onun saçı, qaşları və çənəsidir".

**Vəla əcibə minəl ətri ən yəfuhə şəmim** – "Ətirdən xoş qoxunun gəlməsi heç də təəccüblü deyildir".

**Vəllahü ə'ləm bissəvab** – Allah yaxşı bilər.

**Vərdi-cinan** – Cənnət gülü.

**Vərdi-əhmər** – Qızılgül.

**Vərtə** – Burulğan (suda). Vərtədən zövrəqi çəkmək – burulğandan gəmini xilas etmək.

**Vəssəmai zatil-büruci** – "Bürcləri olan göyə and içirəm".

Vəssəmai zatil-büruc saçü qaşü kirpiyin,
Kim cə'əlnahu tibaqən yeddi əflakındürür.

Bu beytdəki ifadələrin hər ikisini Nəsimi Qurandan götürmüşdür. Onlardan birincisi Quranın 85-ci surəsinin başlanğıcında yazılmış və "and olsun bürcü olan göylərə" mənasını verir. Ikinci ifadə isə Quranın 71-ci surəsinin 15-ci ayəsindən iqtibas edilmişdir. Orada yazılır: "Görmürsünüzmü Allah yeddi göyü necə də təbəqə-təbəqə yaratmışdır?"

Nəsimi yuxardıakı beytdə göstərir ki, Quranda müqəddəs bir varlıq hesab edilərək onlara and içilən, eyni zamanda yeddi təbəqədən ibarət olan bürclü göy insan üzündə sıra ilə biri digərinin üstündən düzülən yeddi cərgə tükə (2 qaş, 4 kirpik, 1 saç) işarədir.

**Vəssəmai vəma fiha** – "Göyə və göydə olanlara and olsun".

**Vəssaffati səffən vəzzacirati zəcrən** – "Sıra ilə, cərgə ilə düzülənlər və əzab verənlərə and içirəm". Bu ifadə Quranın 37-ci surəsinin başlanğıcında yazılmışdır. Orada Quranın şərhçiləri "cərgəyə düzülənlər" dedikdə mələkləri və ya namaza düzülənləri nəzərdə tuturlar, "əzab verənlər" dedikdə isə bəziləri cəhənnəm mələklərini (günahkarlara əzab verdiklərinə görə), bəziləri isə namaz qılanları (özlərinə əzab verdiklərinə görə) nəzərdə tuturlar.

Lakin Nəsimiyə görə Quranda müqəddəs sayılan və onlara and içilən "cərgəyə düzülənlər" şairin əsərinin qəhrəmanı olan insanın kirpikləri və əzabvericilər dedikdə hicran qəminə işarədir.

**Vəttur** – Quranda 52-ci surənin adıdır. "And olsun Tur dağına" mənasındadır.

Guya Musa həmin dağda Allah ilə danışırmış.

**Vəzzüha, vəlleyl** – “And olsun gunduzə və gecəyə”.
Camalın vəzzüha, vəlleyl zülfün,
Sənin vəsfindədir ayat mütləq.
Yəni ey insan, Quranda and içilən günəş sənin camalın, gecə (qara olduğuna görə) sənin saçındır. Qurandakı ayələr isə mütləq sənin şənində deyilmişdir.
**Vüsləti sübhü şam** – “Səhər-axşamın (sübh ilə şamın) bir-birinə qovuşması”.
Nəsimi bu haqda yazır:
Kimsə cahanda görmədi sübh ilə şamı müctəme’,
Gör necə zülfü arizin vüsləti-sübhü-şam edər.
Bu beytdə Nəsimi insanın saçını (qara olduğuna görə) axşama və yanağını (ağ olduğuna görə) səhərə oxşadaraq deyir:
“Dünyada səhər-axşamın birləşdiyini görən olmamışdır. Ancaq insanın saçı ilə yanağı səhər-axşamı birləşdirdi”.
Ya kaf və ha, ə’uzü bikə – “Ey “k” və “h” hərfləri, sənə sığınıram”.
Dedi ya kafü ha, ə’uzü bikə,
Çün Əli bildi müstəandır söz.
Yəni – Əli, sözün sığınacaq verən – (Allah) olduğunu bildiyinə görə dedi – ey (k) və (h) hərfləri, sənə sığınıram.
**Yədi-beyza** – “Ağ əl”.
Yədi-beyza imiş cismin ki, Musa ana məhrəmdir,
Təala şə’nühü əkbər, bu necə Turi-Sinadır.
Əfsanəyə görə “yədi beyza” ağ parıldayan, işıqlı əl, Musa peyğəmbərə verilən 9 möcüzədən biridir. Lakin Nəsiminin fikrincə, yədi-beyza insane gözəlliyidir və Musa da ondan istifadə edərmiş.
**Yövmə yunadi** – “Bir gün çağırar”.
**Zilli min yəhmum** – “Qara tüstüdən ibarət kölgə”.
İfadəni Nəsimi Quranın 56-cü surə 28-ci ayəsindən iqtibas etmişdir.
Orada yazılır: sol cərgəyə düzülənlər (qiyamətdə günahkarlar nəzərdə tutulur) isti külək, isti su və isti, qara kölgə içərisində olacaqlar.
Lakin Nəsimi bir panteist olaraq özünü həm şimal əhli, həm də bu ayədə göstərilən qara və isti kölgə hesab edərək deyir:
Aşiqəm hüsnünə eşqin ehtimalı məndədir,
Zilli-min yəhmumu əshabın şimalı məndədir.

## LÜĞƏT

**A**

*Ab* – Su
*Aba* – Atalar
*Abidi-əsnam* – Bütpərəst
*Afitab* – Günəş
*Ahən* – Dəmir
*Al* – 1. Qırmızı, 2. Nəsil, 3. Hiylə
*Am* – Cəmiyyət
*Amac* – Hədəf
*Ariz* – Üz
*Assi* – Xeyir
*Aşina* – Tanış, dost
*Aşüftə* – Dağınıq, həyəcanlı
*Ayıtmaq* – Deмək, söyləmək
*Ayruq* – Ayrı

**B**

*Bab* – Qapı
*Bad* – Külək
*Bak* – Qorxu
*Bala* – Hündür, uca
*Başəd* – Olsun ki…
*Beytül-həram* – Hərəm evi –Kəbə mənasında
*Besyar* – Çox
*Beyza* – Ağ, bəyaz
*Bə’d* – Sonra
*Bədxu* – Pis xasiyyətli
*Bədri-müəmməm* – Əmmaməli ay
*Bəğayə*t – Çox
*Bəhr* – Dəniz
*Bəxil* – Paxıl, xəsis
*Bəid* – Uzaq
*Bəqa* – Baqilik
*Bən* – Xal
*Bərg* – Yarpaq
*Bərgüzidə* – Seçilmiş
*Bərq* – Ildırım, parıltı
*Bəstə* – Bağlı
*Bəyyinat* – Sübutlar
*Bəzm* – Məclisə
*Bibədəl* – Əvəzsiz
*Bibər* – Barsız
*Bidad* – Zülm
*Bimar* – Xəstə
*Bina* – Gözlü
*Bistü-həşt* – Iyirmi səkkiz
*Bişümar* – Saysız-hesabsız
*Bulmaq* – 1. Olmaq. 2. Tapmaq
*Büyənd* – Uca
*Bürhan* – Dəlil, sübut
*Bürqə* – Niqab, örtük
*Büryan* – Yanmış

**C**

*Ca* – Yer
*Camə* – Paltar
*Cami-müsəffa* – Saf şərab
*Canəvər* – Heyvan
*Cavid* – Əbədi
*Cə’d* – Qıvrım (saçda)
*Cəhl* – Cahillik
*Cəmil* – Gözəl

*Cərəs* – Zınqırov
*Cifeyi-murdar* – Murdar leş
*Cizginmək* – Fırlanmaq, dolanmaq
*Cövşən* – Zireh
*Cud* – Səxavət
*Cuyəndə* – Axtaran
*Cüda* – Ayrı
*Cüllab* – Şərbət

**Ç**

*Çah* – Quyu
*Çakər* – Nökər
*Çar ənasir* – Dörd ünsür(torpaq, hava, su, od)
*Çeşm* – Göz
*Çeşməyi-heyvan* – Dirilik bulağı
*Çələb* – Tanrı
*Çəndan* – O qədər
*Çəri* – Qoşun

**D**

*Dam* – Tələ
*Damən* – Ətək
*Damu* – Cəhənnəm
*Dana* – Bilici
*Danla* – Sabah
*Dapu* – Xidmət, qulluq
*Dar* – Ev
*Daru* – Dərman
*Darül-qürur* – Qürur evi –Bu dünya mənasında
*Das* – Oraq
*Deyr* – Monastır, hücrə
*Dəgmə* – Nadan
*Dəğəl* – Fırıldaq
*Dəhan* – Ağız
*Dəndan* – Diş
*Dəni* – Alçaq
*Dərban* – Qapıçı
*Dəyyar* – Sakin
*Dışrə* – Çölə, xaricə
*Didar* – Görüş
*Didə* – Göz
*Dil* – Ürək
*Dilfirib* – Ürəkaldadan
*Diltəşnə* – Ürəyiyanan
*Dimağ* – Kəllə, beyin
*Diraz* – Uzun
*Diriğ* – Heyif, əfsus
*Dud* – Tüstü
*Duxan* – Tüstü
D*un* – Alçaq
*Dur* – Uzaq
*Duş* – Yuxu
*Duzəx* – Cəhənnəm
*Dürc* – Mücrü
*Düşvar* – Çətin

**E**

*Eyd* – Bayram
*Eyn* – Göz
*Eynəl-yəqin* – Yəqin etmənin 2-ci (görmə) mərhələsi
*Eyü* – Yaxşı

**Ə**

*Əbd* – Qul
*Əbhə*r – Şah damar
*Əbr* – Bulud
*Əbr*u – Qaş
*Əbsəm* – Lal
*Ədu* – Düşmən
*Ədvar* – Dövrlər
*Əhvəl* – Çəpgöz, əyrigöz
*Əhya qılmaq* – Diriltmək
*Əhmər* – Qırmızı
*Əxtər* – Ulduz
*Əks*i – Nöqsan
*Əqfas* – Qəfəslər
*Əlfaz* – Sözlər
*Ə'ma* – Korluq
*Əmvac* – Dalğalar
*Əmmarə* – Əmr edən
*Ənaniyyət* – Eqoizm, mənəmmənəmlik
*Ənar* – Nar
*Ənbərəfşa*n – Ənbər saçan
*Ənbiya* – Peyğəmbərlər
*Əncüm* – Ulduzlar
*Əndək* – Az
*Əndər* – Içində
*Əndişə* – Fikir
*Ənduh* – Qüssə
*Əngur* – Üzüm
*Əngüşt* – Barmaq
*Ənis* – Dost
*Ənkərəl-əsvat* – Qulaqbatıran, ətürpərdən (səs)
*Ənvar* – Nurlar
*Ər* – Əgər
*Ərə* – Mişar
*Ərğəvan* – Ərğəvan (al qırmızı rəngli gül)
*Ərvah* – Ruhlar
*Ərz* – Yer
*Əsbab* – Səbəblər
*Əsəl* – Bal
*Əsma* – Adlar
*Əsra*r – Sirlər
*Əsrük* – Sərxoş
*Əşcar* – Ağaclar
*Əşk* – Göz yaşı
*Əşkal* – Çətin
*Əyağ* – Badə
*Əyyar* – Zirək, hiyləgər
*Əzimət* – Səfər

**F**

*Fanus* – Fənər
*Fariğ* – Boş, qayğısız
*Fəqir* – Yoxsul
*Fərda* – Sabah
*Fərxəndə* – Xoşbəxt
*Firdövs* – Cənnət
*Firiştə* – Mələk
*Fiz-zülmətil-məmat* – Ölüm qaranlığında

**G**

*Geysu* – Saç
*Gənc* – Xəzinə
*Gərm* – İsti
*Gəz* – Uzunluq ölçüsü; Dəfə

*Gireh* – Düyün
*Giryan* – Ağlar
*Git*i – Dünya
*Giyah* – Ot
*Gunə* – Bu cür
*Guş qılmaq* – Eşitmək
*Guşimal* – Qulaq burması
*Güftar* – Danışıq
*Gülzari-cinan* – Cənnət gülzarı
*Güm etmək* – İtirmək
*Gümrah* – Yolunu azmış
*Güvah* – Şahid
*Güzidə* – Seçilmiş

**Ğ**

*Ğəbğəb* – Buxaq
*Ğəni* – Varlı, zəngin
*Ğərib* – Yaxın

**H**

*Hadi* – Düz yolla aparan
*Haziq* – Bilici, təcrübəli
*Həbib* – Dost, sevgili
*Həcci-əkbər* – Böyük həcc
*Həcər* – Daş
*Həqbin* – Həqiqət görən
*Həmul* – Kəcavə
*Hərgiz* – Hələ
*Həsud* – Həsəd edən
*Həzaran* – Yüzlərlə
*Hidayət* – Doğru yolda rəhbərlik
*Hirman* – Qadağan, rədd cavabı
*Hübbülvətən* – Vətən sevgisi
*Hüdhüd* – Şanapipik

**X**

*Xab* – Yuxu
*Xak* – Torpaq
*Xar* – Tikan
*Xasir* – Uduzan, zərər çəkən
*Xatəm* – Möhür, möhürlü üzük; Son
*Xeyrül-bəşər* – Ən yaxşı insane (Məhəmməd peyğəmbər)
*Xəmr* – Şərab
*Xər* – Uzunqulaq
*Xirqə* – Zahidlərin geydiyi qaba paltar
*Xoşnud* – Razı, şən
*Xub* – Yaxşı
*Xun* – Qan
*Xurşid* – Günəş
*Xücəstə* – Yetkin, ağıllı
*Xüld* – Əbədiyyət, ölməzlik
*Xüsran* – Ziyan, ölüm

**İ**

*İxlas* – Səmimilik
*İxtitam* – Tamamlanma, yekun
*İllət* – Səbəb, xəstəlik
*İmruz* – Bu gün
*İrişmək* – Çatmaq
*İstifham* – Sual, xahiş
*İstiva* – Ekvator xətti
*İşbah* – Oxşarlar
*İştiyaq* – Həvəs

*İttisal* – Birləşmə, qovuşma

**K**

*Kah* – Saman
*Kar* – İş
*Kəbənək* – Yapıncı
*Kəlamüllah* – Allah sözü
*Kəlb* – İt
*Kəm* – Az
*Kəndu* – Özü
*Kənz* – Xəzinə
*Kəzzab* – Yalançı
*Kibr* – Lovğalıq, təkəbbür
*Kibriya* – Böyüklük, əzəmət
*Kilab* – İtlər
*Kilk* – Qələm
*Kisvət* – Paltar
*Kişvər* – Ölkə
*Kövkəb* – Ulduz
*Kuh* – Dağ
*Kuşiş* – Səy, çalışmaq
*Külah* – Papaq
*Künfəkan* – Kainat
*Künyə* – Ləqəb
*Küstaq* – Sırtıq, cəsarətli

**Q**

*Qaim* – Möhkəm
*Qanğ*ı – Hansı
*Qasi*r – Sayğısız, zəif
*Qate*' – Qəti, mübahisəedilməz
*Qeyd* – Məhdudiyyət, maneə
*Qəh*r – Qəzəb
*Qəllaş* – Fırıldaqçı
*Qəmər* – Ay
*Qəncərü* – Necə
*Qət' etmək* – Kəsmək
*Qəza* – Yemək
*Qissə* – Hekayət, nağıl
*Qiyas* – Müqayisə, bənzərlik
*Qiyməti-ərzan* – Baha qiymət
*Qo* – Qoy
*Qövl* – Qohum
*Qubar* – Toz
*Qutlu* – Xoşbəxt
*Qürs* – Disk, dairə

**L**

*La* – Yox
*Lacərəm* – Istər-istəməz; Əlbəttə;Buna görə
*Laf* – Cəfəngiyyat
*Laməka*n – Məkansız
*Laşə* – Leş
*Laübali* – Qayğısız
*Layəmut* – Ölməz
*Layəzal* – Ölməz, əbədi
*Leyl* – Gecə
*Ləb* – Dodaq
*Ləbən* – Süd
*Ləhvü lə'b* – Pozğunluq
*Ləmyəzəl* – Əbədi, ölməz
*Ləşkər* – Qoşun
*Lisan* – Dil
*Lö'löi-şəhvar* – Şaha layiq inci

**M**

*Ma* – Su
*Mahi* – Balıq
*Manəndi-cəllad* – Cəllad kimi
*Ma*r – İlan
*Mazi* – Keçmiş
*Meyfüruş* – Meysatan
*Məani* – Mə'nalar
*Məbdə*' – Başlanğıc
*Məcruh* – Yaralı
*Məgəs* – Milçək; Arı
*Məhcub* – Utancaq, təvazökar
*Məhcur* – Ayrılmış, tərk edilmiş
*Məxmur* – Sərxoş, xumar
*Məxzən* – Xəzinələr
*Məkkarə* – Məkrli qadın
*Məqdur* – Qüvvəçatan, qaçılmaz
*Məqhur* – Qəhr edilmiş
*Məlamə*t – Danlaq
*Məlik* – Padşah
*Məmat* – Ölüm
*Mə'mur* – Düzəldilmiş, təmir edilmiş
*Mən' etmək* – Çəkindirmək
*Mərdüm* – Xalq
*Mərəz* – Xəstəlik
*Mərg* – Ölüm
*Mərkəb* – Minik heyvanı
*Məsrur* – Şad
*Məstur* – Gizli
*Mətlə'* – Günəşin doğduğu yer; Başlanğıc
*Mə'v*a – Məskən, sığınacaq
*Midad* – Qələm
*Miftah* – Açar
*Mir* – Ağa
*Mir'at* – Güzgü
*Misbah* – Çıraq, şamdan
*Miyan* – Orta, ara
*Möhtəmil* – Ehtimal edilən
*Möhtəsib* – Möhtəsib (şəriət işlərinə baxan məmur)
*Mövc* – Dalğa
*Mu* – Saç, tük
*Munis* – Yaxın dost
*Murçə* – Qarışqa
*Mübəssir* – Uzaqgörən
*Müctəme* – Birləşmiş
*Müdbər* – Bədbəxt, uğursuz
*Müəlla* – Yüksək, uca
*Müəlləq* – Asılmış
*Müfərrih* – Şənləndirən
*Müğləq* – Aydın olmayan
*Müxalif* – Düşmən
*Müxtərə* – Yaradılmış, ixtira edilmiş
*Müin* – Köməkçi
*Müqəyyəd* – Bağlanmış, qayğıkeş
*Müqim* – Sakin
*Mülazimət* – Qulluq
*Müləvvəs* – Ləkələnmiş; murdarlanmış
*Münadi* – Carçı
*Münafiq* – Yaltaq, qeyri-səmimi; Nifaq salan
*Münəvvər* – Nurlu
*Münəzzəh* – Günahsız, təmiz
*Münfəil* – Pərt olmuş, utanmış
*Münkir* – Inkar edən

*Münzəl* – Nazil olmuş, göndərilmiş
*Mürdə* – Ölü
*Mürğ* – Quş
*Mürsəl* – Peyğəmbər
*Mürşid* – Ruhani rəhbər
*Müsəxxə*r – Fateh
*Müsəlləm* – Mübahisəedilməz
*Müsəvvər* – Təsvir edilmiş
*Müshəf* – Kitab
*Müstədam* – Uzun, əbədi
*Müstəğn*i – Varlı, zəngin
*Müstəhlik* – Ödənilmiş; Məhv edilmiş
*Müstəqbəl* – Gələcək
*Müşrik* – Bütpərəst
*Müştaq* – Həvəskar
*Mütabiət* – Tabelik
*Mütəhhir* – Təmizləyən
*Müttəle*’ – Xəbərdar
*Müzəyyən* – Bəzənmiş

**N**

*Nabaliğ* – Yarımçıq, yetkinliyə çatmamış
*Naci* – Qurtulmuş
*Naqisüqul* – Kəmağıl
*Nam* – Ad
*Nan* – Çörək
*Nar* – Od
*Naseh* – Nəsihət verən
*Naşüküftə* – Açılmamış
*Navək* – Ox ucu
*Netəkim* – Necə ki
*Nəbat* – Bitki
*Nəfxə* – Nəfəs, meh
*Nəfsi-şum* – Uğursuz nəfs
*Nə’im* – Xoşbəxt həyat
*Nəməd* – Keçə
*Nəmək* – Duz
*Nəng* – Həya
*Nəsnə* – Bir şey
*Nigah* – Baxış
*Niku* – Yaxşı
*Nim* – Yarı
*Nisf* – Yarı
*Niş* – Neştər (arıda)
*Nişat* – Şadlıq
*Niyzə* – Nə üçün
*Nur* – İşıq
*Nüktə* – İncə söz, fikir.

**Ö**

*Övraq* – Vərəqlər

**P**

*Payan* – Son
*Payəndə* – Möhkəm, daimi
*Peyğam* – Məktub
*Peykər* – Gözəl; Bədən; Ulduz
*Pənbə* – Pambıq
*Pənd* – Nəsihət
*Pərçəm* – Bayraq
*Pərhiz etmək* – Çəkinmək
*Pərtöv* – İşıq, parıltı
*Pərva* – Qorxu
*Pəşminə* – Yundan toxunmuş

*Püxtə* – Bişmiş
*Pürbəla* – Bəlalı
*Pürxab* – Yuxulu
*Pürtab* – Qıvrım
*Püşt* – Arxa

**R**

*Raz* – Sirr
*Rəhiq* – Təmiz şərab
*Rəhnüma* – Yolgöstərən
*Rənc* – Əziyyət
*Rəzzaq* – Ruzi verən (Allah)
*Rind* – Qayğısız, şən həyat sürən adam
R*iştə* – Ip, sap
*Rizvan* – Cənnət
*Rövşən* – Işıqlı
*Rövzə* – Bağ
*Ru, ruy* – Üz
*Ruhulqüdüs* – Müqəddəs ruh, Cəbrayıl
*Ruz* – Gün
*Rüx* – Üz
*Rümman* – Nar
*Rümuz* – Rəmzlər

**S**

*Sağər* – Badə
*Salik* – Düz yolla gedən
*Sani* – İkinci
*Sayə* – Kölgə
*Sayru* – Xəstə
*Sevda* – 1. Öd, 2. Məhəbbət
*Seyd* – Ov
*Səbah* – Bulud
*Səbur* – Səbirli
S*əbükbar* – Yükü yüngül
*Səddəqna* – Sidq etdik; Inandıq
*Səhl* – Çətin
*Səxi* – Səxavətli
*Səid* – Xoşbəxt
*Səidəxtər* – Xoş taleli
*Səqim* – Xəstə, gücsüz
*Səqqa* – Sudaşıyan
*Səlasil* – Zəncirlər
*Səlat* – Birləşmə, əlaqə; Dua
*Səlib* – Xaç
*Səm'* – Qulaq
*Səmək* – Balıq
*Səng* – Daş
*Sər* – Baş
*Sərab* – Ilğım
*Sərgəştə* – Avara, başıpozuq
*Sərir* – Taxt, yataq
*Sərnigun* – Çevrilmiş, başıaşağı
*Sərzəniş* – Danlaq
*Səyyiat* – Günahlar
*Sib* – Alma
*Sibat* – Ordu
*Sidrə* – Lotos
*Sim* – Gümüş
*Sinək* – Milçək
*Sitarə* – Ulduz
*Sivü dü* – Otuz iki
S*iyam* – Orucluq
*Sövqənd* – And
*Sud* – Fayda

*Suf* – Yun, qaba yun parça
*Sunmaq* – Təqdim etmək
*Süfl* – Aşağı, bünövrə
*Sürəyya* – Ulduz bürcləri
*Sürx* – Qırmızı

**Ş**

*Şahid* – Gözəl, sevimli
*Şayəd* – Bəlkə, yəqin
*Şəb* – Gecə
*Şəcər* – Ağac
*Şəhd* – Bal
*Şəhnə* – Darğa
*Şəqi* – Bədbəxt
*Şəqq etmək* – Şaqqalamaq, bölmək
*Şəmim* – Xoş ətirli
*Şəmmə* – Bir az, nəsə
*Şəmsüzzüha* – Səhər günəşi; parlaq günəş
Ş*əmşir* – Qılınc
*Şərabi-nab* – Saf şərab
*Şərməndə* – Utanmış
*Şəst* – Altmış
*Şə'şəə* – Parıltı, əzəmət
*Şətrən*c – Şahmat
*Şikəstədil* – Ürəyi sınıq
*Şir* – 1. Süd, 2. Şir
*Şirk* – Çoxallahlılıq
*Şitab etmək* – Tələsmək
*Şol* – O
*Şuridə* – Qarma-qarışıq, həyəcanlı
*Şümar* – Say

**T**

*Tabəndə* – Parıldayan
*Tabiş* – Parıltı, istilik
*Taət* – Din və dünya qaydalarına itaət etmə
*Tamat* – Boş sözlər, cəfəngiyyat
*Tanıq* – Şahid
*Tarik* – Qaranlıq
*Teyb* – Xoş ətirli
*Teyy* – Ərzində
*Təbdil etmək* – Dəyişmək
*Təcəll*i – Əzəmətli zühur etmə
*Təfəhhüs* – Soruşma, axtarma
*Təfərrüc* – Əyləncə
*Təhsin* – Yaxşılaşdırma, bəyənmə
*Təhtüs-səra* – O dünya, yer altı
*Təqrir* – Təsdiq etmək
*Tən* – Bədən
*Tənab* – Kəndir
*Tərəb* – Şadlıq
*Təriq* – Yol
*Təsərrüf* – Sərf etmə, dəyişdirmə
*Təşbih* – Bənzətmə
*Təvaf* – Kəbənin başına dolanmaq
*Təvil* – Uzun
*Təzvir* – Hiylə
*Tib* – Bax: Teyb
*Tiğ* – Qılınc
*Tilkə* – Bu, budur
*Timar* – Əlac
*Tir* – Ox
*Tö'mə* – Yemək

*Tövhid* – Birlik
*Tövq* – Halqa, boyunbağı
*Türfə* – Yeni, əcaib şey
*Tüyur* – Quşlar

**U**

*Uçmaq* – Cənnət
*Ufa* – Kiçik
*Uluğ* – Böyük

**Ü**

*Üftadə* – Yıxılmış, düşmüş
*Üqba* – O dünya
*Ümm-ül-kitab* – Kitabın anası (Quran); Quranın fatihə surəsi
*Ümmühat* – Analar
*Üşşaq* – Aşiqlər

**V**

*Vəbal* – Çətinlik
*Vərd* – Qızılgül
*Vərtə* – Təhlükə

**Y**

*Yarın* – Səhər
*Yey* – Yaxşı
*Yədi-beyza* – Ağ əl
*Yəğma* – Qarət
*Yəzdan* – Allah
*Yövmül-hesab* – Hesab günü, qiyamət günü

**Z**

*Zağ* – Qarğa
*Zəban* – Dil
*Zəhi* – Afərin
*Zəxm* – Yara
*Zəmir* – Ürək, can
*Zənbur* – Arı
*Zər* – Qızıl
*Zərd* – Sarı
*Zərq* – Hiylə, yaltaqlıq
*Zərraq* – Yaltaq, riyakar
*Ziba* – Gözəl
*Zikr* – Xatırlama, söyləmə
*Zində* – Diri
*Zişt* – Çirkin
*Ziya* – Parıltı
*Zöhd* – Asketizm
*Zübdə* – Qaymaq, cövhər
*Zünnar* – müsəlman dövlətlərində yaşayan xristianların bağladığı qurşaq

## MÜNDƏRİCAT

### İCTİMAİ-FƏLSƏFİ ŞEİRLƏR

## MÜSTƏZADLAR



## ƏLİFLAM VƏ TƏRS ƏLİFBA

## TƏRCİBƏNDLƏR



## MƏSNƏVİLƏR



## MÜLƏMMƏ



## TUYUĞLAR



## ƏLAVƏLƏR

Buraxılışa məsul: *Əziz Güləliyev*

Texniki redaktor: *Rövşən Ağayev*

Tərtibatçı-rəssam: *Nərgiz Əliyeva*

Kompyuter səhifələyicisi: *Ələkbər Kərimov*

Korrektorlar: *Elmira Teymurova*
*Pərinaz Səmədova*

Yığılmağa verilmişdir 22.07.2004. Çapa imzalanmışdır 26.11.2004.
Formatı 60x90 $^{1}/_{16.}$ Fiziki çap vərəqi 23,5. Ofset çap üsulu.
Tirajı 25000. Sifariş 187.
Kitab “Şərq-Qərb” mətbəəsində çap olunmuşdur.
Bakı, Aşıq Ələsgər küç., 17.